# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2017**
**№ 1 (677)**
*(yanvar-fevral)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**



*Redaksiyanın ünvanı:*
*Az1065, Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236*

*Telefon/Faks*
*(012) 538-82-65*
*(012) 538-82-67*





*Rekvizitlər:*
*Kapital Bankın Gənclik Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**BU NÖMRƏDƏ**

Nizami Cəfərov
**Azərbaycanşünaslığın predmeti**
5
Azərbaycançılıq ideyası

***Pedaqogika, psixologiya***

Müseyib İlyasov
**Müəllimin pedaqoji peşə mədəniyyəti**
8
Müəllimin peşə mədəniyyətini şərtləndirən xüsusiyyətlər

Əziz Məmmədov,
Fuad Məmmədov
**Fiziki idrakda formallaşdırma və onun idraki funksiyaları**
15
Biliyin riyaziləşdirilməsinin və formallaşdırılmasının məntiqi çalarları

Əjdər Ağayev
**Fantaziya yaradıcı təxəyyülü inkişaf etdirir**
22
Şagirdlərin yaradıcı təxəyyülünün inkişafında mütaliənin rolu (Z.Xəlilin əsərləri nümunəsində)

Talıb Mahmudov
**Qabiliyyətin əsas komponentləri və tədris prosesində onların inkişaf etdirilməsi**
27
Tədris prosesində şagirdlərin qabiliyyətlərinin inkişaf etdirilməsinin əsas prinsipləri

***Məktəb və təhsil tariximiz***

Alxan Bayramoğlu
**Maarifçilikdən başlanmış ömür yolu**
32
M.Hadinin həyat yolu

İsgəndər Orucəliyev
**Hüseyn Cavidin pedaqoji görüşləri**
39
XX əsrin əvvəllərində məktəb və təhsilin inkişafı, müəllim kadrlarının hazırlanması məsələləri

Əli Adıgözəlov,
Şəlalə Adıgözəlova
**Qərbi Azərbaycanın milli məktəb tarixindən**
45
Qərbi Azərbaycanda məktəblərin yaradılması və inkişafı

Elnarə Məmmədova
**"Azərbaycan məktəbi" jurnalının ilk nömrəsi**
49
"Azərbaycan məktəbi"nin birinci nömrəsinin təsviri və təhlili

***Arxivimizdən***

Əli Vəliyev
**Təvazökar müəllim**
55
Görkəmli alim M.Axundov haqqında

***Nitq mədəniyyəti***

Vaqif Qurbanov
**Natiqlik haqqında fraqmental düşüncələrimiz**
56
Nitq mədəniyyəti ümumxalq mədəniyyətinin tərkib hissəsi kimi

***Elm və maarif xadimlərimiz***

Fərrux Rüstəmov
**70 il pedaqoji elmin keşiyində**
61
Azərbaycanda pedaqoji elmin inkişafında pedaqoq-alimin xidmətlərindən bəhs olunur

Vaqif Şadlinski
**Fədakar alim, peşəkar pedaqoq**
69
Görkəmli elm xadimi, AMEA-nın müxbir üzvü Aqil Əliyevin elmi-pedaqoji fəaliyyətindən danışılır

***Fənlərin tədrisi***

Şəkər Abdullayeva
**Keyfiyyətli təhsil ölkənin dinamik inkişafını təmin edən əsas göstəricilərdən biridir**
73
Ümumtəhsil məktəblərində təlimin keyfiyyətinin yüksəlməsinə təsir edən amillər

Nəsrəddin Musayev
**Dərsin səmərəliliyinin artırılması üsulları**
**78**
Müasir təlim metodlarının düzgün və məqsədyönlü tətbiqi imkanları

Pəri Paşayeva
**Yeni təlim metodlarından istifadə zamanı müəllimin fəaliyyəti**
**82**
Təlim üsullarının seçilməsi meyarları, şagird şəxsiyyətinin inkişafına təsir edən amillər

Fəridə Hüseynova
**Tədrisdə kommunikativ bacarıqların formalaşmasına dair**
**85**
Dərsdə kommunikativ yanaşma metodunun tətbiqi və təşkili yolları

Arzu Baxşəliyeva
**Summativ qiymətləndirmənin mahiyyəti və məzmunu**
**90**
Summativ qiymətləndirmənin mahiyyəti və məzmunu

***Səhiyyə maarifimiz***

Hidayət İsayev,
Aybəniz Cəfərova
**İzafi bədən kütləsi və onun müayinəsi**
**94**
Şagirdlərin sağlamlığında rol oynayan əsas amillər

***Tərbiyə məsələləri***

İntiqam Cəbrayılov
**Müasir ali təhsil və tələbə şəxsiyyətinin formalaşdırılmasının bəzi məsələləri**
**99**
Tələbə şəxsiyyətinin formalaşdırılmasının elmi-nəzəri, praktiki əhəmiyyəti və bu sahədə beynəlxalq təcrübənin öyrənilməsi

***Xaricdə təhsil***

Рева Татьяна Дмитриевна
**Компетентностный подход в обучении предметным дисциплинам будущих специалистов**
**105**
Bakalavr pilləsindən sonrakı illərdə kadr hazırlığı

Шамшия Курпебаева
**Творческий конкурс “Добропримечательности Алматы”**
**112**
Bir tədbir haqqında məlumat



**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş:**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**

**Н.Джафаров**
**Предмет Азербайджановедения.......................р.5**

**М.Ильясов**
**Профессионально педагогической култура педагога.................................................................с.8**

**А.Мамедов,**
**Ф.Мамедов**
**Формализация в физическом познании и её когнитивные функции...................................р.15**

**А.Агаев**
**Фантазия развивает творческое воображение.......................................................................р.22**

**А.Байрамоглы**
**Жизненный путь, начинающийся с просвещенства..........................................................р.32**

**И.Оруджалиев**
**Педагогические мировоззрения Гусейна Джавида.........................................................р.39**

**В.Курбанов**
**Фрагментарные мысли о риторике.............р.56**

**Ф.Рустамов**
**70 лет на стороже науки.................................р.61**

**В.Шадлински**
**Самоотверженный ученый, профессиональный педагог.......................................................р.69**

**Ш.Абдуллаева**
**Качественное образование является одним из основных показателей, динамического роста страны..............................................................р.73**

**In this number**

**N.Jafarov**
**The Subject of Azerbaijan Study.........................c.5**

**M.Ilyasov**
**Teacher's pedagogical profession culture...........c.8**

**A.Mammadov,**
**F.Mammadov**
**Formalization in physical cognition and her cognition functions.....................................................c.15**

**A.Agayev**
**Fantasy develops creative imagination.........................................................................c.22**

**A.Bayramoglu**
**A lifetime dedicated to enlightenment..............c.32**

**I.Orujaliyev**
**Hussein Javid's pedagogical thoughts...............c.39**

**V.Qurbanov**
**Fragmented thoughts about rhetoric................c.56**

**F.Rustamov**
**70 Years in pedagogical science..........................c.61**

**V.Shadlinsky**
**Dedicated scientist, professional Educator..............................................................c.69**

**Sh.Abdullayeva**
**Education of high guality is one of the main sign of dynamic development of the country................................................................c.73**



# AZƏRBAYCANŞÜNASLIĞIN PREDMETİ

**Nizami Cəfərov,**
***AMEA-nın müxbir üzvü, professor,***
***millət vəkili***

Ümummilli liderin məşhur “Mən fəxr edirəm ki, Mən azərbaycanlıyam” sözlərinin mahiyyətini dərindən dərk etmək üçün hər bir azərbaycanlı, dünyanın harasında yaşamasından asılı olmayaraq, azərbaycanşünaslığın elmi əsaslarını bilməlidir. İlk növbədə ona görə ki, bu, milli şüur, milli intellekt və milli mənlik deməkdir…

Azərbaycan xalqının öz milli müstəqilliyini inamla qoruyub möhkəmləndirdiyi müasir dövrdə Azərbaycana (və azərbaycanşünaslığa) maraq həm ölkə daxilində, həm də beynəlxalq aləmdə dönmədən artmaqdadır. Və bu, tamamilə təbiidir…

Azərbaycanşünaslıq – dünyanın müxtəlif xalqlarını həm ümumi, həm də xüsusi (hər birini ayrılıqda) olaraq öyrənən etnosşünaslığın üzvi tərkib hissəsidir. Xüsusi etnosşünaslıq bu və ya digər etnosun (xalqın) bir sosial orqanizm və ya kompleks kimi tədqiqi ilə məşğul olduğu halda, ümumi etnosşünaslığın vəzifəsi həmin tədqiqatlardan alınan nəticələri ümumiləşdirmək, bütövlükdə etnos (xalq) anlayışı, onun kifayət qədər mürəkkəb təbiəti barədə elmi təsəvvür yaratmaq, ümumi qanunauyğunluqlar müəyyənləşdirməkdir. Və həmin ümumi qanunauyğunluqlar ayrıca bir etnosu (xalqı) öyrənərkən, öz növbəsində, mühüm metodoloji əhəmiyyət kəsb edir.

Müasir dünyada mövcud olan xalqlar tarixi diferensiasiyanın (bölünmənin) məhsulu olub, ortaq əcdadlardan törəmişlər. Hətta bütün xalqların bir etnik mənbədən yarandığını güman etməyə əsas verən nəzəriyyələr də az deyil. Ona görə də xüsusi etnosşünaslıqla ümumi etnosşünaslıq arasında ən müxtəlif baxımlardan sıx faktik, eləcə də nəzəri əlaqələr vardır. Belə ki, məsələn, ingilis və ya rus xalqını öyrənən mütəxəssis, müvafiq olaraq, qədim german və slavyan etnoslarını da araşdırmalı, nəticə etibarilə, hind - Avropa etnik birliyinə gedib çıxmalıdır. Bu isə o deməkdir ki, etnosşünaslıqda mükəmməl bir iyerarxiya vardır: ingilisşünaslıq germanistika, rusşünaslıq isə slavistika ilə birbaşa əlaqədardır, hər ikisi isə, prinsip etibarilə, hindavropaşünaslığa daxildir.

Azərbaycan xalqı qədim türk etnosunun diferensiasiyası nəticəsində yarandığına görə, azərbaycanşünaslıq türkologiyanın tərkib hissəsidir. Türkologiya isə altayşünaslığın sahələrindən biridir.

Lakin nəzərə almaq lazımdır ki, burada söhbət ümumi prinsipdən gedir. Və elə amillər də vardır ki, ümumi prinsipi şübhə altına almadan xalqların “tərcümeyi-hal”ına bu və ya digər dərəcədə əhəmiyyətli

təsir göstərir. Bunlardan ən mühümü etnik kontaktlar, yaxud xalqlar arasında onların bütün tarixi boyu mövcud olmuş əlaqələridir.

Qafqaz və İran mənşəli xalqlarla qədim dövrlərdən başlayan iqtisadi, siyasi və mədəni əlaqələr, eləcə də ərəblərlə çoxspektrli (xüsusilə İslam dininin qəbulu ilə bağlı) münasibətlər türk mənşəli Azərbaycan xalqının taleyində müəyyən rol oynamışdır. Və bu təsirlər, təbii ki, birtərəfli deyil, qarşılıqlı olmuşdur. Ona görə də azərbaycanşünaslıq elmi qafqazşünaslıq, iranşünaslıq və ərəbşünaslıqla daimi (və səmərəli) dialoqdan imtina edə bilməz.

Azərbaycan xalqının adı ("azərbaycanlı" etnonimi), məlum olduğu kimi, tarixi e.ə. IV əsrə gedib çıxan yer adından ("Azərbaycan" toponimindən) alınmışdır. Və bu toponimin eyni zamanda etnonim kimi formalaşması isə çox-çox sonralara – XX əsrin əvvəllərinə aiddir. Həmin dövrə qədər xalq müxtəlif adlar daşımışdır ki, onlardan ən ümumisi (və məntiqlisi) "Azərbaycan türkləri" olmuşdur. "Azərbaycan xalqı" anlayışının əsasında da həmin ümumiləşmə (və məntiq) dayanmışdır. Belə ki, Azərbaycan ərazisində məskunlaşmış aparıcı etnos – türklər digər türklərdən fərqləndikcə (diferensiasiya olunduqca) əvvəl "Azərbaycan türkləri", sonra isə "Azərbaycan xalqı" kimi tanınmışlar. Lakin "türklər"→ "Azərbaycan türkləri" → "Azərbaycan xalqı" istiqamətində gedən adlanma prosesi tamamilə qanunauyğun olsa da, həmin proses uzun bir dövrdə regionun müxtəlif mənşəli etnoslarını süni olaraq birləşdirən "müsəlman" adı ilə ləngidilmişdir ki, dini təfəkkürün (və şüurun) etnik (nəticə etibarilə, milli!) təfəkkürü (və şüuru) öz əsarəti altında saxladığı zamanlar üçün bu, tamamilə səciyyəvidir.

Lakin Azərbaycan xalqı İslam dininin mənəvi dəyərlərini inkar etməməklə ümumi "müsəlman etnosu" çərçivələrindən kənara çıxaraq öz etnik mənşəyi (türklüyü) üzərində yüksəlməyi bacardı ki, bu da onun bir millət olaraq tarix səhnəsinə çıxmasını təmin etdi. Eyni zamanda Azərbaycan ərazisində çox qədim dövrlərdən məskunlaşmış Qafqaz, eləcə də İran mənşəli etnoslar özlərini azərbaycanlı saymaqdan, Azərbaycan Respublikasının vətəndaşı olmaqdan fəxr duydular.

Azərbaycanşünaslığın bir elm olaraq təşəkkülü XIX əsrin sonu, XX əsrin əvvəllərinə təsadüf etsə də, Azərbaycan haqqındakı təsəvvürlərin qədim tarixi olduğu heç bir şübhə doğurmur. Və istər qədim dövrlərdən başlayan təsəvvürlərin, istərsə də azərbaycanşünaslıq elminin tarixinin öyrənilməsi bugünkü müvafiq mülahizələrin hansı ənənəyə və ya metodoloji əsaslara dayandığını, eləcə də mövcud ideya perspektivlərini müəyyənləşdirmək baxımından əhəmiyyətlidir.

Və məlumdur ki, azərbaycanşünaslığın ən mühüm problemlərindən biri Azərbaycan xalqının etnogenezi və ya təşəkkülü məsələsidir ki, bu məsələ ən azı aşağıdakı suallara aydınlıq gətirməyi tələb edir: a) qədim dövrlərdən Azərbaycanın etnik mənzərəsi necə olmuşdur? b) türk mənşəli Azərbaycan xalqı nə zaman (və hansı şəraitdə) formalaşmışdır? c) xalqın siyasi özünütəsdiq prosesi necə getmişdir?

Başqa bir mühüm problem Azərbaycanda milli şüurun etnik əsaslarını təşəkkül (və təkamül) tarixini, azərbaycan-

çılıq ideologiyasını yaradan səbəbləri araşdırmaqdan ibarətdir. Və təbii, azərbaycançılıq ideologiyasının formalaşması xalqın milli şüurunun bütün gücü ilə təzahürünə, özünüdərk (və özünütəsdiq) enerjisinin ümummilli miqyas almasına gətirib çıxarır.

Azərbaycanşünaslığın ən mühüm problemi isə Azərbaycan xalqının milli (və dövlət) müstəqilliyinin əsaslarının öyrənilməsidir ki, buraya a) müstəqilliyin potensialının araşdırılması, b) ümummilli lider Heydər Əliyevin dövlət (və millət) quruculuğundakı tarixi xidmətlərinin miqyasının müəyyənləşdirilməsi və c) milli inkişafın perspektivlərinin aydın təsəvvür olunması daxildir.

Azərbaycanşünaslıq artıq neçə illərdir ki, ölkəmizin ali təhsil müəssisələrində müxtəlif proqramlarla tədris olunsa da, həmin proqramların mükəmməlliyi, eləcə də tədrisin səviyyəsi barədə danışmaq hələ tezdir. Hər şeydən əvvəl ona görə ki, a) xalqımızın “tərcümeyi-hal”ı haqqında az qala hər gün yeni faktlar, materiallar və elmi-nəzəri ümumiləşdirmələr meydana çıxır; b) Azərbaycan ən müxtəlif istiqamətlərdə böyük uğurlara imza atmaqla azərbaycanşünaslığın predmetini sürətlə zənginləşdirir, elmin (və fənnin) maraq dairəsinə yeni mövzular gəlir; c) azərbaycanşünaslıq sahəsində çalışan mütəxəssislər kifayət qədər (və lazımi səviyyədə hazırlıqlı) deyil.

Nəticə etibarilə deyə bilərik ki, azərbaycanşünaslığın predmetinə aşağıdakı məsələlər daxildir:

1) Azərbaycanşünaslığın tarixi;

2) Azərbaycan xalqının etnogenezi;

3) Azərbaycanda milli şüurun formalaşması və azərbaycançılıq ideologiyasının təşəkkülü;

4) Azərbaycan xalqının milli (və dövlət) müstəqilliyinin fəlsəfəsi.

Azərbaycanın dövlət müstəqilliyi qazandığı, müasir dünya ilə əlaqələrinin yaranıb inkişaf etdiyi müasir dövrdə azərbaycanşünaslığın iqtisadi, sosioloji və politoloji aspektlərinin diqqəti daha çox cəlb etməsi ənənəvi problemlərin unudulması hesabına deyil. Azərbaycanşünaslığın bir elm kimi tədqiqat hüdudları genişlənir, problemləri daha çox sosial praktikanın tələblərinə uyğunlaşır, təhlil metodları inkişaf edib zənginləşir. Və nəticə etibarilə, ənənəvi problemlərə baxışın texnologiyası da təkmilləşir.

Azərbaycanda milli dövlət quruculuğu prosesi sürətləndikcə azərbaycanşünaslığın problemləri daha bütöv, kompleks halında, biri digəri ilə qarşılıqlı əlaqədə qoyulur ki, bu, həmin problemlərin əsaslı şəkildə həlli üçün geniş ideoloji imkanlar açır...

Azərbaycanşünaslıq yalnız elmi-nəzəri, yaxud akademik bir sistem deyil, həm də get-gedə daha geniş yayılmaqda olan və Azərbaycan Respublikasının dövlət siyasətinə, dünyanın müxtəlif ölkələrində, təxminən 500 min kv.km-lik ərazisi olan tarixi Azərbaycanda məskunlaşmış azərbaycanlıların dünyagörüşünə çevrilməkdə olan azərbaycançılıq ideologiyasının elmi-metodoloji əsasıdır.



# MÜƏLLİMİN PEDAQOJİ PEŞƏ MƏDƏNİYYƏTİ

**Müseyib İlyasov,**
***ADPU-nun kafedra müdiri,***
***pedaqogika üzrə elmlər doktoru***

***Açar sözlər:*** *müəllim, səriştəlilik, peşə, mədəniyyət, humanizm.*
***Ключевые слова:*** *педагог, компетенция, профессия, культура, гуманизм.*
***Key words:*** *teacher, competence, profession, culture, humanism.*

Müəllimin ümumi mədəniyyətinin tərkib hissələrindən biri olan pedaqoji peşə mədəniyyəti onun peşəkarlığında və səriştəliliyində mühüm yer tutur. Ümumi mədəniyyət, kulturoloji səriştə, yaradıcı pedaqoji təfəkkür, yeni pedaqoji texnologiyalardan istifadə bacarıqları və s. kimi amillər vardır ki, müəllimin pedaqoji peşə mədəniyyəti bunlardan qaynaqlanır və bir sıra səmərəlilik göstəricilərində ifadə olunur. Müəllimin peşə səriştəliliyinə və peşəkarlığına malik olmasının əsas atributlarından biri onun peşə mədəniyyətinə yiyələnməsidir. Pedaqoji peşə mədəniyyəti müəllimin ümumi mədəniyyətinin tərkib hissəsi olub, onun şəxsi keyfiyyətlərini, nüfuzunu, peşəkarlığını, pedaqoji ustalığını və s. özündə birləşdirən keyfiyyətlərin məcmusundan ibarətdir. Ümumi mədəniyyət olmadan peşə mədəniyyəti mümkün olmadığı kimi, peşə mədəniyyətinin də olmaması ümumi mədəniyyətdə müəyyən boşluqların nəticəsi kimi meydana çıxır.

Hər bir peşənin daxil olduğu peşə qrupları, əmək obyekti və əmək predmeti, onların özünəməxsus spesifik xüsusiyyətləri olduğundan peşə mədəniyyəti bu peşələrin reallaşması şəraitində özünü göstərə bilir. Peşənin qarşısında duran vəzifələr həm də həmin peşənin mədəniyyətini özündə ehtiva etdirir. Başqa sözlə desək, peşə mədəniyyəti özünü müəyyən bir peşənin və ya peşə qrupunun qarşısında duran əsas vəzifələrin yüksək səviyyədə yerinə yetirilməsi kimi göstərir. Peşə sahibi, ixtisasçı öz üzərinə düşən peşə vəzifələrini peşəkarlıqla, ləyaqətlə və vicdanla yerinə yetirirsə, icra etdiyi işin məsuliyyətini və bu işdə həm də özünü təcəssüm etdirdiyini dərk edərək işinə yanaşırsa, bu, peşə mədəniyyətinin yüksək səviyyədə olduğunun göstəricisidir.

Müəllimin pedaqoji peşə mədəniyyəti onun peşəkar keyfiyyətləri sırasında mühüm yer tutur. Onun didaktik, təşkilatçılıq, kommunikativ, konstruktiv, perseptiv, suqqestiv, digər bacarıq və qabiliyyətləri kimi, pedaqoji peşə mədəniyyəti də peşəkarlıq, səriştəlilik və pedaqoji ustalıq sferasında xüsusi rola malikdir.

Müəllimin pedaqoji peşə mədəniyyəti humanizmə əsaslanan, humanist münasibətlərdən qaynaqlanan bir mədəniyyətdir. Müəllimin uşaqlara humanist münasibəti, onların gələcəyinə ümidlə baxması, gələcək cəmiyyətin məhz onların əli ilə qurulacağını dərindən dərk etməsi pedaqoji peşə mədəniyyətini istiqamətləndirən amillər kimi əhəmiyyətlidir, təsirlidir. Bu baxımdan müəllimin pedaqoji peşə mədəniyyəti həm də onun bir vətəndaş kimi Vətən, xalq, millət qarşısında öz borcunu və vəzifəsini ləyaqətlə yerinə yetirməli olduğuna inamlı olması və

onu yerinə yetirməsidir.

Müəllim peşəkarlığının əsas komponentlərindən biri kimi pedaqoji peşə mədəniyyəti müəllimin yeniliklərə can atması, onları öyrənməsi, öz işinə və fəaliyyətinə yaradıcılıqla yanaşması ilə sıx bağlı olan bir keyfiyyətdir. Bundan məhrum olan tərbiyəçi və müəllimin pedaqoji prosesdə uğur qazana bilməsi çətindir. Çünki son illər təhsilimizdə baş verən yeniliklər, sürətli inkişaf tendensiyaları, dünyanın qabaqcıl ölkələrinin yaxşı təcrübəsinin pedaqoji prosesə gətirilməsi müəllimin bu yeniliklərlə ayaqlaşa bilməsini sürətləndirir. Hazırda müəllimdən öz fənnini təkcə yaxşı bilib - öyrətmək deyil, həm də pedaqoji prosesə yaradıcılıqla yanaşmaq, novator olmaq, yeniliklərlə işləyə bilmək, təhsilalanların təfəkkürünü inkişaf etdirmək, onları bir şəxsiyyət kimi formalaşdıra bilmək və s. tələb olunur. Müəllim uşaqları təkcə biliklərlə silahlandırmalı deyil, həm də onları bacarıqlara yiyələndirməli və inkişaf etdirməlidir.

Kütləvi informasiya vasitələrinin sürətlə artması, sürətli informasiya texnologiyalarının həyat və məişətimizə geniş daxil olması, məktəblilərin maraq dairəsinin qlobal xarakter alması və s. məsələlər bu prosesə müəyyən müsbət çalarlar gətirsə də, onun şagirdlərin təlim marağının digər maraqlar hesabına zəifləməsinə də təsiri yox deyildir. Bu isə müəllimdən öz işinə daha səriştəli yanaşmaq, uşaqların artan tələbat və maraqlarına cavab verə biləcək səviyyədə peşəkar olmaq bacarığı və vərdişləri tələb edir. Müəllim pedaqoji peşəkarlığın texnoloji tərəflərinə yiyələnməklə, öz fəaliyyətinə yeniliklər gətirməklə, yeni pedaqoji texnologiyalardan istifadə etmək bacarığına malik olmaqla bu prosesdə müvəffəqiyyət qazana bilər. Bunlardan çıxış edərək müəllimin pedaqoji peşə mədəniyyətini şərtləndirən amillər sırasında aşağıdakıları xüsusi olaraq qeyd etmək olar:

1) ümumi mədəniyyətə, kulturoloji səriştəyə malik olmaq;
2) yaradıcı pedaqoji təfəkkürə yiyələnmək;
3) yeni pedaqoji texnologiyalara yiyələnmək və onlardan istifadə bacarıqlarına malik olmaq.

Müəllimin ümumi mədəniyyətə malik olması, yəni şəxsi mədəniyyəti pedaqoji prosesdə mühüm rol oynayır. N.Çernişevski yazırdı ki, tərbiyəçi tərbiyə etdiyi uşaqdan nə düzəltmək istəyirsə, özü də elə olmalıdır. Deməli, müəllim öz yetişdirmələrini savadlı, mədəni, yüksək mənəvi keyfiyyətlərə malik şəxslər kimi görmək istəyirsə, ilk növbədə özü bu keyfiyyətlərə malik olmalıdır.

Müəllimin şəxsi mədəniyyəti onun özünəməxsus keyfiyyət kimi nüfuzunu yüksəldir, onu hörmətli edir. Ümumi mədəniyyətin tərkib hissəsi olan şəxsi mədəniyyət bəzən cəmiyyətin müəyyənləşdirdiyi ümummədəni maraqlardan da yüksəyə qalxır və müəllimin nüfuzunu daha da artırır.

Müəllimin şəxsi mədəniyyətinin bir sıra komponentləri vardır. Bunların içərisində əxlaq mədəniyyəti və estetik mədəniyyəti xüsusi qeyd etmək olar.

Əxlaq mədəniyyəti müəllimin hərəkət və davranışının əxlaqi prinsip və normalara uyğun olması, əxlaqi keyfiyyətlərinin yerindən, zamanından asılı olmayaraq sabitliyi, ünsiyyət mədəniyyətinin olması, dinləməyi bacarmaq, çətin situasiyalarda özünü ələ ala bilmək, obyektivlik, şagird şəxsiyyətinə hörmətlə yanaşmaq, danışıq və davranışında müəyyən həddi gözləmək, tələb etdiklərinə özünün əməl etməsi və s.-dən ibarətdir.

Müəllimin bu keyfiyyətlərə malik olması əxlaqi sərvətlər, dəyərlər kimi onun nüfuzunu artırır. Bunlar həmçinin müəllimin mədəni dünyagörüşünü artırır. Onun xarak-

terinin formalaşmasına təsir göstərir.

Müəllimin estetik mədəniyyəti onun əxlaqi mədəniyyətindən heç də az rol oynamır. Onun estetik sərvətlərə – dəyərlərə yiyələnməsi ziyalılıq səviyyəsinin əsas göstəricilərindən birinə çevrilir. Müəllimin təbiətə və cəmiyyətə estetik münasibəti, bədii mədəniyyətə yiyələnməsi, xalq sənətinə, həmçinin dünya bədii sənətinə, incəsənətinə bələd olması, nəhayət, estetik zövqə, hissə və qabiliyyətə malik olması onun bir müəllim – ziyalı nüfuzunun yüksəlməsinə mühüm təsir göstərir. Mədəni xarici görünüş, təmiz, səliqəli, zövqlü geyim də bu prosesdə az əhəmiyyət kəsb etmir (3).

Pedaqoji peşə mədəniyyəti müəllimin pedaqoji bacarıqları ilə birbaşa bağlı, onunla əlaqəli bir mədəniyyətdir. Müəllimin müəyyən pedaqoji bacarıqlara malik olması, onun özünü reallaşdırması, pedaqoji özünütəsdiqi, həmçinin pedaqoji prosesdəki müvəffəqiyyəti üçün zəruri olduğu kimi, pedaqoji mədəniyyəti üçün də əhəmiyyətlidir.

Pedaqoji peşə mədəniyyəti mücərrəd bir məfhum deyildir. Bu, müəllimin pedaqoji fəaliyyəti zamanı üzə çıxan, görünən, əks olunan mədəniyyətidir. Bu mədəniyyət müəllimin davranışında, danışığında, uşaqlarla, onların valideynləri, həmkarları ilə ünsiyyətdə olduğu zaman özünü göstərən mədəniyyətdir. Müəllim onlarla necə rəftar edir, necə danışır, onlara necə müraciət edir və şagirdlərə tələbləri necə verir, məktəbdə və məktəbdən kənarda hərəkət və davranışı necədir və s. bütün bunlar onun pedaqoji peşə mədəniyyətinin konkret ifadəsi kimi özünü göstərir.

Beləliklə, müəllimin pedaqoji peşə mədəniyyətinin məzmununun konkret olaraq aşağıdakılardan ibarət olduğunu göstərmək olar:

1) müəllimin pedaqoji fəaliyyəti prosesində özünü göstərən mədəniyyəti;

2) şagirdlərlə, həmkarlarla və valideynlərlə olan pedaqoji ünsiyyət mədəniyyəti;

3) müəllimin şəxsi, özünəməxsus mədəniyyəti;

4) müəllimin dərsdənkənar vaxtlarda uşaqlara olan münasibəti;

5) müəllimin konkret milli və ümumbəşəri mədəniyyətə malik olması ilə səciyyələnən mədəniyyəti.

Bunlar vahid, bir məcrada birləşərək müəllimin ümumi peşə mədəniyyətini formalaşdırır ki, bunların da bir qisminin olmaması və ya zəif olması müəllimin peşəkar pedaqoji mədəniyyətində müəyyən çatışmazlıqlara gətirib çıxarır.

Müəllimin pedaqoji fəaliyyəti onun peşəkarlıq səviyyəsinin yüksəlməsində əsas baza rolunda çıxış edir. Pedaqoji fəaliyyət genişləndikcə və yeniliklərlə zənginləşdikcə peşəkarlıq üçün zəruri olan keyfiyyətlər də yaranır və getdikcə dolğunlaşır. Müəllimin fəaliyyət sferasının genişlənməsi yeni-yeni keyfiyyətlərin yaranmasına, dəyərlər iyerarxiyasının bir pillədən digərinə, daha yüksək pilləyə keçməsinə səbəb olur. Müəllim peşəkar pedaqoji fəaliyyət sistemində özünü daha yaxşı hiss etməklə yeni-yeni keyfiyyətlər əldə etməyə çalışır ki, bunlar da onun peşəkarlığının daha da dərinləşməsinə stimullar yaradır.

Müəllimin pedaqoji fəaliyyəti olduqca mürəkkəb texnoloji proseslərin həyata keçirilməsi ilə xarakterizə olunur. Bu proseslərin zənginliyi pedaqoji prosesin tamlığına və bütövlüyünə gətirib çıxarır ki, bu da ayrı - ayrı müəllimlərin peşəkarlığının fərdi və fərqli cəhətləri kimi özünü göstərir. Müəllimin pedaqoji peşə mədəniyyəti müəllimin yaradıcı fəaliyyəti ilə sıx surətdə əlaqədardır. Müəllim pedaqoji fəaliyyətə yaradıcılıqla yanaşdıqda, ona yaradıcı münasibət bəslədikdə bunlar həm onun peşə funksiyasının reallaşmasında, həm də müxtəlif texnoloji əməliyyatların yerinə

yetirilməsində yüksək nəticələrə səbəb olur, pedaqoji fəaliyyət dəyər səviyyəsinə yüksəlir. Yaradıcı axtarışların nəticəsi olan texnoloji yeniliklər pedaqoji fəaliyyəti daha da məzmunlu və məqsədyönlü edir.

Pedaqoji peşə mədəniyyətinin formalaşması bir sıra amillərlə səciyyələnir. Bunlar müəllimin ümumi mədəniyyətindən başlayaraq, onun bilik, bacarıq və vərdişlərini əhatə etməklə müəllim şəxsiyyətinin tamlığında özünü büruzə verir. Müəllim bir etalon şəxsiyyət kimi istər təlim-təhsil prosesində, istərsə də digər fəaliyyət zamanı öz hərəkət və davranışını, danışığını, ünsiyyət tərzini nizamlamağı bacarmalı, bu bacarıqların yüksək səviyyədə reallaşmasına nail olmalıdır.

Müəllim fəaliyyətinin nəticəsi – (o, istər yüksək, ali səviyyədə olsun, istərsə də aşağı) yetişdirdiyi, tərbiyə etdiyi şagirdlərin biliyində, bacarığında, vərdişlərində, davranışlarında və fəaliyyətlərində əks olunur. Buna görə də müəllim fəaliyyətinin nəticəsini qiymətləndirmək üçün ən yaxşı meyar şagirdlərin fəaliyyət göstəricisidir.

Müəllimin öz şagirdləri qarşısında fəaliyyətinə yaradıcı münasibət göstərməsi bir tərəfdən təlim nəticələrinə müsbət təsir göstərirsə, digər tərəfdən müəllimi şagirdlərin gözü qarşısında daha da böyüdür, hörmətli edir. Müəllimin belə işgüzar fəaliyyəti onun peşəkarlığını göstərməklə yanaşı, şagirdlərdə öyrənmə həvəsini daha da artırır, onları təlimə ruhlandırır.

Müəllimin pedaqoji bacarığı və qabiliyyəti, həmçinin ustalıq və peşəkarlığı onun məhz pedaqoji prosesdə iştirakı, şagirdlərlə bilavasitə qarşılıqlı təsiri prosesində meydana çıxır. Bu zaman onun peşə mədəniyyətinin səviyyəsi də aydın görünür. Müəllim uşaqlarla necə davranır, ünsiyyətin hansı tərzindən istifadə edir, zəif şagirdlərə münasibəti necədir, uşaqların inkişafını necə istiqamətləndirir, sinifdə işgüzar şərait, nikbin emosional fon yarada bilirmi, sinfin idarə olunmasında hansı səviyyələr özünü göstərir, gözlənilməz situasiyalarda necə hərəkət edir, hansı yaradıcı priyomlardan istifadə edə bilir və s.

Müəllimin pedaqoji peşə mədəniyyətinin əsas göstəricilərindən biri onun standart metod və vasitələrdən əlavə, yaradıcı priyomlardan, xüsusən ənənəvi metod və priyomlar səmərə vermədikdə qeyri-standart metodlardan nə dərəcədə, hansı səviyyədə istifadə edə bilməsidir. İnnovasiyalar, şəraiti düzgün qiymətləndirmə, çevik və yaradıcı pedaqoji təfəkkür, şagirdlərin psixoloji xüsusiyyətlərinə, hər bir yaş dövrünün xüsusiyyətlərinə, böhran hallara dərindən bələdlilik kimi məsələlər burada mühüm rol oynayır.

Pedaqoji peşə mədəniyyəti nə birdən-birə yaranır, nə də müəllimlik diplomu ilə birgə verilir. Burada inqilabla, yəni birdən - birə də nail olmaq mümkün deyildir. O, müəllimin pedaqoji fəaliyyəti ilə yanaşı gedərək, onun işgüzarlığı, pedaqoji peşəyə olan sevgisi, yaradıcı pedaqoji təfəkkürə malik olması ilə müşayiət olunur. Eyni zamanda, burada işgüzar mühitin yaradılması, yaradıcılıq üçün münbit şəraitin olması, kollektivdə müsbət psixoloji iqlimin olması, digər bir sıra obyektiv və subyektiv amillər də mühüm rol oynayır. Müəllimin pedaqoji yaradıcılığına stimul verən belə amillər həm də pedaqoji peşə mədəniyyəti ilə müşayiət olunduqda daha səmərəli nəti-cələrə səbəb olur. Bu baxımdan müəllimin pedaqoji peşə mədəniyyətinin formalaşmasının aşağıdakı bir sıra səmərəlilik göstə-ricilərini qeyd etmək olar:

1. Müəllimin pedaqoji peşə mədəniyyətinə dair nəzəri - metodoloji biliklərə malik olması və onun əsaslarına yiyələnməsi. Burada müəllimin etikanı, pedaqogikanı, psixologiyanı, pedaqoji psixologiyanı, psixopedaqogikanı, uşaqların yaş

xüsusiyyətlərini yaxşı bilməsi, pedaqoji prosesin qanunauyğunluqlarına, prinsiplərinə və metodlarına, həmçinin təhsilin kulturoloji əsaslarına dair biliklərə yiyələnməsi başlıca şərtlərdəndir.

2. Şagird şəxsiyyətinə hörmətlə və humanistcəsinə yanaşmağı müəllimin öz fəaliyyətində nəzərə alması. Humanistlik müəllim peşəsinin mahiyyətində, onun daxilində olan bir xüsusiyyətdir. Müəllimin peşə fəaliyyəti uşaqların şəxsiyyət kimi formalaşdırılması ilə xarakterizə olunduğundan şəxsiyyətə şəxsiyyət kimi yanaşmaq tələb olunur. Onları gələcəyin böyük şəxsiyyətləri kimi görmək, şəxsiyyətlərinə hörmət etmək, tərbiyələrinə humanist mövqedən yanaşmaq müəllimin özünə də böyük hörmət qazandırır. Bu keyfiyyətlərlə müəllimin ixtisas bilikləri üst-üstə düşdükdə müəllim əsl müəllim kimi özü də hörmət qazanmış olur. Yalnız avtokratik mövqedən yanaşmaq, uşaqları qorxutmaq, onları valideynləri ilə və ya imtahanla hədələmək nə müəllimin özünə, nə də pedaqoji prosesə fayda verir. Heç bir fiziki təsir, fiziki cəza isə yolverilməzdir. "Müəllimin vurduğu yerdə gül bitmir, güllər solur" (2). Fiziki cəza şagirdin müəllimə inamını azaldır, onun uşaq qəlbində müəllimə qarşı heç də xoş olmayan hislər yaradır, müəllimin xeyirxahlıq və humanistlik kimi missiyalarına zərbə vurur.

3. Müəllimin sosial-pedaqoji dəyərlərin daşıyıcısı kimi onu özünün gündəlik pedaqoji fəaliyyətində əks etdirməsi. Müəllim təkcə nəsillərarası varisliyin deyil, həm də mədəniyyətin, dəyərlərin daşıyıcısı kimi mühüm bir missiyanı da yerinə yetirir. Müəllim bu gün fəaliyyət göstərməklə gələcəyi qurur, gələcəyin təməl daşlarını qoyur. O özünün fəaliyyəti ilə keçmişin sınaqlardan keçib gələn elmi, mədəniyyəti yeni nəslə ötürür və gələcəyi nəzərə almaqla onlarda yeni bilik, bacarıq və vərdişlər formalaşdırır. Keçmiş nəsillərdən miras qalan yaxşılıqları gənc nəslə aşılamaqla yanaşı, onların yerinə yetirə bilmədikləri, lakin Vətən, millət, xalq üçün gərəkli olan bir çox problemlərin gələcəkdə həll edilməsi üçün onlarda yeni bilik, bacarıq və vərdişlər yaradır. Həm də təkcə bunları yox, onları mənimsəmək motivləri də formalaşdırır.

4. Müəllimin yaradıcı pedaqoji təfəkkürə malik olması və pedaqoji yaradıcılıqla məşğul olması. Müasir dövrdə təhsilin sürətlə və yüksək səviyyədə inkişafı, aparılan islahatlar müəllimdən yeni pedaqoji təfəkkürə malik olmaq və təkcə mövcud olanlarla kifayətlənmək deyil, pedaqoji yaradıcılığa meyilli olmaq və onunla məşğul olmağı tələb edir. Yaradıcı pedaqoji təfəkkür müəllimin yeniliklər üzərində düşünməsi, pedaqoji prosesi özünün yenilikləri, yaradıcı münasibəti ilə daha da məzmunlu və maraqlı etməsi üçün fikirləşməsi, yeni-yeni yollar üzərində düşünməsidir. Yaradıcı pedaqoji təfəkkür müəllimi öz fəaliyyətində daim yeniliklər etməyə sövq etməklə, onu nail olduqları ilə kifayətlənməməyə, daha da yaxşı işləməyə sövq edir, pedaqoji yaradıcılıqla məşğul olmağa tələbat yaradır.

Müəllimlər pedaqoji prosesə yanaşmada heç də eyni mövqedə, eyni səviyyə və qabiliyyətdə deyildirlər. Onların bir qismi mövcud pedaqoji və metodik ədəbiyyatlarda, tövsiyələrdə, təlimat və göstərişlərdə verilən müsbət cəhətləri öz fəaliyyətlərində tətbiq etməklə kifayətlənməyərək, özləri də pedaqoji yaradıcılıqla məşğul olur və müəllif texnologiyalarından istifadə edirlər.

Pedaqoji yaradıcılıqla məşğul olmaq, yeniliklər axtarmaq, öz fəaliyyətində daha səmərəli hesab etdiyi metodlar axtarıb tapmaq və tətbiq etmək tələbatı onu yaradıcı müəllim səviyyəsinə qaldırır. Müəllim yaradıcı müəllim kimi öz fikirlərini həm də həmkarları ilə paylaşır, onlara metodik kömək göstərir.

Yaradıcı pedaqoji təfəkkür müəllimi daim yeniliklər axtarışına çıxarır, onu öz təcrübəsini daha da zənginləşdirməyə stimullaşdırır və gündəlik fəaliyyətinə yeni-yeni çalarlar əlavə etməklə onu peşəkar pedaqoq səviyyəsinə qaldırır.

5. Müəllimin yeni pedaqoji texnologiyaları, texnikanı mənimsəməsi və onları pedaqoji fəaliyyətində tətbiq edə bilməsi. Zamanın tələbi olan bu problem müəllim peşəkarlığında mühüm yer tutur. Nə müasir məktəbi yeni informasiya texnologiyalarsız, nə də müasir müəllimi onlardan yüksək səviyyədə istifadə etmək bacarıqlarsız təsəvvür etmək mümkün deyildir. Artıq bu amil müəllim peşəkarlığını və səriştəliliyini şərtləndirən bacarıqlar kimi həm müəllim hazırlığında, həm də müəllimin peşəkar fəaliyyətində önəmli məsələlərdən birinə çevrilmişdir.

Görkəmli maarifçi F.Köçərli deyirdi: “Müəllim məktəbin canı və camaatın çırağıdır. O öz peşəsini sevməli, şagirdləri övladı kimi istəməli, xeyir verən biliklər aşılamaqla əhalinin rəğbətini və məhəbbətini qazanmalıdır”.

Pedaqoji texnologiyalara metodlar, texnikalar, resurslar, avadanlıqlar, təşkilati işlər, onların həyata keçirilməsi və s. daxil olduğundan o, pedaqoji fəaliyyətin müvəffəqiyyətlə həyata keçirilməsində mühüm rol oynayır. Bu texnologiyalar pedaqoji prosesin sistemli, ardıcıl şəkildə həyata keçirilməsi, təlim və tərbiyə prinsiplərinin, metodlarının qarşılıqlı əlaqədə və kompleks şəkildə reallaşmasıdır. Pedaqoji texnologiyalar məqsədlə nəticə arasında vahid məzmun xəttinin olması, təhsilalanların fəallaşdırılması, həmçinin təhsilverənin özünün fəal olması, öyrənmə prosesində müstəqilliyə geniş yer verilməsi, korreksiyaedici işlərin aparılması, nəticənin alınması və qiymətləndirmə məsələləri də daxil olmaqla müəyyən struktura malik kompleks fəaliyyət sistemidir.

Pedaqoji texnologiyaların tətbiqində istifadə edilən resurslar, metodlar, vasitələr, tərzlər, yaradılan xüsusi situasiyalar, onların seçilməsi və tətbiqi öyrədənlə öyrənənlərin əməkdaşlıq səviyyəsindən və təhsilalanların münasibətindən asılı olmaqla yanaşı, təhsilverənin pedaqoji ustalığından, peşəkarlıq və səriştəlilik səviyyəsindən də çox asılıdır.

Müəllimin pedaqoji peşə mədəniyyətinin formalaşması yollarının çoxluğu ona yiyələnməyin hərtərəfli şəkildə olmasına geniş imkan verir. Müəllim peşəsinə, ixtisasına dair hər gün yeni biliklər öyrənməklə, müəyyən bacarıqlara yiyələnməklə onların səmərəli tətbiqini, onlardan faydalanmağı daha geniş arenaya çıxarır.

A.S.Makarenko deyirdi ki: “Mən əsl usta o zaman oldum ki, “Bura gəl” kəlməsini 15-20 səs tonu çaları ilə ifadə etməyi öyrəndim”.

Nəzərə almaq vacibdir ki, bütün yollar müəllimlərin öz peşəsini, ixtisasını sevməsindən və peşəsinin zirvəsinə ucalmaq üçün yorulmadan çalışmasından başlanır. Bu yolu özünə seçə bilən, hədəfə çatmaq üçün yorulmadan fəaliyyət göstərən müəllimlər təkcə bir müəllim kimi özünün deyil, müəllimlik peşəsinin də nüfuzunun qaldırılmasına səbəb olur, uşaqlarda bu peşəyə maraq, həvəs formalaşdırmış olur.

Göründüyü kimi, peşə mədəniyyəti müasir müəllim şəxsiyyəti üçün ən önəmli keyfiyyətlərdəndir. Bu keyfiyyət və ya keyfiyyətlər qrupu müəllimin səriştəliliyini və peşəkarlığını səciyyələndirən amillər içərisində önəmli yer tutur. Peşə mədəniyyəti ümumi mədəniyyətin tərkib hissəsidir və bu keyfiyyətin formalaşdırılmasına müəllim hazırlığı prosesindən başlanılmalı və peşə fəaliyyəti prosesində ona xüsusi fikir verilməlidir.

Ümidvarıq ki, məqalədə irəli sürülən iş sistemi, nəzəri müddəalar praktik

müəllimlər üçün faydalı olan məsələlərdir. Burada müəllimlərə peşə mədəniyyətinin mahiyyət və məzmunu haqqında dərin məlumat verilir və peşə fəaliyyətində onları tətbiqi texnologiyaları şərh edilir.

Nəticə kimi qeyd etmək lazımdır ki, pedaqoji peşə mədəniyyətinin mahiyyəti, məzmunu və ona yiyələnilməsi yollarının müəllimlərin peşə səriştəliliyi və peşəkarlığı ilə vəhdətdə götürülməsi, pedaqoji peşə mədəniyyətinə yiyələnmənin müəllim nüfuzunun yüksəlməsinə təsiri və tələbələrdə peşə mədəniyyətinin formalaşdırılmasının pedaqoji peşəyönümü üçün əlverişli olması məsələləri məqalənin elmi yeniliyi kimi dəyərləndirilə bilər.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Həsənov A., Ağayev Ə. Pedaqogika. Bakı, 2007.
2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
3. Mahmut A. Peşəkar müəllimin bədən dili. Bakı: Qafqaz Universiteti nəşri, 2013.
4. İlyasov M. Müəllimin pedaqoji ustalığı. Bakı: Elm və təhsil, 2013.
5. Makarenko A.S. Seçilmiş pedaqoji əsərləri. II cild. Bakı: Maarif, 1988.
6. Məmmədzadə R. Müəllimin pedaqogika etikası. Bakı, 1992.
7. İlyasov M. Peşəyönümlülük əsasları. Bakı: Mütərcim, 2011.
8. Основы педагогического мастерства. Москва: Просвешение, 1984.

**М.Ильясов**

**Профессионально педагогической культура педагога**

**Резюме**

Профессиональная педагогическая култура педагога является составной частью общей культуры. Профессиональная култура имеет важное значение в профессиональносте и компетенции педагога.

Имеются несколько факторов профессиональной културы. Это перечисленные факторы: общая культура; культурологическая компетенция; творческое педагогическое мышление; умение использовать новейшие педагогические технологии и др.

Исходя из перечисленных факторов, профессиональная педагогическая культура имеет ряд показателей. Содержание этих показателей всесторонне раскрыто и представлено в статье.

**M.Ilyasov**

**Teacher’s pedagogical profession culture**

**Summary**

Pedagogical professional culture is one of the parts of teacher’s general culture. Professional culture has an important role in professionalism and competence of teacher.

There are some factors in shaping the professional culture. They are following: general culture; culturological competence, creative pedagogical thought, ability to use new pedagogical technologies, etc.

There are some indicators of pedagogical professional culture that derive from above mentioned factors. Those factors occupy main part in this article, and content of all of them was described.

# FİZİKİ İDRAKDA FORMALLAŞDIRMA VƏ ONUN İDRAKİ FUNKSİYALARI



**Əziz Məmmədov,**
***Bakı Dövlət Universitetinin professoru, fəlsəfə üzrə elmlər doktoru***

**Fuad Məmmədov,**
***Sumqayıt Dövlət Universitetinin kafedra müdiri, dosent***



***Açar sözlər:*** *fiziki idrak, formallaşdırma, funksiya, metod, məntiq.*

***Ключевые слова:*** *физические познания, формализация, функция, методы, логики.*

***Key words:*** *physical knowledge, formalization, methods, function, logic.*

Son illər fəlsəfi ədəbiyyatda riyaziləşdirmə, sxemləşdirmə, modelləşdirmə anlayışları ilə yanaşı formallaşdırma anlayışına da tez-tez rast gəlinir. Təbiət elmlərinin, kibernetikanın, formal məntiqin qnoseoloji problemlərinin həllində yaxından iştirak edən bu anlayış nəzəri tədqiqatların, o cümlədən fiziki idrakın əsas metodlarından biri olan formallaşdırmanı ifadə edir [1]. İdrakın müxtəlif sahələrində geniş tətbiq tapan, müasir elmin səciyyəvi xüsusiyyətlərindən birini təşkil edən bu metod əsasında biliyin formallaşdırılmasına ilk təşəbbüs riyaziyyatda (xüsusi işarələrdən istifadə olunması) və formal məntiqdə (əqli nəticənin strukturunun aydınlaşdırılması) edilmişdir.

Formallaşdırma obyektlə idrakın nəticəsi arasında aralıq mərhələ təşkil edən elə qnoseoloji mexanizmdir ki, o, ikinci dərəcəli ünsürlərdən təmizlədiyi idrak prosesində elmi biliyin sintezini təmin etməklə idrak obyektinin əyani qavranılmasının çətin və yaxud, ümumiyyətlə, mümkün olmadığı hallarda elmi və empirik axtarışların nəticələrini bilavasitə əyani təsvir etməyə imkan verir.

Biliyin riyaziləşdirilməsinin və formallaşdırılmasının məntiqi səbəblərindən biri nəzəri mülahizələrin məntiqi formalarının dəqiqləşdirilməsinə olan tələbatla bağlıdır. Lakin bununla belə son illər formallaşdırma metoduna artmaqda olan marağı və bununla əlaqədar bu sahədə tədqiqat işlərinin sayının getdikcə artmasını təkcə qnoseologiyanın daxili qanunauyğunluqları ilə izah etmək doğru olmazdı. Bu maraq həm də bütün insan fəaliyyətinin inkişafı gedişindən, ictimai praktikadan, informasiya axınının güclənməsindən, elmin ənənəvi metod və üsullarının həddindən çox artmasından irəli gəlir. İnsan fəaliyyətinin bütün sahələrində informasiyaları toplamaq, onları mənimsəmək, qoruyub saxlamaq, yenidən işləmək və gələcək nəsillərə ötürmək üçün obyektiv aləmin şüurda inikasının adi formalarına nisbətən yeni və daha yığcam vasitələri tələb olunur. Formallaşdırma – elmi idrakın məhz belə vasitələrindən biridir. “Fəlsəfə ensiklopediyası”nda formallaşdırmaya belə tərif verilir: Formallaşdırma hər hansı məzmunlu sahənin (mülahizələr, sübutlar, əməliyyatlar üsulu, informasiyalar, elmi nəzəriyyələr, axtarışlar) formal sistemlər və ya hesablamalar şəklində təsvir edilməsidir. Müəyyən abstraktlaşdırmalar, ideallaşdırmalar və süni simvolik dillər vasitəsilə həyata keçirilən formallaşdırma, əsasən, riyaziyyatda, habelə riyazi aparatının tətbiq dərəcəsi kifayət qədər yüksək olan

elmlərdə istifadə olunur" [2].

Formallaşdırmaya xalis məntiqi üsul kimi baxan M.Andryusenko və B.Axlibinski isə onu belə xarakterizə edirlər: "Sözün dar mənasında formallaşdırma dedikdə, formal sistemin qurulması yolu ilə məzmunlu sistemin məntiqi strukturunun təhlili başa düşülür. Formallaşdırma anlayışının sözün geniş mənasında işlədilməsinin əleyhinə çıxan bu müəlliflər öz mövqelərini belə bir dəlillə əsaslandırmağa çalışırlar ki, onlar bu anlayışın formal məntiqdən kənarda tətbiq edilə bilməsinə əmin deyillər. Halbuki professor V.Qott və professor A.Ursul formallaşdırmanı "bütün xüsusi elmlər üçün ümumi olan anlayışlar" sisteminə aid edirlər [3].

İ.Jbankova isə formallaşdırmanı "nəzəri idrakda biliyin məzmunlu təşkilindən onun formal təşkilinə keçidi xarakterizə edən ümumi metod" kimi qiymətləndirir [4].

Formallaşdırmanın qnoseologiyası sahəsində özünün sanballı tədqiqatları ilə tanınan professor D.Qorski bu anlayışın müxtəlif mənalarını müəyyən edir. D.Qorskiyə görə sözün ən geniş mənasında formallaşdırma "təcrübi məzmunun, onun müvafiq invariantlarının, strukturunun köməkçi "süni" dillər vasitəsilə işarə formalarında əks olunmasının öyrənilməsi metodudur". Sözün nisbətən dar mənasında isə formallaşdırmanı D.Qorski "riyazi və məntiqi nəzəriyyələrdə meydana çıxan bir sıra xüsusi problemlərin həlli üçün istifadə olunan metod" kimi təyin edir. D.Qorski, həmçinin formallaşdırmanın qnoseoloji mahiyyətini də müəyyən edərək ona "öyrənilən situasiyanın və ya bilik fraqmentinin sadələşdirilməsi metodu" kimi baxır.

Formallaşdırmanın mahiyyətinin başa düşülməsində bir sıra müəlliflər, o cümlədən A.Tolkaçev, L.Uvarov və b. analoji mövqe tuturlar [5].

Bolqar filosofu D.Spasov isə formallaşdırmanı geniş şərh edərək belə qənaətə gəlir ki, formallaşdırmadan ancaq ənənəvi məntiqi çərçivədə danışmaq olar. Onun nöqteyi-nəzərincə məntiq hüdudlarında formallaşdırma xüsusidən ümumiyə yüksəlmə kimi çıxış edir. D.Spasov burada obrazlı üsuldan istifadə edərək yazır ki, formallaşdırma dağ zirvəsinə qalxmağa bənzəyir, bu zirvədən landşaftın ayrı-ayrı detalları görünməsə də, onun ümumi mənzərəsi və sərhədləri aydın nəzərə çarpır. Bu sərhədləri isə o, obyektlərin adi dil vasitəsilə məntiqi strukturlarda, təfəkkür formalarında əks etdirilən ümumi əlaqə və münasibətlərinə bənzədir. D.Spasovdan fərqli olaraq professor L.Uvarov belə güman edir ki, təbii dildən istifadə edildiyi təqdirdə formallaşdırmaya onun ancaq aşağı səviyyəsi kimi baxmaq olar. L.Uvarov təbii dilin mühakimələrin konkret məzmunundan sərf-nəzər edilən işarələr sistemi ilə əvəz olunduğu formal məntiqi isə formallaşdırmanın yüksək səviyyəsi adlandırır [6]. Professor V.Kurayev də bu problemə dəfələrlə müraciət etmişdir. O, formallaşdırmaya belə tərif verir: "... formallaşdırma məntiqi xüsusiyyətləri tədqiq olunan nəzəriyyənin anlayışlarının mənasından sərf-nəzər etməni təmin edən idraki əməliyyatların məcmusudur. Nəzəriyyənin formallaşdırılması məzmunlu qurulmuş nəzəriyyəni müəyyən növ obyektlər (simvollar) sisteminə çevirməyə, müvafiq qaydalar məcmusuna uyğun olaraq nəzəriyyənin açılışına yalnız simvollar görkəmi və qaydası ala bilən obyektlərin manipulyasiyasına müncər etməyə imkan verir. Bununla da formallaşdırmaya məruz qalan elmi nəzəriyyə ilə ifadə olunan idraki məzmundan sərf-nəzər etmək imkanı yaranır".

Beləliklə, formallaşdırma metodunun təriflərinin heç də tam olmayan xülasəsi göstərir ki, müxtəlif müəlliflər bu anlayışı heç də bir mənalı işlətmirlər. Əgər bu tərifləri, onlarda yol verilən abstraktlaşdırmanın dərəcəsinə görə düzsəydik, bu sıranın bir qütbündə formallaşdırmanı, hətta adi dil əsasında aparılmasını mümkün sayan D.Spasov, digər qütbündə isə formallaşdırmanın ancaq simvollar və işarələrlə aparılmasını qəbul edən V.Kurayev durardı. Bu sıranın ortasında isə biliyin simvolik və

məzmunlu ifadəsini vahid bir sistemdə birləşdirməklə qismən formallaşdırmanı daha ehtimallı sayan D.Qorski yerləşərdi. Bütün bu müəllifləri birləşdirən ümumi cəhət budur ki, onların hamısı istinasız olaraq formallaşdırmanı idrak metodu kimi xarakterizə edirlər, onların baxışlarındakı fərq isə bundan ibarətdir ki, ayrı-ayrı müəlliflər bu metodun tətbiq sahəsini müxtəlif ölçülərdə götürürlər (formal məntiq, ənənəvi məntiq, digər elmlər). Lakin bu müəlliflər formallaşdırmanın tətbiq sahəsi haqqındakı fikirlərində də təbiətşünaslığın və texniki elmlərin hüdudlarından kənara çıxmırlar. Onların heç birisi humanitar elmlərin, o cümlədən fəlsəfi elmlərin anlayışlarının formallaşdırılması ideyasına nəzər salmırlar. Bizə məlum olan işlər içərisində yalnız professor M.Kaqan humanitar elmlərin formallaşdırılmasının mümkünlüyü məsələsini irəli sürür və bu zəmində formallaşdırmaya sistemli tədqiqatın zəruri aspekti kimi baxır.

Formallaşdırma metodunun yuxarıda verdiyimiz müxtəlif xarakteristikalarından bu qənaətə gəlmək olar ki, müasir elmdə “formallaşdırma” anlayışı, əsasən, iki mənada işlədilir. Sözün nisbətən dar mənasında formallaşdırma riyazi və məntiqi nəzəriyyələrdə xüsusi problemlərin həllinə imkan verən metoddur.

Belə problemlərə misal olaraq riyazi tənliklərin qeyri-ziddiyyətli olmasının sübut edilməsi, aksiomların bir-birindən asılı olmamasının isbatı, irəli sürülən hər bir müddəanın sübut edilən olması və s. göstərmək olar. Bu məsələlər xalis formal şəkildə, xüsusi simvollardan istifadə yolu ilə həll edilir.

Sözün nisbətən geniş mənasında isə formallaşdırma müxtəlif obyektlərin məzmun və strukturunu işarə formalarında, ən müxtəlif “süni” dillər, o cümlədən riyazi, riyazi məntiq, kimyəvi, radiotexniki və s. dillərdə əks etdirmək yolu ilə öyrənmək metodudur.

Nəzəriyyələrin formal sistemlər əsasında ifadə olunması yalnız onların məzmununun dərindən və hərtərəfli təhlili əsasında baş verir. Buna görə də “formal sistemlərin məzmunsuz simvollara analoji olduğunu söyləyən filosof və məntiqşünaslar, fikrimizcə, kökündən yanılırlar”. Əslində, formal sistemlərin quraşdırılmasında istifadə olunan simvolların mənasından sərf-nəzər edilməsinə və teoremlərin nəticələrinin xalis formal çıxarılmasına baxmayaraq, formallaşdırmanın bu və ya digər nəzəriyyəyə tətbiqi yalnız onun məzmunlu təhlilindən sonra mümkün olur.

Formallaşdırmanın birinci mərhələsi (bu mərhələ ancaq bəzi məsələlərin həllində istifadə olunur) – ilkin məlumatların hamılıqla başa düşüləcək bir dildə qeydə alınmasından ibarətdir. Bəzi mülahizələrə rəğmən bu dilin “süni” dil olması heç də vacib deyil, bu dil təbii dil də ola bilər. Lakin həmin təbii dil hamılıqla başa düşülməli və çoxmənalı olmamalıdır.

Formallaşdırmanın ikinci mərhələsi bir sıra dəqiq qaydalar əsasında ilkin qeydlərin yenidən işlənməsi və dəyişdirilməsi əməliyyatından ibarətdir. “Bu mərhələ aydın dildə yazılmış mətnin ilkin məsələlərinin işlənməsinə daha çox uyğunlaşdırılmış dilə tərcümə edilməsi vasitəsilə hazırlanır” [7]. Formallaşdırmanın ən geniş yayılmış növü olan riyazi vasitələrlə həyata keçirilən formallaşdırma üçün bu mərhələ məsələlərin həlli ilə səciyyələnir. Belə xüsusi məsələlərin həllində müəyyən alqoritmlərdən də istifadə olunur. Formal sistemin formallaşmasının bu mərhələsində aşağıdakı cəhətlər aşkar edilməlidir: 1) simvollar üzərində aparılan əməliyyatlar; 2) mövcud simvollar əsasında elementar təkliflərin quraşdırılması qaydaları; 3) elementar təkliflər üzərində aparılan əməliyyatlar; 4) elementar təkliflərdən daha mürəkkəb təkliflərin çıxarılmasına imkan verən qaydalar.

Nəhayət, formallaşdırmanın üçüncü mərhələsi – alınmış nəticələrin reallıqla tutuşdurulmasından ibarətdir. Bu mərhələdə formallaşdırmanın səmərəliliyi yoxlanılır və onun əsasını təşkil edən fərziyyələrin (postulatların) qiymətləndirilməsi həyata keçirilir.

Formallaşdırma prosesi müxtəlif elmlərdə müxtəlif cür inkişaf etdirilir. Bir sıra müəlliflərin fikrinə isnad edərək bu prosesin yalnız formal məntiqdə başa çatdığını, riyazi məntiqdə isə onun, demək olar ki, başa çatmaq üzrə olduğunu hökm etmək olar. İnkişaf edən obyektiv prosesin inikası olmaq etibarilə formallaşdırmanın çox səviyyəli olması belə bir nəticə çıxarmağa əsas verir ki, onun müxtəlif elmlərdə tətbiqi müxtəlif dərinliklərə çatır [8]. Adi danışıq və yazı dilləri ünsiyyət üçün tamamilə əlverişli olsalar da onlar süni yollarla yaradılmış formallaşdırılmış dillərə xas olan dəqiqlik və ciddilikdən məhrumdurlar. Təbii dillərin əksər sözləri və ifadələri çox mənalı olduğu kimi, onların bəzi sözlərin hərfi mənası da onlarda əks etdirilən obyektlərin həqiqi məzmununa adekvat olmur.

Dil və təfəkkürün münasibəti məsələsinin həllinə düzgün metodoloji yanaşmada süni dillərin yaradılması heç bir anlaşılmazlıq yaratmır. Süni dillər elmi idrakın köməkçi vasitələri olub, adi danışıq dilinin tamamlanmasına və onun daha da möhkəmləndirilməsinə xidmət edirlər. Lakin süni dilin timsalında, ümumiyyətlə, dilin özünün başa düşülməsi dəyişilir, belə ki, bu yeni anlama tərzində süni dilin spesifik xüsusiyyətləri hökmən nəzərə alınmalıdır.

Adi dil səslər və ya hərflər sistemidir. Lakin dildə səs və hərflərin əvəzinə ixtiyari siqnallardan, simvollardan, jestlərdən də istifadə edilir. İşarə sistemlərinin ümumi nəzəriyyəsini təşkil edən semiotikada dil məhz müəyyən işarələr sistemi kimi öyrənilir. Buna görə də semiotikada dil materialı olaraq nəyin seçilməsi tamamilə əhəmiyyətsizdir. Burada dəqiq təyin olunmuş anlaşıqlı işarələr məcmusu dil materialı kimi götürülür. Semiotikada dilin iki mühüm xüsusiyyəti ayrıca qeyd edilir:

1) spesifik əlifbanın, başqa sözlə, yazılı dildə istifadə olunan hərflərə oxşar müəyyən işarələr sisteminin olması; 2) işarələrdən müxtəlif kombinasiyalar yaratmağa imkan verən xüsusi qaydaların olması. Bu halda işarələrdən yaradılan kombinasiyalar dil ifadələri və ya sözlər adlanır.

İxtiyari dilin təhlilində üç əsas amillə rastlaşmaq olar: a) dildən istifadə edən şəxs; b) dildə istifadə olunan ifadələr; 3) ifadələrin əks etdirdiyi obyektlər.

Dilin təhlilində rast gəlinən bu amillərə uyğun olaraq semiotik təhlilin üç sahəsini fərqləndirmək olar: praqmatika, sintaksis və semantika.

Praqmatikada dildən istifadə edən şəxsin dilin işarə və ifadələrinə münasibəti təhlil olunur.

Semantikada dildən istifadə edən şəxsdən sərf-nəzər etməklə dilin istifadə etdiyi ifadələrlə onların əks etdirdiyi obyektlərin münasibətləri təhlil olunur.

Sintaksisdə isə həm dildən istifadə edən şəxsdən, həm də dil ifadələrinin əks etdirdikləri obyektlərdən sərf-nəzər etməklə dil ifadələrinin özləri təhlil olunur.

Formallaşdırılmış dil adi dilə analoji olaraq qurulur və bu zaman məntiqi və fərdi növlərə ayrılan çıxış simvollar onun əlifbasını yaradır. Fərdi simvollar konkret nəzəriyyəni, məsələn, riyaziyyatın obyektlərini, məntiqi simvollar isə bütün nəzəriyyələrin ümumi məntiqi əlaqələrini ifadə edirlər. Bununla da simvollar adi dil əlifbasının hərflərinə tamamilə uyğun gəlir. Əlifbanın hərfləri, söz və ifadələri təşkil etdikləri kimi, simvollar da formallaşdırılmış dilin düstur və ifadələrini yaradırlar.

Formallaşdırmanın elmi tədqiqat metodu kimi nəzərdən keçirilməsi və müzakirəsi əsasında bir sıra qnoseoloji problemlər irəli sürülmüşdür. Bu problemlərdən bəzilərinə nəzər yetirək.

Formallaşdırılmış bilik xüsusi quraşdırılmış işarələr və formalizmlər vasitəsilə ifadə olunduğundan, bu formalizmlərin, bir tərəfdən, inikas obyektinə, digər tərəfdən isə dərk edən subyektə münasibətinin aydınlaşdırılması problemi qarşıya çıxır.

Beləliklə, formallaşdırmanın mühüm qnoseoloji problemlərindən birincisini spesifliyi nəzərə alınmaqla formallaşdırmada iştirak edən subyektin idrak obyektinə

münasibəti məsələsi təşkil edir.

Formallaşdırmanın ikinci qnoseoloji problemini formal sistemlərin nisbi müstəqilliyi və formallaşdırmadan istifadə edildiyi təqdirdə subyektlə obyektin əlaqəsinin bilvasitə olması məsələsi təşkil edir.

Formallaşdırmanın üçüncü qnoseoloji problemi – formallaşdırılan biliyin ona yaxın olan bilik sahələrinə uyğun və bütövlükdə dünyanın idraki inikasına adekvat olmasına riayət edilməsi məsələsidir.

Formallaşdırma metodu yeni bilik alınmasını necə, hansı şəraitdə, hansı tərzdə təmin edir? Bu suallara cavab vermək üçün formallaşdırmanın mahiyyətini, strukturunu, gerçəkliyi əks etdirmə mexanizmini, habelə onun tətbiqinin müsbət və mənfi cəhətlərini araşdırmaq lazımdır.

Formallaşdırma prosesində nəzəriyyənin üç növü – məzmunlu nəzəriyyə, metanəzəriyyə və formal nəzəriyyə qarşılıqlı təsirdə olurlar.

Məzmunlu nəzəriyyə – obyektiv gerçəkliyin müəyyən sahəsini təbii dil vasitəsilə təsvir edən nəzəriyyədir.

Formal və ya predmetli nəzəriyyə isə müəyyən məzmunlu nəzəriyyəyə müvafiq olan və bu nəzəriyyənin bilik sistemini dəqiq fiksələnmiş qaydalar əsasında tərtib olunan işarələr, simvollar, aksiomlar və s. məntiqi vasitələrlə ifadə edən nəzəriyyədir.

Metanəzəriyyə – məzmunlu nəzəriyyə ilə ona müvafiq formal nəzəriyyənin qarşılıqlı təsirinin xarakterini açmağa imkan verən sistemdir.

Məzmunlu, formal və metanəzəriyyələrin xarakteristikalarına əsaslanaraq biz formallaşdırmanın mahiyyətini məzmunlu nəzəriyyənin konkret müddəalarından abstraksiya edilməsi və onun məntiqi strukturunun, daxili münasibətlərinin aşkar edilməsi məqsədilə bu müddəaların formal nəzəriyyənin simvolları, formalizmləri ilə əvəz olunması kimi təyin edə bilərik. Məzmunlu nəzəriyyənin müddəalarının həqiqiliyi onların çevrilmiş olduğu formalizmlərin və metanəzəriyyə çərçivəsində formalizmlər üzərində aparılan əməliyyatlardan alınan nəticələrin həqiqiliyi ilə yoxlanılır. Lakin bütün bu əlavə çətinliklər biliyin formal nəzəriyyə sistemində lakonik çevrilməsi üsulu ilə kompensə edilir.

Beləliklə, biliyin sistemləşdirilməsi, onun strukturunun dəqiq təsviri və məzmunlu nəzəriyyə ilə müqayisədə işarələrlə aparılan əməliyyatların daha böyük sürəti hesabına formallaşdırma metodu evristik effekt verə bilir.

Yuxarıda qeyd etdik ki, formallaşdırılmış biliyin maddi daşıyıcısı məzmunlu nəzəriyyənin hüdudlarında birmənalı təyin olunan işarə vahidləri – formalizmlərdir. Formalizmlər üzərində aparılan əməliyyatlar məzmunlu nəzəriyyədən törəyən qaydalar sistemi ilə tənzimlənir. Professor A.Pankratov təbii dilin formallaşdırılmış dildən fərqinə baxarkən birincini “anlayış dili”, ikincini isə insanın xüsusi bilik sahəsində işləyib hazırladığı “şeylər” dili kimi səciyyələndirir.

Biliyin müxtəlif sahələrində dilin formallaşdırılması dərəcəsi müxtəlifdir. Qismən formallaşdırılmış nəzəriyyələrdə formallaşdırma çıxış biliklə axtarılan məzmunlu bilik arasında yerləşən idrak pilləsidir; bu halda məzmunlu biliyin bütün həcmi deyil, yalnız müəyyən hissəsi formallaşdırılaraq işarə formasına keçirilir.

Bir sıra müəlliflər, o cümlədən V.Kurayev və V.Perepeliçın “metadil” anlayışını məzmunlu və predmeti nəzəriyyələr arasında keçid pilləsi kimi qiymətləndirərək öz fikirlərinə belə bir istiqamət verirlər ki, təbii dilin əlifba ehtiyatlarından hazırlanan metadil məzmunlu nəzəriyyənin predmetli dilə və əksinə keçidi üçün nəzərdə tutulur. Professor P.Uvarovun fikrincə, simvollaşdırmasız formallaşdırma mümkün deyil, belə ki, simvol abstraktlaşdırmanı təmsil etməklə, bir növ biliyin spesifik maddi daşıyıcısı rolunu da oynayır. Lakin təbii dildə işlədilən anlayışlardan fərqli olaraq simvollar şərti səciyyə daşıyıb, ciddi birmənalılığa malikdirlər [5]. Buna görə də elmin biliyin

formallaşdırılması prosesində həyata keçirilən simvollaşdırma məzmunlu nəzəriyyənin işarələrə çevrilən çıxış anlayışlarının dəqiqləşdirilməsinə səbəb olmaqla işarələr vasitəsilə ifadə olunan münasibətlərin məna və əhəmiyyətinin də dəqiqləşdirilməsinə imkan verir.

Formallaşdırma bir qayda olaraq əks etdirdiyi elmi biliyin məzmununu tükəndirmir və buna görə də o, həmişə özünün dolğunlaşmasını və tamamlanmasını tələb edir.

Beləliklə, bütün yuxarıda deyilənləri yekunlaşdırıb formallaşdırmanın idraki əhəmiyyətini və tətbiq imkanlarını belə qiymətləndirə bilərik:

– formallaşdırma metodu problemlərin həllinə ümumi yaxşılanmanı təmin edir. Məsələn, riyazi biliklərin erkən inkişaf mərhələsində həndəsi fiqurların sahəsini hesablamaq üçün çoxlu sayda düstur və qaydalardan istifadə olunurdu.

– xüsusi simvollardan istifadə etməklə formallaşdırma metodu elmi biliyi yığcam və aydın ifadə etməyə imkan verir.

– ayrı-ayrı simvollara konkret məna verən və terminlərin adi dil üçün səciyyəvi olan çoxmənalılığını aradan qaldıran formallaşdırma onları dəqiq və birmənalı təyin etməyə imkan verir.

– formallaşdırma metodu faktları ümumiləşdirməyə, sübutları aydın tərzdə və bütün aralıq mərhələlər üçün ifadə etməyə, nəzəriyyənin məzmununu sistemləşdirməyə və onu təhlil edilə biləcək şəklə salmağa imkan verir. Professor A.Subbotin bu münasibətlə yazır: “Formallaşdırma nəzəriyyənin məzmununu sistemləşdirməyə, dəqiqləşdirməyə, metodoloji baxımdan onu aydınlaşdırmağa, onun müxtəlif müddəalarının qarşılıqlı asılılığının xarakterini müəyyənləşdirməyə, həll olunmamış problemləri aşkara çıxarmağa və formulə etməyə imkan verir” [2].

– nəhayət, formallaşdırma metodu obyektlərin işarə modellərini yaratmağa, real cisim və proseslərin tədqiqini həmin modellərin öyrənilməsi ilə əvəz etməyə imkan verir.

Formallaşdırmanın ixtiyari elm üçün əhəmiyyətini professorlar D.Qorski və A.Tolkaçyev qeyd edirlər. A.Tolkaçyev belə fikirdədir ki, formallaşdırma nəinki eyni bir nəzəriyyə daxilində biliyin müxtəlif elementlərini əlaqələndirmək, həm də biliyin müxtəlif sahələrinə mənsub olan nəzəriyyələrin əlaqəsini təmin etmək üçün yararlıdır [5]. Professor V.Smirnov isə formallaşdırmanın pozitiv rolunu qiymətləndirməkdə daha konkret mövqe tutur. O yazır: “Nəzəri ideyalar formallaşdırmada özlərinin tamamlanmasını tapırlar. İxtiyari nəzəri quraşdırmanın idealı – formallaşdırılmış görkəm almaqdır” .

Qeyd etdiyimiz məziyyətlərinə baxmayaraq formallaşdırma metodunun əhəmiyyətini heç də mütləqləşdirmək olmaz. Belə ki, formallaşdırma metodunun tətbiqi müasir elmi biliyin məzmun və formal momentlərinin münasibətləri ilə şərtlənən müəyyən sərhədə malikdir. Formallaşdırmanın tətbiq hüdudları heç də qeyri-məhdud deyil: belə ki, tədqiq olunan sahənin bütün zənginliyini formal sistem vasitəsilə ifadə etmək mümkünsüzdür.

Formallaşdırma metodunun tətbiqinin məhdud olması ilə əlaqədar professor V.Kurayev formallaşdırmanın “yuxarıdan” və “aşağıdan” məhdudlaşmasından bəhs edir. Formallaşdırmanın “aşağıdan” məhdudlanması o deməkdir ki, hətta ən ardıcıl formallaşdırmada belə həmişə bəzi intuitiv, məzmunlu qalıq mövcud olmaqda davam edir. Professor A.Subbotin bu qalığı “formallaşdırılmış qalıq” adlandırır. V.Kurayevin təbirinə görə isə formallaşdırmanın “yuxarıdan” məhdudlanması bu metodun elmin bütün məntiqi vasitələrini heç də tükəndirə bilməməsi ilə bağlıdır.

Formallaşdırmanın zəif cəhətindən bəhs edən polyak alimi M.Pşelenski yazır ki, “ixtiyari elmi dilin formallaşdırılması onu müəyyən dərəcədə təhrif edir. O, həmişə bir sıra sadələşdirmənin və ideallaşdırmanın nəticəsidir. Lakin məntiqi baxımdan bu təhriflər əhəmiyyətli deyil”.

Elmi-nəzəri tədqiqatın metodu olmaq etibarilə formallaşdırmanın tətbiq məhdudluğunu professor D.Qorski də qeyd edir. O, bu fikirdədir ki, bu metod əsasında biliyin bütün kütləsini deyil, yalnız müəyyən tərəflərini formallaşdırmaq mümkündür.

Beləliklə, formallaşdırma metodunun idraki dəyərini qiymətləndirərkən onun həm qüvvətli, həm də zəif cəhətlərini nəzərə almaq lazımdır.

***Rəyçi: prof. F.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Андрющенко М., Ахлибинский Б. О гносеологическом аспекте формализации / Вопросы гносеологии, логики и методологии научного исследования. Л.: ЛГУ, 1970.

2. Субботина А. Формализация. / Философская энциклопедия. Т.5., М.: Советская энциклопедия, 1970.

3. Готт В., Урсул А. Общенаучное понятия и их роль в познании. М: Знание, Серия: Философия, 1975, №3.

4. Жбанкова И. Гносеологическая роль математической модели в построении физической теории. Гносеологические проблемы формализации. Минск: Наука и техника, 1969.

5. Толкачев А. Категория “строение” и ее роль в анализе формализованного знания / Гносеологические проблемы формализации. Минск, 1969.

6. Уваров Л. Познавательный образ и формализация / Гносеологические проблемы формализации. Минск: Наука и техника, 1969.

7. Бирюков Б. Синтез знания и формализация / Синтез современного научного знания. М.: Наука, 1973.

8. Кураев В. Диалектика содержательного и формального в научном познании. М.: Наука, 1977.

**А.Мамедов,**
**Ф.Мамедов**

**Формализация в физическом познании и её когнитивные функции**

**Резюме**

В статье раскрывается сущность метода формализации, создан её философской  образ и роль в физическом познании которой является сложнейшей проблемой науки. В процессе развития современной науки, а так же в области познания реальности показаны важные эвристические и методологические значение метода формализации.

**A.Mammadov,**
**F.Mammadov**

**Formalization in physical cognition and her cognition functions**

**Summary**

Essence of method of formalization opens up in the article, character and role are created by her philosophical  in physical cognition of that is the most difficult problem of science. In the process of development of modern science, and similarly in area of cognition of reality the important heuristic are shown and methodological value of method of formalization.



# FANTAZİYA YARADICI TƏXƏYYÜLÜ İNKİŞAF ETDİRİR

**Əjdər Ağayev,**
***pedaqoji elmlər doktoru, professor***

Məqalədə fantastik hekayələrdən bəhs edilir. Nümunə üçün Zahid Xəlilin hekayələrindəki fantastik obrazlar götürülür. Müəllifin fantastik hekayələrindən "Dünyanın ən kiçik nağılları", "Orxan, Vəfa və Bənək", "Çınqı"dakı fantastik uşaq aləminə məxsus düşüncələrin uşaqların yaradıcı təxəyyülünün inkişafına təsiri şərh olunur.

***Açar sözlər:*** *yaradıcı təxəyyül, uşaq ədəbiyyatı, fantaziya, hekayə, uşaq aləmi.*
***Ключевые слова:*** *творческое воображение, детская литература, фантастика, рассказы, детский мир.*
***Key words:*** *creative imagination, children's literature, fantasy, science fiction, fairy tale.*

Fantaziya insan psixikası ilə bağlı olan bir prosesdir, daha doğrusu, insanın qavrayış və hafizəsi ilə bağlı təsəvvürlərin yenidən işlənməsi, yeni qaydada birləşdirilməsi əsasında yeni surətlərin yaradılmasından ibarət olan psixi prosesdir.

Fantastik sayılan əsərlərin zaman keçdikdən sonra həyata keçməsi halları elmə məlumdur. Jül Vernin yüz səkkiz fantastik ideyasından yalnız onu səhv çıxmışdır. Morqan Robertson Titanik qəzasından çox illər əvvəl "Titan" adlı əsər yazmışdır. Bu əsərdə o, Titan adlı nəhəng gəminin qəzasından danışırdı. Romandakı nəhəng Titanla Titanik arasında ağlasığmaz bənzərliklər, uyğunluqlar vardır. Robertsonun Titan qəzası romanı gerçək Titanik qəzasından tam 14 il əvvəl yaranmışdır. Qəzadan sonrakı illərdə aparılan müqayisələr yazıçı xəyalının, yazıçı fantaziyasının zənginliyini bir daha təsdiq etmişdir.

Ədəbiyyat aləminə məlum olan və hamı tərəfindən fantastik sayılan əsərlərin zaman keçdikdən sonra həyata keçməsi, araşdırmaçıların diqqətini məhz fantastik janrda yazan yazıçıların əsərlərinə yönəldilməsinə səbəb olmuşdu. Belə hallar Azərbaycan ədəbiyyatına da xasdır. Beləliklə,Yusif Vəzir Çəmənzəminlinin yazdığı "Gələcək şəhər" əsərində baş verənlər o zaman fantastika olsa da, bəziləri hazırda həyata keçmişdir. 1933-cü ildə yazılan bu əsərdə təyyarələrin on beş və daha artıq mərtəbəli binaların damına qonması, həkimlərin videogörüntü ilə xəstələrə baxması, müasir liftlər, mobil video telefonlar və təbiətin idarə edilməsi, şəhərdə havanın təmizlənməsi üçün yağışın yağdırılması indi həqiqət kimi qəbul olunur. Deməli, fantaziyalar Azərbaycan xalq nağılları üçün də səciyyəvidir. Yəqin ki, zaman keçəcək, onların da həqiqətə çevrilməsi təsdiq ediləcəkdir.

Şifahi xalq ədəbiyyatının ən geniş yayılmış növlərindən biri nağıllardır. Nağıl qədimliyinə və çoxistiqamətliliyinə görə də diqqət çəkir.

Dastanlarda olduğu kimi, nağılların da məzmun və məqsədinə görə müxtəlifliyini qeyd etmək olar. Məsələn, məhəbbət nağılları, qəhrəmanlıq nağılları, didaktik nağıllar, məişət nağılları, təbiət nağılları, sehrli nağıllar və s.

Nağıllar canlı xalq dilinə uyarlığı, təbiiliyi, gerçəkliyi fantastik olaraq əks

etdirməsi, süjet xəttinin əhvalatlarla inkişaf etdirilməsi, qeyri-adiliklə təəccüb doğurması, digər estetik məzmun və üslub xüsusiyyətlərinə görə hamı tərəfindən maraqla oxunur, dinlənilir.

Nağılların bədii-estetik dəyəri ilə yanaşı, güclü tərbiyəvi təsiri vardır. Bəlkə, elə buna görə də uşaqlara anlaşıqlı olan, onları düşündürən, təəccübləndirən nağıllar daha geniş yayılmışdır. Aşıqlar müəllif olaraq dastan yaradıcılığının yazılı ədəbiyyat nümunələrini meydana gətirdikləri kimi, yazıçılar da uşaqlar üçün nağıllar yazmaqla şifahi xalq ədəbiyyatı ənənələrini davam etdirmişlər.

“Uşaq nağıllarında heyvan, quş obrazları mənəvi tərbiyə vasitəsinə çevrilir, uşaqlar onların başına gələn hadisələrdən, hərəkətlərindən, davranışlarından ibrət dərsi alırlar” (3).

Bu yanaşmanı güllərə, çiçəklərə, ağaclara, göllərə, dağlara və digər təbiət reallıqlarına da aid etmək olar. “Nağılın ideal qəhrəmanları ağılın, qorxmazlığın, doğruçuluğun daşıyıcısı kimi əks olunurlar”. Eləcə də uşaq nağıllarında əks etdirilən quş, bitki, daş, göl və s. obrazlarda gözəllik, hərəkət, ünsiyyət, rəqabət, mübahisə və s. keyfiyyətlərin simvolik nümunələri uşaq fantaziyasını inkişaf etdirir, yaradıcı düşüncə formalaşmasına kömək edir.

Tədqiqatçı alim Bilal Həsənlinin belə bir qənaəti ilə tam şərikik ki, “uşaq nağılları xalq pedaqogikasının mühüm vasitəsi kimi düşünülüb yaradılmışdır. Bu nağıllarda uşağı tərbiyə etmək, mənəvi dəyərlər aşılamaq niyyəti ön plana çəkilir” (3).

Dünya xalqları ədəbiyyatında olduğu kimi, Azərbaycan ədəbiyyatında da yazarların uşaqlar üçün yazdıqları maraqlı nağıl nümunələri vardır. Bu baxımdan Qasım bəy Zakirin, Mikayıl Müşfiqin, Abdulla Şaiqin, Mikayıl Rzaquluzadənin, Səməd Behrənginin, Elçinin, Zahid Xəlilin, Gülzar İbrahimovanın yaradıcılığı səciyyəvidir.

“Bu günün yazıçısı əsrin sürətli inkişafından geri qalmamalı, həyatımızın məzmununu, mahiyyətini açmalı, müasir məktəblinin mükəmməl obrazını yaratmalıdır” (6). Bunlar hələ kifayət deyil. Bu günün nağılları uşaq fantaziyasının güclənməsinə, onlarda yaradıcı düşüncənin inkişafına xidmət etməli, onları təbiətin əsrarəngiz sirlərinin sehrli aləmini romantik duyğularla qavramağa yönəltməlidir.

Bu baxımdan Zahid Xəlilin nağılları və nağılvari hekayələri uşaq ədəbiyyatında xüsusi yer tutur.

**Zahid Xəlilin nağıl dünyası:** Çağdaş Azərbaycan söz sənətinin görkəmli nümayəndəsi Zahid Xəlilin bədii və elmi yaradıcılığının əsas istiqamətini uşaq ədəbiyyatı təşkil edir. Onun “Torağaylar oxuyur”, “Cırtdanın balıq ovu”, “Ballıca”, “Çıraq nənənin nağılları”, “Cırtdanla Azmanın başına gələnlər”, “Cırtdanla Azmanın təzə macəraları”, “Orxan və dostları”, “Göydən üç alma düşdü”, “Dünyanın ən balaca nağılları”, “Orxan, Vəfa və Bənək” kimi kitabları balaca oxucuların maraqla oxuduqları şeirlər və hekayələrdən ibarətdir.

Onun uşaqlar üçün yazdığı “Sərçələr”, “Siçanların kələyi”, “Qaraqulaq ağ küçük”, “Ovçu Paşabalanın macəraları”, “Sıfırın nağılı”, “Dəcəl çəpiş və qumral quzu” poemaları uşaq ədəbiyyatının ən yaxşı nümunələridir.

Hər hansı mövzuya orijinal yanaşma, folklora xas deyim tərzi, uşaqların xəyal dünyasını genişləndirmə, onları təəccüblə heyrətləndirmə cəhdi Zahid Xəlil yaradıcılığına xas xüsusiyyətlərdir. Sənətkarın yaradıcılığında digər bir üslubi keyfiyyət romantikaya üstünlük verməsində, fantaziya imkanlarından məharətlə istifadədə özünü göstərir. Ona görə də onun əsərlərinin, demək olar

ki, hamısı güclü təxəyyülün məhsuludur, nağılvaridir. Bu da yazarın tükənməyən fantaziya sahibi olmasından irəli gəlir. Yazıçı öz nağılları ilə balaca oxucularını da fantaziya aləminə daxil edir.

Bəllidir ki, uşaqlıqda yaradıcı təxəyyülə, fantaziyaya yiyələnmə gələcəkdə kəşflərə, ixtiralara sahib olma imkanını formalaşdırır. Zahid Xəlilin nağılları canlı, cansız təbiətdə nə mövcuddursa, hamısını düşündürə, dillədirə, danışdıra bilir, təbiətinə xas fantastik münasibətlərə qoşur. Onun nağıllarında fantastik əhvalatlar, fantastik şərhlər, fantastik obrazlar o qədər canlı, həyati, maraqlı təqdim olunur ki, yazıçı sanki oxucularını onların həqiqət olduğuna inandırmağa çalışır. Sehrlənmiş uşaq xəyalı bütün bunları aydın təsəvvür edə bilir, öz aləmində quşa dönüb uçur, daşla danışır, dağla söhbətə girişir, güllərlə, çiçəklərlə bəhsləşir, pişiklə, itlə dostlaşır, uçan velosiped düzəldir. Bu nağıllarda hər şey adidir, əlçatandır, anlaşılandır, bütün var olanlar bir-birinə gərəklidir, bir-biri ilə ünsiyyətdədir.

Zahid Xəlilin əsərləri bütün dünya uşaqlarına yönəlişli ədəbiyyat inciləridir. Onun nağıl qəhrəmanları, hadisələr Azərbaycan təbiətindən, həyatından, ənənəsindən alınsa da, məzmunca bəşəri mahiyyət daşıyır, bütün dünya uşaqlarına xasdır.

Görünür, bu cəhət Zahid Xəlilin dünya uşaq ədəbiyyatı korifeylərinin yaradıcılığı ilə mükəmməl tanışlığından və sənətkarlıq qüdrətindən irəli gəlir. Yazıçının “Çıraq nənənin nağılları”, “Cırtdanla Azmanın təzə macəraları”, “Dünyanın ən balaca nağılları” və digər kitablarını oxuduqca yazıçı fantaziyasının genişliyinə heyrət edirsən.

Zahid Xəlil nəinki təbiət reallıqlarını, hətta fantaziyanı da danışdırır. Onun “Heç zaman danışılmayan nağıl”ında belə bir əhvalat təqdim olunur: “Biri var idi, biri yox idi, heç zaman danışılmayan bir nağıl var idi. Bu nağıl fikirləşirdi ki, görəsən onu nə üçün danışmayıblar?”.

Yazıçı bunun səbəbini fantastik yolla açır və nəhayət, bəlli olur ki, bu nağılda quruda yaşayıb, danışa bilən balıqları haradansa gəlmiş itlər, pişiklər yediyinə görə, balıqların qorxudan lal olmasından və suya gizlənmək üçün atılmalarından danışılır. Guya belə xoşagəlməz hadisədən bəhs etdiyi üçün bu nağıl danışılmır.

Zahid Xəlil fantastik nağılları ilə oxucularına təbiəti, ictimai ziddiyyətləri, alleqorik yolla insanları, münasibətləri tanıdır. “Pul şəhərinin əhvalatları” nağılını bu qəbildən hesab etmək olar. “Biri var idi, biri yox idi, bir pul şəhəri var idi. Həmin bu pul şəhərində Şahı şahlıq edirdi…”. Maraqlı fantastik şərhlə nağıl davam edir. Şahı özünə Abbası təxəllüsünü götürür və başlayır “ədalətli” hökmlər verməyə. Bütün şahıları, üçqəpiklikləri, ikiqəpiklikləri və birqəpiklikləri saraya işə dəvət edir. Saraydakı bu qohum-əqrəbalar şahdan birqəpiklikdən, ikiqəpiklikdən, üçqəpiklikdən birini ləqəb götürməyib, onlardan uzaq Abbasını götürdüyü üçün narazılıq edirlər. Şahı bildirir ki, onu qohumbazlıqda təqsirləndirməsinlər deyə Abbasını ləqəb götürüb.

Nağıl davam edir: “Qohumlar özlərinin işgüzarlığını bir-birinə sübut etmək üçün əl-ayağa düşdülər. Əvvəl bazarı nəzərdən keçirməyə başladılar… əvvəl qapının ağzında cındır geyimli bir adamla qarşılaşdılar:

- Ey, adın nədir?
- Qızıl.
- Qızıl? Birqəpiklik mümkün qədər özünü dartdı ki, onun daha qiymətli olduğunu başa düşsünlər.
- Yaxşı, ey qızıl, de görək nə işlə məşğul olursan?
- Mən torpaq adamıyam. Əkirəm, biçirəm, gətirib bazarda satıram.
- De görək buğdanın pudunu neçəyə verirsən?

- Kilosu bir şahıdı. Çox götürsən, tonunu bir qızıla verə bilərəm.

- … Nə danışdığını bilirsən? Bəs sən başa düşmürsən ki, əksinə danışmalısan. Məsələn, belə: Kilosu bir qızıl, tonu bir şahı… ”. Nə isə şahı, üçqəpik, ikiqəpik, birqəpik bazarda qiymət qoyurlar. “Balın kilosu bir şahı, yağ üç qəpik. Ayranın kilosu bir qızıl, suyun stəkanı beş qızıl…”. Beləcə qızılı gözdən salıb, bir, iki qəpikliklər qohumları Şahı şah olduğu üçün şahını qiymətə mindirirlər…

Şəhərə yayılır ki, danışığa qulaq asırlar. Nəticədə, pullar danışmağı tamam unudurlar. Onlar ən yaxşı halda cingildəyirlər… (3).

Nağılı oxuyub qurtarırsan, əvvəlcə sənə elə gəlir ki, sadəcə bir nağıl əhvalatıdır. Düşünəndə aydın olur ki, bu nağılda sadəcə ciddi ictimai motiv var. Düşünürsən ki, hər şeyin qiyməti öz dəyərinə görə verilməlidir.

Alleqorik-fantastik “İki sağsağan” nağılı da ictimai mahiyyətli bir nəticə ilə bitir. Bir-birinə çox oxşayan iki sağsağan cib dəftərlərinə yazdıqlarını bir-birlərinə danışırlar. Əvvəlcə, pişiyin şirin babası olmasından, göyərçinlərin davakarlığından, insanların dünyadan xəbərsiz olmalarından danışırlar. Görürlər ki, özünüdartan topaquyruq dələ yuvasına qoz daşıyır. Onu pusurlar. Dələnin 45 sayını hörmətli ayının ölümünə və 45 gün qaldığını bildirməsi kimi qəbul edirlər. Sağsağanlar tez cib dəftərçəsini çıxarıb “bu mühüm məsələni” qeyd edirlər.

Nağılın sonunda oxuyuruq: “Onların anaları isə lap uzunquyruq bir sağsağan idi. O, öz balalarına baxıb, fəxrlə deyirdi:

- Dünyada mənim balalarım kimi mehriban quş tapılmaz” (1).

Yazıçının güclü fantaziyası fantastikadan həqiqətə - cəmiyyətdəki ictimai münasibətlər reallığına qovuşur. Amma bu, fantastika deyil, reallıqdır.

Zahid Xəlilin uşaqlar üçün yazdığı nağıllar söz oyunundan, əyləncəli təsvirlərdən uzaqdır. Bu nağıllar təbiət-insan, insan-insan münasibətlərinin mahiyyətini ortaya qoyaraq, balaca oxucularını düşündürür, onları həyata hazırlamağa xidmət edir. Bu baxımdan “Günəşi qoparmaq istəyən ayılar” nağılı çox səciyyəvidir.

Yazıçı bu nağılda Ayı xislətli xarakter daşıyıcılarının aqibətini göstərir. Belələrinin öz kobudluqlarını anlamadıqları bir yana, başlarına gələn qəzavü-qədərin də nədən yarandığını bilməmələri göstərilir.

Zahid Xəlilin fantastik obrazları sırasında təkcə it, pişik, ayı, dələ, ağac, meyvə, dağ, göl və s. deyil, mücərrəd anlayışlar da var. Məsələn, yalançı söz, pul kisəsi, üçbucaq adam, ağıllı fikir, axmaq fikir və s. Həm də bu obrazlar canlandırılır, nitq sahibinə çevrilirlər.

Həm real, həm də fantastik əhvalatlarla, münasibətlərlə yazılmış əsərlərində də yazıçının fantaziyası əsas təşkil edir. Ədibin “Orxan, Vəfa və Bənək” (5) adlı kitabı bu cəhətdən diqqət çəkir.

Orxanın uçan velosiped düzəltməsi və uçuş etməsi nəticəsində başına gələn əhvalatların iştirakçısı, narahatlıq keçirən təkcə Vəfa deyil, həm də sadiq it dostu Bənəkdir.

Zahid Xəlil nağılları ilə uşaq təəccübünü, heyrətini yaratmağın ustasıdır. Ədibin “Çınqı” (6) əsəri də bu baxımdan çox səciyyəvidir. Vahid süjetə, müxtəlif obrazlara malik bu nağıl – povestdə, hətta nağılçı özü də iştirak edir. Nağılçı bildirir ki, Çınqı yeni qəhrəmandır. Onu daha yaxşı tanımaq üçün nağılçının yazı makinasında qərarlaşmış, oradan çıxıb fantastik hadisələr burulğanına düşmüş qəhrəmanları da gərək tanıyasan. Kimdir onlar? Ballıca, Şeşəbığ, Fındıqburun, Dəmirdaban, Xallı, Orxan, Ütü, Fırça, Usta Həsən, Qəlbinur, Fərman, Aygəz Çiçək, Azman və digərləri.

“Çınqı” nağılındakı hadisələr fantas-

tik, iştirakçıların xeylisi isə realdır. Nağılçı baş verənləri elə məntiqli, əlaqəli şərh edir ki, real insanların və proseslərin həqiqiliyi ilə culğaşır və az qala oxucunu inandırır.

Nağıldakı uydurulan epizodlardan biri Çınqının Bakıya uçmasını əks etdirir. Çınqı, onun hara uçmaq istədiyini soruşan qıza cavab verir ki, Bakıya, oradan da Yevlaxa gedəcək. Amma onu təyyarəyə buraxmırlar. Tanış olduğu qız onu cibində aparacağına söz verir. Amma Çınqı razı olmur. Deyir ki, hara düşsəm, oranı yandırıram. Nəhayət, Çınqını boş su butulkasına salıb, təyyarəyə mindirirlər. Burada da Çınqının başına gözlənilməz əhvalatlar gəlir. Nəhayət, Çınqı Bakıya çatır. Moskvadan Bakıya cəmi bircə günə gələn Çınqı Bakıdan Yevlaxa düz iki həftəyə gedir. Bundan sonra Çınqının başına gələnlər Kür qırağında baş verir. İnsanlarla, dovşanla, nağıl qəhrəmanları ilə rastlaşır və yenə qəribə əhvalatlar olur…

Nağılçı fantastik Çınqı obrazında qığılcıma məxsus fiziki keyfiyyətləri, real təbiət ünsürlərini, insanların işlətdikləri vasitələri prosesə qoşmaqla, az qala Çınqını da reallaşdırır. Və balaca oxucu düşünür: görəsən belə bir iş ola bilərmi? Və bu düşünmə onu reallıqların fantastik anlamına yönəldir. Beləliklə, nağıldakı fantastik obraz və hadisələr uşaq xəyalında romantik aləm yaradır.

Beləliklə, belə bir qənaətə gəlmək olur ki, Zahid Xəlilin yazdığı nağıllar yazıçı fantaziyasının məhsulu olaraq, uşaq dünyasında romantik duyğular oyadır. Onları həm təbiət reallıqları, həm də insani münasibətlərlə tanış edir. Canlı və cansız aləmi – insanları, heyvanları, otları, daşları canlandıraraq, fantastik təsvirlər verir və oxucu təxəyyülünü gücləndirir.

Yazıçının əsərlərindəki fantastik nağıl qəhrəmanları o qədər təbii təsvirlərlə təqdim olunur ki, onlar sanki uşağın təkcə xəyalında deyil, yaddaşında obrazlaşan varlığa çevrilir.

Zahid Xəlilin nağılları dünya uşaq ədəbiyyatının dəyərli nümunələri sırasında duran əsərlərdir.

***Rəyçi: prof. N.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan ədəbiyyatı tarixi. 6 cilddə. II-III cildlər. Bakı, 2009.
2. Ağayev Ə. Təməldən əmələ. Bakı, 2009.
3. Həsənli B. Azərbaycan uşaq ədəbiyyatı. Bakı, 2015.
4. Xəlil Z. Dünyanın ən balaca nağılları. Bakı, 2002.
5. Xəlil Z. Orxan, Vəfa və Bənək. Bakı, 2015.
6. Xəlil Z. Çınqı. Bakı, 2016.

**А.Агаев**

**Фантазия развивает творческое воображение**

**Резюме**

В статье повествуется о фантастических рассказах к примеру берутся образы фантастических рассказов Захида Халила. А также говорится о влиянии на развитие творческого воображения мыслей, относящихся фантастическому детскому миру в рассказах автора.

**A.Agayev**

**Fantasy develops creative imagination**

**Summary**

The works of Zahid Khalil in line with the fairy tale is argued in the article. The characteristics of the author's fantasy are analyzed. The effect of the heroes of the author's books - "The smallest fairy tales in the world", "Orkhan, Vafa and Banak", "Chinqi" and etc., on the children's imagination is identified in the article.



# QABİLİYYƏTİN ƏSAS KOMPONENTLƏRİ VƏ TƏDRİS PROSESİNDƏ ONLARIN İNKİŞAF ETDİRİLMƏSİ

**Talıb Mahmudov,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***Tovuz rayonu***

***Açar sözlər:*** *qabiliyyət, fərdi işlər, əsas komponentlər, tədris prosesi.*

***Ключевые слова:*** *способность, индивидуальные работы, основные компоненты, учебный процесс.*

***Key words:*** *talent, individual works, key components, educational process.*

İnsanın istənilən fəaliyyət sahəsindəki müvəffəqiyyəti, onun həmin sahəyə aid olan qabiliyyətindən asılıdır. Gündəlik tədris praktikasında bütün müəllimlər bilir ki, şagirdlərin bəzilərinin riyazi, bəzilərinin bədii, digərlərinin humanitar, yaxud təbiət elmlərinə meyilləri daha çoxdur. Bunun səbəbi onlarda həmin sahəyə aid qabiliyyətin başlanğıcının olmasıdır.

Psixoloqlar tərəfindən bir sıra fəaliyyət sahələrinə aid olan qabiliyyətlər və onların inkişaf etdirilməsi şərtləri öyrənilmişdir. Bu sahədə sovet psixoloqlarından S.L.Rubinşteyn, B.M.Teplov və K.K.Platonovun işləri diqqəti daha çox cəlb edir.

Kimyəvi qabiliyyət probleminə ilk dəfə rus alimi M.V.Lomonosovun əsərlərində toxunulmuşdur. "Kimyanı bir dəfə oxumaqla kimyaçı olmaq olmaz. Bundan ötrü çoxlu sayda təcrübələr aparmaq və bunların vasitəsilə maddələrin daxilinə nüfuz etmək lazımdır".

Müasirləri yazırlar ki, Lomonosovda kimyəvi qabiliyyət güclü inkişaf etmişdir. O, zəkası ilə fiziki və kimyəvi hadisələri asanlıqla izah edirmiş.

Kimyəvi qabiliyyətin öyrənilməsi ilə D.A.Epşteyn məşğul olmuşdur. O, kimyəvi qabiliyyətin obrazlı olaraq "kimyəvi əllər" və "kimyəvi başdan" ibarət olduğunu müəyyən etmişdir.

Sonra bu problemlə C.V.Lisiçkin və L.A.Korobeynikova daha ətraflı məşğul olmuşlar. Müəyyən edilmişdir ki, hər hansı mürəkkəb fəaliyyət sahəsinə, o cümlədən kimyaya aid olan qabiliyyət üç hissədən ibarətdir. Bunlar istedad, istedadın əsasında inkişaf etdirilən xüsusi qabiliyyətlər və şəxsiyyətin xarakterik müsbət xüsusiyyətləridir.

İstedad beynin və sinir sisteminin anatomatik-fizioloji quruluşu olmaqla baş beyin qabığının və onun ayrı-ayrı sahələrinin anadangəlmə fərdi xüsusiyyətidir. İstedad müvəqqəti sinir əlaqələrinin əmələ gəlməsinin möhkəmliyində, surətində və çevikliyində meydana çıxır. Bunların əsasında qabiliyyətə aid olan vərdiş və bacarıqları formalaşdıran reflekslər yaranır. Təlim və tərbiyə nəticəsində istedad inkişaf edir və vaxt keçdikcə qabiliyyətin elementlərinə çevrilir.

Xüsusi qabiliyyətin elementləri şəxsiyyətin həmin sahədə müvəffəqiyyət gətirən xüsusiyyətləridir. Bunlar obrazlı fikirləşmə, fəaliyyətin çevikliyi, gözəyarı ölçmə, rəngləri ayırdetmə və iybilmə qabiliyyətləridir. Şəxsiyyətin xarakterik

müsbət xüsusiyyətlərinə əməksevərlik, işgüzarlıq və s. aiddir. Kimyəvi qabiliyyətin inkişafını təmin edən əlamətlər hansılardır? Bunlar məntiqi düşünmə qabiliyyəti, abstraktlaşdırma və ümumiləşdirmə, terminoloji yaddaş, assosativ və obrazlı fikirləşmədir. Bunlar eyni zamanda fizikə, bioloqa, həmçinin coğrafiya mütəxəssisinə də aid olan komponentlərdir.

Kimyaçı üçün ən vacib olan maddələrlə işləməyə meylin, daxili tələbatın olmasıdır. Kimyəvi fikirləşmənin əsasını maddələrdə baş verən dəyişiklikləri, onların çevrilmələrini mikrosəviyyədə obrazlı və modellərlə təsəvvür etmək təşkil edir. Belə fikirləşmə, üstəgəl səliqəlilik, incə hissedici və əməliyyatları yüksək dəqiqliklə yerinə yetirməyi bacaran əllər analitik, yaxud sintezlə məşğul olan kimyaçının portretidir.

Böyük kimyaçıların həyat fəaliyyətlərini öyrənmək belə deməyə əsas verir ki, istinasız olaraq onların hamısında maddələrlə işləməyə anadangəlmə maraq olmuşdur. D.İ.Mendeleyevin uşaqlığı şüşə zavodunda keçmişdir. J.Prust, A.Muasson və Y.Libixin valideynləri aptekdə dərmanlar hazırlamışlar və gələcəyin böyük kimyaçıları hələ uşaq ikən maddələrlə işləməyə başlamışlar. XX əsrin ən böyük kimyaçılarından olan K.Vudvord 12 yaşından üzvi sintezlə məşğul olmuşdur.

Psixoloqlardan bəziləri hər hansı fəaliyyət sahəsinə marağın əsasını tərbiyədə görürlər. Bu prosesdə valideynlərin təsiri və məktəbdə həmin fənnin tədrisinin böyük təsiri var. Lakin anadangəlmə komponentlərin rolunu inkar etmək olmaz. Deməli, kimyəvi qabiliyyət ona aid olan istedad, şəxsiyyətin inkişaf etdirilən xüsusi qabiliyyətləri, maddələr və onlarla işləməyə maraqdan ibarətdir. Bu komponentlərin hər üçü vacibdir.

Onların hər hansı biri ilə ayrılıqda bu sahədə müvəffəqiyyət əldə etmək olmaz. Bəzi hallarda istedad olur, lakin o, inkişaf etdirilmir. Belə şəxslərə deyirlər o, öz istedadını məhv etdi.

Elə fəaliyyət sahələri var ki, onlarda 95%-i əmək, 5%-i istedad təşkil edir. Lakin belə kiçik olmasına baxmayaraq 5% olmasa, yalnız əməklə və daimi məşqlə 100%-i əldə etmək olmaz. Kimyada da belədir. Mütəxəssislərin rəyinə görə əmək və gərgin zəhmətlə orta səviyyəli kimyaçı olmaq olar. Lakin böyük kimyaçılar anadan olurlar. Bu digər mürəkkəb fəaliyyət sahələri üçün də doğrudur.

Kimyəvi qabiliyyətin əsas komponentləri 25-dir. Bəzi hallarda bir insanda həmin komponentlərin hamısı olmur. Onların çatışmayanlarını digərlərini inkişaf etdirməklə kompensasiya etmək olur. Məsələn, yaddaş kifayət qədər inkişaf etməyibsə, onu sistematik şəkildə yerinə yetirilən qeydlərlə, yaxud diqqətsizliyi məqsədyönlü müşahidələrlə aradan qaldırmaq olur.

Kimyəvi qabiliyyətin olmasına şübhə ilə yanaşanlar belə sual verirlər. Kimya elmi yaranmazdan əvvəl kimyəvi qabiliyyət olmuşdurmu? Ağıllı insan –Homo Sapiens formalaşdığı gündən kimyəvi qabiliyyət olmuşdur. Onlarda maddələrlə işləməyə, manipulyasiyaya meyil olmuşdur. Bunlar kimlər idi? Dulusçular, zərgərlər, dəmir əşyaları düzəldən ustalar, misgərlər və s. idi.

Maddələri hərtərəfli öyrənmək, onların tərkibi və quruluşu arasındakı əlaqələri təhlil etmək yalnız kimya elmi formalaşdıqdan (XVIII əsr) sonra baş vermişdir. Ondan əvvəl əlkimya dövründə (VI-XVII əsrlər) əlkimyaçılar (kimyəvi maddələrlə məşğul olanlar) maddələrlə işləyirdilər. Onlar həmin dövrdə ilk dəfə olaraq bir sıra maddələr almışlar. Lakin buna baxmayaraq elmi müvəffəqiyyətlər əldə edə bilməmişlər. Bunun əsas səbəbi onların alınması mümkün

olmayan maddənin-fəlsəfə daşının axtarışı ilə məşğul olmaları idi. Onlarda düzgün elmi təsəvvürlər və maddələri tədqiq etmək üçün cihazlar və s. olmamışdır. Nəzəri mülahizələrin nəticələrini eksperimentdə tapmaq istəyi qeyri-elmi fəaliyyətə səbəb olmuşdur. Əksinə, elmi tədqiqatın istiqaməti eksperimentlərin nəticələrinin izahına doğru yönəldilməlidir. Bunlar göstərir ki, kimya ilə məşğul olanlarda kimyəvi qabiliyyət olmuşdur.

Kimyaçını digər ixtisas sahələrində çalışan mütəxəssislərdən fərqləndirən əsas əlamətlər aşağıdakılardır:

1. Onun maddələrlə işləməyə marağının olması;
2. Maddələrdə baş verən dəyişiklikləri dərk etməyə dərin marağın olması;
3. Maddələrlə işləməkdə əməksevərlik və dözümlüyün olması;
4. Kimyəvi qabiliyyət əsas komponentlərin olmasıdır.

Bunlardan sonra maddələrin dərk edilməsi mərhələsi başlayır. Maddələri dərk etməyin əsas etapları aşağdakılardır. “Canlı müşahidə” zamanı maddələr xarici görünüşləri ilə qəbul edilir. Xarici əlamətləri: aqreqat halı, kütləsi, forması, rəngi, dispersli̇k dərəcəsi, iyi və s. hiss edilir. Bundan ötrü hissiyyat analizatorları yaxşı inkişaf etməlidir. Köhnə dərsliklərdə (XIX əsr) maddələrin xassələrini təsvir edərkən onların dadı mütləq göstərilirdi. Ona görə də kimyaçılar onun dadına baxmalı olmuşlar. Lakin buna müasir tədrisdə icazə verilmir. Orta və ali məktəb kimya laboratoriyalarında işləylərkən təhlükəsizlik texnikası qaydalarında buna xüsusi diqqət yetirilir. Maddələrin dadına baxmaq qəti surətdə qadağan edilir. Belə hesab edirlər ki, məşhur kimyaçı K.Şeyele aldığı susuz sianid turşusunun dadına baxarkən zəhərlənib.

İkinci mərhələ maddənin mahiyyətinin dərk edilməsidir. Bu zaman onun tərkibi, quruluşu və xassələri arasındakı əlaqələr müəyyən edilir. Bundan ötrü abstraktlaşdırma, assosiativ fikirləşmə və digər məntiqi mühakimələr aparılır. Kimyaçının tədqiqat obyekti maddələrdir. Eyni zamanda o, maddələrlə işləməklə əməyinin məhsulunu, yeni maddələri alır. Maddələrin qarşılıqlı təsiri kimyəvi reaksiya ilə nəticələnir. Məhz bu əlamət kimya istehsalını digər istehsal sahələrindən fərqləndirir. Şagirdlərdə kimyəvi qabiliyyətin olub-olmamasını təyin etmək üçün birinci növbədə onların maddələrə olan marağını müəyyən etmək lazımdır. Onlarda baş verən dəyişikliklərə olan maraqlarını müəyyən etmək lazımdır. Demək olar ki, kiçik yaşlarında bütün uşaqlarda maddələrə maraq olur. Lakin bu maraq onların əksəriyyətində ötəri olur.

Ona görə də kimyanı öyrənənə qədər şagirdlərdə kimyəvi qabiliyyətin elementlərini proqnozlaşdırmaq lazımdır. Bundan ötrü onların riyaziyyat və təbiət elmlərinə maraqlarını və bu sahədəki nailiyyətlərini öyrənmək lazımdır. Təbiət, botanika və fizika dərslərində şagirdlərin müstəqil işləri nəzərdə tutulmuşdur. Həmin məşğələlərdə şagirdlərin “maddəni hiss etmələri” və manipulyasiya etmək qabiliyyətlərini aşkara çıxarmaq olar. Sonra kimyanın öyrənilməsinə başladıqda müşahidələr sistemli xarakter alır. Şagirdlərdə kimyəvi qabiliyyəti proqnozlaşdırarkən obyektiv informasiya almaq üçün aşağıdakılara əməl edilməlidir:

1. Şagirdlər üzərində dərsdə və dərsdənkənar məşğələlərdə sistematik müşahidə aparılmalı;
2. Test yoxlaması aparılmalı;
3. Şagirdin fəaliyyətini analiz etmək.

Kimyəvi qabiliyyəti müəyyən etmək üçün müxtəlif variantlar təklif edilir. Lakin biz belə hesab edirik ki, onları kütləvi məktəblərdə tətbiq etməkdə kimya müəllimləri çətinlik çəkəcəklər. Həmin

metodika professional kimyaçını müəyyən etmək üçün nəzərdə tutulmuşdur. Ona görə də onların əsasında orta məktəb kimya müəllimlərinin hamısının isitifadə edə biləcəkləri testlər hazırlanmışdır. Bunları test adlandırmaq o qədər də doğru olmazdı. Bunlar gənc kimyaçılara təqdim olunan fəaliyyət növlərinin siyahısıdır. Şagird onu oxuduqda müsbət hesab etdiyi sualın qarşısında "+" işarəsi, məqbul hesab etmədiyinin qarşısında "-" işarəsi yazır. Sorğu toplusunu şagirdlərə təqdim etməzdən əvvəl bildirilməlidir ki, cavablarda tam səmimi olun. Sizin hər hansı fəaliyyət növünə marağınızın olmamasının tədris fəaliyyətinizə təsiri yoxdur. Bunlar yalnız sizin kimyəvi qabiliyyətlərinizin səmərəli surətdə inkişaf etdirilməsini təmin etmək məqsədi daşıyır.

I. Sizin xoşunuza gəlirmi?

1. Kimyəvi kəşflərə aid kitabları oxumaq
2. Bitkilərin həyatını öyrənmək
3. Yaşıdlarınızın həyatına aid kitabları oxumaq
4. Evdə rahat iş və istirahət şəraiti yaratmaq
5. Kimyadan ev tapşırıqlarını yerinə yetirmək
6. Doğma diyarı öyrənmək üçün gəzintiyə çıxmaq
7. İnsanların xəstəliklərlə necə mübarizə apardıqlarına aid məlumatları oxumaq
8. İncəsənətə aid əsərləri oxumaq
9. Bağda, bostanda işləmək
10. Riyaziyyat dərnəyində iştirak etmək
11. Xarici dilləri öyrənmək
12. İdmanla məşğul olmaq
13. Riyaziyyat, yaxud fizika olimpiadalarında iştirak etmək
14. Kimya məsələlərini həll etmək
15. Coğrafi kəşflərlə maraqlanmaq
16. Yeni insanlarla tanış olmaq, onlarla ünsiyyət yaratmaq
17. Bədii özfəaliyyətdə iştirak etmək
18. Maddələrin xassələrini dəqiq təyin etmək
19. Ali məktəblər üçün nəzərdə tutulan kitablarla maraqlanmaq
20. Kimyaçı alimlərin həyatı ilə maraqlanmaq
21. Laboratoriya cihazları ilə işləmək
22. Evdəki laboratoriyanda təcrübələr aparmaq
23. Kimyəvi reaksiyalarda molekullar və atomların qarşılıqlı təsirini təsəvvürünüzdə canlandırmaq
24. Başladığınız işi dəqiq və vaxtında sona çatdırmaq
25. Təcrübələri nümayiş etdirməkdə müəllimə kömək etmək
26. Eksperimental məsələ həlli
27. Təcrübənin nəticəsini qrafik surətdə ifadə etmək
28. Aşağı siniflərdə oxuyan yoldaşlarınla məsələ həll etmək
29. Kimya dərnəyində təcrübələr aparmaq
30. Kimyəvi təcrübələrin nəticəsini izah etmək üçün fizikadan və riyaziyyatdan aldığınız biliklərdən istifadə etmək
31. Müsahibinizin hərəkətlərini müşahidə etmək
32. Düzgün nəticə alınmadıqda təcrübələri yenidən təkrar etmək
33. Kimya kabinetində səliqə-səhman yaratmaq
34. Təcrübələrdə nəticənin alınmamasının səbəbini izah etmək
35. Kimyadan hesablama məsələlərini həll etmək
36. Laborant vəzifəsini yerinə yetirmək
37. Zehni əməklə məşğul olmaq
38. Fiziki əməklə məşğul olmaq
39. Sizə müraciət etdikdə kimyəvi hadisənin mahiyyətini izah etmək
40. Gələcək işlərinizi qabaqcadan planlaşdırmaq.

Göründüyü kimi, sorğu kifayət qədər maraqlıdır və müasir insanı səciyyələndirən əlamətləri, əsasən, əhatə edir.

Kimyəvi qabiliyyətin elementləri olan şagirdlərdə məsələ həllində və digər müstəqil işlərdə faktların sürətlə analizi,

qeyri-standart cavablar və prosesin həllinə aparan “açarın” tapılması istəyi daha çox müşahidə edilir.

Eksperimental məsələlərin həllində təcrübələrin gedişini, onların səmərəli yollarını qabaqcadan müəyyən etməyə və buraxılan səhvlərin analizinə meyil kimyəvi qabiliyyətin hər üç komponenti olanlarda üstündür.

**Nəticə**

Tədris prosesində şagirdlərin kimyəvi qabiliyyətlərinin inkişaf etdirilməsinin əsas prinsipləri aşağıdakılardır:

1. Şagirdlərin tədris fəaliyyətləri üzərində sistemli müşahidələr aparılmalıdır.
2. Kimyəvi qabiliyyətin əsas komponentlərinin inkişaf etdirilməsi üçün nəzəri və praktik biliklərin qarşılıqlı əlaqəsi təmin edilməlidir.
3. Şagirdlərdə kimyəvi eksperiment aparmaq vərdişlərinin formalaşması daim diqqət mərkəzində saxlanmalı və bu proses sinifdənkənar məşğələlərdə inkişaf etdirilməlidir.
4. Şagirdlər yerinə yetirdikləri təcrübələrin nəzəri hissəsini aydın dərk etməli və təhlükəsizlik texnikası qaydalarına ciddi surətdə əməl edilməlidir.
5. Kimyəvi qabiliyyətin inkişaf etdirilməsinin əsas şərti şagirdin kimyəvi prosesin mahiyyətini atomlar və molekullar səviyyəsində dərk etməsi və “maddələri hiss etməsidir”.
6. Kimyəvi qabiliyyəti inkişaf etdirmək üçün müstəqil işlərin bütün formalarından yaradıcılıqla istifadə edilməli, şagirdləri kiçik qruplarda problemli-eksperimental məsələlərin həllinə cəlb etməklə maddəni və prosesi dərk etmək bacarığını formalaşdırmaq diqqət mərkəzində saxlanmalıdır.

***Rəyçi: prof. Ə.Hüseynov***

## İstifadə edilmiş ədəbiyyat


1. Плотонов К. Проблемы способностей. М.: Наука, 1972.
2. Масечко Е., Мациевский А. Обобщение и систематизация знаний о законах сохранения масса и энергии на основе межпредметных связей кружка // Химия в школе, 1992, №1-2.
3. Эпштейн Д. Формирование химических способностей у учащихся // Вопросы психологии, 1963, №6.
4. Лисичкин Г., Коробейникова Л. Проблемы химических способностей. Химические способности и возможность их ранней диагностики / Методические проблемы химических олимпиад. М. 1979.
5. Зуева М. Обучение учащихся применению знаний по химии. М.: Просвещение, 1987.


**Т.Махмудов**

**Основные компоненты способности и их развитие в учебном процессе**

**Резюме**

В статье анализируется основные компоненты способностей, показываются пути их развития в учебном процессе.

**T.Mahmudov**

**Key components of intelligences and their improvement in the educational process**

**Summary**

In the article, key components of intelligences and methods of their improvement in the educational process are analyzed.



# MAARİFÇİLİKDƏN BAŞLANMIŞ ÖMÜR YOLU

**Alxan Bayramoğlu,**
***Bakı Dövlət Universitetinin professoru, filologiya üzrə elmlər doktoru***

Görkəmli şair və publisist, Azərbaycan romantizminin banisi Məhəmməd Hadinin həyat yolu acılı və ictimai-mədəni mübarizələrlə dolu keçmişdir. Məqalədə bütün bunlar həm də yeni üzə çıxarılan fakt və materiallarla elmi-nəzəri şəkildə işıqlandırılmışdır.

***Açar sözlər:*** *maarif, tərəqqi, ümumi icbari təhsil, övladi-vətən, qabaqcıl pedaqogika, romantizm.*

***Ключевые слова:*** *просвещение, прогресс, общее обьязятельное образование, сыновя родины, передовая педагогика, романтизм.*

***Key words:*** *enlightenment, progress, general compulsory education, good citizen, innovative pedagogy, romanticism.*

Azərbaycan ədəbi-ictimai fikri tarixində xüsusi xidmətləri olan filosof şair M.Hadi özünün məktəbə, elmə, təhsilə olan həvəsi və xidməti ilə XX əsr mədəniyyətimizin görkəmli simaları səviyyəsinə yüksəlmişdir. Uşaqlıqdan oxumağa, təhsil almağa maraq göstərən istedadlı, sərbəst təbiətli gənc ilk ibtidai təhsilini məhəllə məktəbində şamaxılı Molla Səmədin yanında aldıqdan sonra şair Abbas Səhhətin atası Molla Əliabbasın məktəbində oxumuşdur. O, uşaqlıqdan ərəbcə, farsca oxumağa meyil etmiş, ailə vəziyyəti ilə əlaqədar sonralar qohumu Mustafa Lütfinin himayəsində yaşayanda ondan ərəb dilini öyrənmişdir.

Gənc Hadi böyük şəhərlərdə "üsuli-cədid" məktəblərində təhsil almaq, yeni elmləri öyrənmək istəyi ilə yaşayırdı. Lakin bunlar ona qismət olmadı. Şair bu arzularını belə xatırlayır:

Oxumaqçın nə qədər dadu-fəqan etdimsə,
Olmadı zərrə əsərbəxş şu istimdadım.
Dağa dersən eşidir, sonra verir əksi-səda,
Daşa dönmüşlərə əks eyləmədi fəryadım.

İzzəti-nəfsini sevən, minnət götürməyən gənc Hadi bu böyük arzularına çata bilmədisə də, yenə də məktəbə, maarifə bağlandı, elm-ürfan sahibi oldu. O, məktəbin, maarifin təbliği məqsədi ilə mətbuatda çıxışlar edirdi. 1905-ci il "Həyat" qəzetinin 109-cu nömrəsində onun "Lövhi-məkatib" adlı şeiri çap olunur. Şair bu şeirində məktəbə sadiqliyini bir daha nümayiş etdirir və şeirin bütün ilk misralarını həsrətində yaşadığı "məkatib" sözü ilə başlayır və bu sözə öz ürəyinin səsi ilə tərif və sifət verir:

Məkatib cilvəgahi-tələəti-fəyyazi-qüdrətdir,
Məkatib pərtövü-ənvari-şəmsi-sübhi-vəhdətdir",- deyirdi.

Xalqını maarifə səsləyən bu şeirin sonunda "Həyat" qəzeti redaksiya adından yazırdı: "Görünür ki, məkatib haqqında sözü tamam edib istəmirsiniz ki, sizdən sonra da qəzetimizdə söz yazan olsun. Lakin səhviniz var. Bu xüsusda nə qədər yazılsa, yenə də azdır".

Hadi bu şeiri ilə redaksiyaya təzə ruh, təzə nəfəs, maarif havası gətirmişdi.

Böyük şairin ən ülvi arzusu - xalqın səadəti, onun tərəqqisi olmuşdur. Hadi varlı-

ğının müsbət və işıqlı tərəflərindən biri kimi elmi, maarifi düşünürdü. O, maarifi tərəqqinin əsas təkanverici qüvvəsi sayırdı. “Həyat” qəzetindəki ilk məqalələrinin birinin adını da “Elmi-əbdana həqiqi bir nəzər” qoymuşdu. Onun pedaqogika və sosiologiyaya aid də dolğun məzmunlu məqalələri vardır.

Mütəfəkkir şair xalqını bəşəriyyətin əsrlər boyu yaratdığı elmi nailiyyətlərə biganə qalmamağa, ondan faydalanmağa çağırırdı. O bizim bunlardan bixəbər və binəsib qalmamağımızı istəyirdi.

Yaradıcılığının başlanğıc dövrünü əhatə edən 1905-1907-ci illərdə ritorik bir dillə məktəbi, maarifi təriflәyirdi. O, dünyəvi-təbiət elmlərinin öyrənilməsinin vacibliyinə dair fikirlərini tutarlı faktlarla əsaslandırmışdı. “Hadi eyni zamanda ümumi və icbari təhsil məsələlərini irəli sürür, hər iki cinsin oxumasını lazım bilirdi. Əlillər, korlar, lallar, yurdsuz adamlar üçün xüsusi pansionlar açılmasını arzulayırdı. Şair bir az da irəli gedərək belə hesab edirdi ki, məktəb dindən ayrılmalı, təlim-tərbiyə işləri yenilənməli, qabaqcıl pedaqogikaya yiyələnmiş çoxlu müəllim kadrları hazırlanmalıdır” (Əziz Mirəhmədov).

Onun “Həyat” qəzetində (11 yanvar 1906, № 9) çap etdirdiyi “Məktəb” şeirində belə sərlövhə qoyulmuşdur: “Məktəb nə demək” Məktəbi-əxlaqü ədəbdir”.

Orada deyilirdi:

Məktəb nə demək? Hadiyi-şahrayi-hidayət,

Məktəb nə demək? Cahidi-meydani-dəyanət,

Məktəb nə demək? Harisi-eyvani-şəriət,

Məktəbdir açan ümmətə bib babi şəfaət

Övladi-vətən etmək üçün bizdə təali

Məktəblər açıb kəsb edəlim elmü kəmali!

Maarifpərvər şair “Məktəb şərqisi” şeirində də məktəbə məhəbbətini dindirir, onu “Şəmi-şəbistani-cəhalət”, “Gülşəni-ürfa, kəmalət”, “Rəhbəri-övladi-vətən”, “Ruhi dilə feyzrəcan” adlandırır. “İnsana şərəfbəxş fəqət elmü-hünərdir, Darül ədəbin bilməliyiz qədrini, millət”, - deyirdi.

M.Hadinin “Lövhi məkatib”, “Məktəb şərqisi”, “Lövheyi-təsviri maarif”, “Maarif dari”, “Sevimli şagirdlərimizə ərzihal” adlı şeirləri məktəb və maarif mövzusunda yazılmışdır.

Hadi mətbuatdakı şeirləri ilə oxucuların hörmətini qazanmaqda idi. Onu yaxından tanıyan Mustafa Lütfi Həştərxanda “Bürhani-tərəqqi” qəzetini nəşr edirdi və onun Hadi kimi qüdrətli qələm sahibinə böyük ehtiyacı var idi. Onun çağırışına görə Hadi tamamilə müəllimlikdən əl çəkir.

“Hadi 1907-ci ildə Həştərxanda olanda da ədəbi-publisistik və maarifçi fəaliyyətini davam etdirmişdir”, - bu sözlər Azərbaycan ədəbi-ictimai fikri tarixində xüsusi xidmətləri və yeri olan, “Məhəmməd Hadi”, “Məhəmməd Hadi Şirvani” və “Əbdülsəlimzadə Məhəmməd Hadi” təxəllüsləri (imzaları) ilə tanınan, milli romantizmin banisi, şair, publisist və tərcüməçi Ağa Məhəmməd Hacı Əbdülsəlim oğlu Hadi haqqında deyilmişdir. 1879-cu ildə Şamaxıda dünyaya göz açmışdır. O, anadan olduğu və məktəb yaşına çatdığı dövrdə əvvəllər tarixi-inzibati və mədəni mərkəz olan Şamaxı öz növrağını itirməkdə idi. Çünki dalbadal baş verən təbii fəlakətlərin ən dəhşətlilərindən olan 1859-cu il zəlzələsi ilə bağlı mütəxəssis rəyləri hökuməti qəti olaraq quberniya mərkəzini Şamaxıdan

köçürmək qərarına gətirmişdi (3). Bütün bu sosial-tarixi, ictimai-mədəni hadisələrin nəticəsi olaraq Xaqani və Fələkinin yurdundan şeir bülbüllərinin səsi kəsilmiş, "Beytüs-Səfa" adlı ədəbi məclis dağılmış, məşhur maarifpərvər və satirik şair Seyid Əzim Şirvani, habelə onun müasirləri Bahar və Bixud vəfat etmişdilər. Vaxtilə Şərqdə məşhur olan Şirvanşahların paytaxtı Şamaxı XIX əsrin 70-80-ci illərində ikinci dərəcəli şəhərlər sırasına keçməyə başlamışdı. Şəhərin əhalisinin xeyli hissəsi iş və dolanışıq dalınca Azərbaycanın digər şəhərlərinə və qəza mərkəzlərinə, habelə Orta Asiyanın müxtəlif yerlərinə köçüb getməli olurdular. Bununla yanaşı, ölkədə getdikcə üsuli-cədid məktəblərinin açılması və yeni düşüncə tərzinə malik ziyalılar nəslinin formalaşmağa başlaması Şamaxıya da təsirsiz qalmırdı. Söz yox, bütün bunlar gələcək şairin təhsil və tərbiyəsində, onun fikri-bədii inkişafında müəyyən rol oynamaya bilməzdi.

Məhəmməd Hadinin atası Hacı Əbdülsəlim köklü bir nəsildən idi. Ulu babalarından Tahir Əfəndi Şirvanın məşhur üləmalarından olmuşdur.

Atasının vəfatı ilə on yaşlı Məhəmmədin həyatının faciələr dövrü başlayır. Onun anası M.Hadi ilə bacıları Sahibə və Əsmanı ataraq Şamaxı yaxınlığındakı Sulut kəndində yaşayan varlı bir kişiyə ərə gedir. Uşaqların üçü də ata nənələri Teyyibə xanımın himayəsi altında qalır. Teyyibə xanım nəvəsi Məhəmmədi ruhani görmək istəyirdi. Ona görə nəvəsinin təhsil almasına xüsusi diqqət yetirirdi. M.Hadinin əmisi, Şamaxının nüfuzlu tacirlərindən olan Hacı Abbasqulu da qardaşının yadigarından öz qayğısını əsirgəmirdi.

Əmisinin ailəsi ilə yaxınlıq nəticəsində Məhəmmədlə qəşəng, ağıllı əmiqızı Əminə arasında get-gedə məhəbbətə çevrilən səmimiyyət yaranır. Onlar ömürlərini bir yerdə keçirəcəklərinə əhd-peyman bağlayırlar. Lakin atasının vəfatından iki il sonra əmisi də dünyasını dəyişir. Özünün dediyi kimi, Hadi "Əmisinin ölümündən sonra əsl yetim olur" (11).

Bir neçə il sonra Teyyibə xanım ağır güzərana dözməyib vəfat edir. Uşaqlar büsbütün başsız, himayəsiz qalırlar. Onlara uzaq və yaxın qohumları pərəstar çıxır; bacılarının hərəsi bir qohumun evində daldalanır. Məhəmmədi isə bir müddət bibisinin qaynı, dövrünün tanınmış ziyalılarından olan Mustafa Lütfi İsmayılzadə saxlayır. M.Hadi sonralar Mustafa Lütfi əfəndini özünün "maddi və mənəvi səbəbi həyatı və nicatı" adlandırmışdı (9).

Zahirən sakit təbiətli və mütaliəyə meyilli olan Məhəmməd haqsızlıqla heç cürə barışa bilməyən və üsyankar ruhlu bir gənc kimi tez-tez mədrəsə müəllimlərinin qınağına səbəb olurdu (8). Əmisi Hacı Abbasqulunun vəfatından sonra Məhəmmədə münasibət əmisi evində də tamam dəyişmişdi. Çox keçmir ki, əmisi arvadı qızı Əminəni Məhəmməddən ayırıb Əhməd adlı varlı bir tacirə ərə verir. Şair təbiətli, həssas və vurğun gənc bu hadisədən büsbütün sarsılır (11). Bu dərd – ilk məhəbbətinin uğursuzluğu Məhəmməd Hadiyə hətta bütün əvvəlki fəlakətlərini də unutdurur. O, lalə kimi sinədağlı qalır və ömrü boyu evlənmir.

1900-cü ildə Mustafa Lütfi İsmayılzadə Həştərxana köçdükdən sonra M.Hadi bibisi Zeynəb xanımın himayə və nəzarəti altında ata mülkündə tək yaşayıb, təhsilini çətinliklə davam etdirir. Bu dövrdə o, vaxtının çoxunu Carullah adlı bir nəfərin

Şamaxıda açdığı qiraətxanada və şəhər kənarında yerləşən “Qələ bayırı” adlı səfalı bir məkanda mütaliə və seyrə dalmaqla keçirir, ilk qələm təcrübələrini yazır.

1902-ci il 31 yanvarda Şamaxıda baş verən növbəti dağıdıcı zələzələ bir çox həmyerliləri kimi, Məhəmməd Hadini də vətənindən didərgin salır. O, Kürdəmirdə məskunlaşaraq məktəbdarlıqla məşğul olur. 1905-ci ildə Bakıda çıxan “Həyat” qəzetində ilk mətbu əsərləri – məqalə və şeirləri işıq üzü görür.

Mustafa Lütfi Hacı Sədrəddin oğlu İsmayılzadə Həştərxana köçdükdən sonra orada “Şurayi-ümmət” adlı xeyriyyə cəmiyyəti təşkil etmiş, “Darül-ədəbi” adlı məktəb açmış və 1905-ci ildən isə “Bürhani-tərəqqi” adlı qəzet nəşr etməyə başlamışdı. 1906-cı ilin aprelində Mustafa Lütfi Əfəndi M.Hadiyə məktub yazaraq onu Həştərxana işləməyə dəvət edir. Hadi bu dəvəti qəbul edib həmin ilin may ayında Həştərxana köçür. Burada “Darül-ədəb”də dərs deməklə yanaşı “Bürhani-tərəqqi”də maarif və tərəqqi mövzusunda yazılar çap etdirir. Eyni zamanda “Həyat” qəzeti ilə müntəzəm əlaqə saxlayıb, əməkdaşlıq edir.

Mustafa Lütfi bir münasibətilə Şamaxıya getməli olanda öz yerinə Hadini “Bürhani-tərəqqi” qəzetinin müvəqqəti redaktoru təyin etdirir. Şairin bu vəzifədə işləməsi onu mətbuat və ədəbiyyat aləmində müstəqil işə öyrətdiyi kimi, jurnalistika sahəsində gələcək qızğın fəaliyyəti üçün də yaxşı bir məktəb olur. Təəssüf ki, “Bürhani-tərəqqi”nin komplektləri hələlik əlimizdə tam olmadığı üçün M.Hadinin bu qəzetdəki işi və yazıları haqda müfəssəl məlumat verə bilmirik.

Bakıda “Həyat” qəzetində çap etdiyi yazılardan aydın olur ki, Həştərxan mühiti, orada köhnəpərəstlərin Mustafa Lütfi Əfəndiyə bəslədiyi qərəzli münasibət Hadinin xoşuna gəlməmişdir. O, din xadimlərinə daima mənfi münasibət bəsləmişdir. Həmin yazılardan, həmçinin o da məlum olur ki, 1905-1906-cı illərdə M.Hadi N.Gəncəvi, məşhur alim və yazıçı Mirzə Məlkum xan, Sənani, Cəlaləddin Rumi, Sədi, Beyzavi, Hafiz, Namiq Kamal, Əbdülhəq Hamid, İbrahim Şinasi, Seyid Əzim Şirvani, Bixud və digər görkəmli ədəbi şəxsiyyətlərin irslərini kifayət qədər oxuyub öyrənmişdir.

1907-ci ildə Əli bəy Hüseynzadənin dəvəti ilə Bakıya, “Füyuzat”da işləməyə gəlir. S.H.Kazımoğlunun yazdığına görə, M.Hadiyə göndərdiyi məktubda Ə.Hüseynzadə ona əmək haqqı olaraq “...yetmiş beş rüblə məaş təyin edildiyini də bildirmişdi”. Seyid Hüseyn sözünə belə davam edirdi: “Əli bəy Hüseynzadə kibi bir zatın təht idarəsində çalışmayı Hacıtərxana tərcih verdiyindən Məhəmməd Hadi 1907-ci ildə Bakıya gəlmişdir. “Füyuzat”da, eyni zamanda “Tazə həyat” qəzetəsində çalışmaya başlamışdır.

“Füyuzat” və “Tazə həyat” qəzetəsi qapandıqdan sonra “İttifaq” və “Səda” qəzetələrində çalışmışdır” (7). O, Bakı mətbuat orqanlarından “Yoldaş”, “Təkamül” və s. qəzetlərdə də məqalə, şeir və bədii tərcümələrlə fəal iştirak etmişdir.

M.Hadi daim azadlıq, hürriyyət aşiqi olmuşdur. Türk müsəlman dünyasının hansı bir guşəsində işartı görürdüsə, onu alqışlayır, həmin işığın azadlıq günəşinə çevrilməsini ürəkdən arzulayır və bu işə kömək etməyə can atırdı. Osmanlıda baş verən gənc türklər hərəkatı da bu cür alqışlanır. Nəhayət, 1910-

cu ildə həmin hərəkatın birbaşa iştirakçısı olmaq üçün M.Hadi İstanbula yola düşmüşdü.

Şairin bu səfərini Mehdi İsmayılov (Gəncəli) 1910-cu ilin ilk baharı (5) kimi göstərir. Əslində isə M.Hadi İstanbula 1910-cu il fevral ayının ortalarında getmişdir. Belə ki, 1910-cu ilin yanvar ayında Bakıya işləməyə gələn M.Ə.Sabirin “Səda” qəzetində işə girməsinə şərait yaratdı. “.... əlverişli məqamlardan biri redaksiyada işləyən M.Hadinin Türkiyəyə səfərə hazırlaşması idi. Çünki Hadinin getməsi Sabirin “Səda” redaksiyasında işə götürülməsi üçün şərait yaratmaqla yanaşı, öz növbəsində redaksiya Hadinin getməsi ilə qarşılaşdığı müəllif itkisinin yerini doldururdu”. Bu fikri söyləmək üçün əldə olan əsaslardan “... biri odur ki, M.Hadinin “Səda”da 1910-cu ildə axırıncı çap olunan şeiri qəzetin 3 fevral tarixli 30-cu, Sabirin həmin qəzetdə çıxan ilk şeiri isə 7 fevral tarixli 31-ci nömrəsində işıq üzü görüb. Hər iki müəllifin əsərlərinin dalbadal nömrələrdə çap olunması onların redaksiyada bir-birlərini əvəz etmələrini göstərir” (1).

M.Hadinin Türkiyəyə 1910-cu il fevral ayının ilk günlərində yola düşməsi fikrini söyləməyə əsas verən faktlardan biri də odur ki, “Səda” redaksiyasında Hadi Türkiyəyə yola düşməzdən qabaq üç dost və həmyerli – M.Ə.Sabir, M.Hadi və Ə.T.Əfəndizadə xatirə üçün şəkil çəkdirdilər. Həmin şəkil üç vətənpərvər həmyerlinin həm də məslək birliyinin ifadəsi kimi tarixi bir sənədə çevrildi (1).

Bu məsələdən danışarkən Seyid Hüseyn yazmışdır:

“Məhəmməd Hadi 2-3 sənə Bakıda işlədikdən sonra 1909-cu sənənin nəhayətində (sonunda--A.B.) və ya 1910-cu sənənin ibtidalarında (əvvəllərində-A.B.) çoxdan bəri arzusunda olduğu İstanbula getmiş, “Tənin” qəzetəsində əlsineyi-şərqiyyə mütərcimi sifətiylə çalışmışdır” (7).

M.Hadi İstanbulda “Tənin” qəzetində Şərq dilləri üzrə tərcüməçi işləmiş, eyni zamanda “Sabah”, “Təhab”, “Şəhbal”, “Mehtab” qəzetləri ilə əməkdaşlıq etmişdir.

Əslən Gəncədən olub, İstanbulda yaşayıb işləyən Hadişünas alim Mehdi İsmayılovun araşdırmalarına görə Türkiyə mətbuatında M.Hadinin 41 əsəri çap edilmişdir. Onlardan 15-i şeir, 26-sı məqalədir. Məqalələrdən səkkizində Hadinin özü tərəfindən yazılan və məqalənin əsas ideya xəttini ifadə edən şeir parçaları vardır.

M.Hadinin Türkiyədə çap edilən şeirlərindən 11-i “Mehtab”, 3-ü “Rübab”, 1-i “Şəhbal”, 6-sı “Tənin”, 2-si isə “Tənin”in davamı kimi çıxan “Senin” qəzetində işıq üzü görmüşdür.

Türkiyə mətbuatında M.Hadi “Mehemmed Hadi”, “Şirvanlı Mehemmed Hadi”, “Kafkasiyalı Mehemmed Hadiyi-Şirvani”, “Ebdülselimzade Mehemmed Hadi” imzalarından istifadə etmişdir (5).

Şairin odlu-alovlu çıxışları (yazıları) yerli hökuməti – ittihadçıları razı salmadığına görə o, həbs edilərək Salanikə sürgün edilir. Oradan bir təsadüflə yunan gəmisi ilə Yunanıstana gedib çıxır. Yunanıstanda isə türk casusu bilib ona ölüm hökmü kəssələr də, nədənsə qərarı dəyişib ölkədən (Yunanıstandan) çıxarmaq üçün İstanbula gedən gəmiyə mindirirlər. Yolda başına olmazın müsibətlər gələn, hətta ölüm təhlükəsi ilə üzbəüz qalan M.Hadini İstanbulda da qəbul etməyib elə limandaca Batuma gedən gəmiyə mindirirlər. O, Batumdan bir tanışı-

nın köməyi ilə Bakıya gələ bilir (7; 10; 11; 4).

1914-cü ildə yenidən Bakıya gələrkən M.Hadi tamamilə pərişan və əsəbləri pozulmuş halda idi. O, dostlarının köməyi ilə ruhi xəstəxanada müalicə olunduqdan sonra yenidən şüurlu fəaliyyətə başlayır.

Birinci Dünya müharibəsi zamanı Osmanlının Azərbaycanla sərhəd bölgəsi yaxınlığından İrəvan quberniyasına pənah gətirən müharibə hərbzədələrinə layiqincə yardım göstərə bilməyən İrəvan Xeyriyyə Cəmiyyəti kömək üçün Bakı Xeyriyyə Cəmiyyətinə müraciət etmişdi. Bakı Xeyriyyə Cəmiyyəti isə mövcud vəziyyəti öyrənmək üçün İrəvana bir komissiya göndərmişdi. Məhəmməd Hadi "Açıq söz" qəzetinin xüsusi müxbiri kimi həmin komissiya ilə birgə 1915- ci il noyabrın 1-də İrəvana getmiş və həmin il dekabr ayının sonlarınadək İrəvan quberniyasında olan türk qaçqınlarının vəziyyəti, onlara göstərilən humanitar yardımlara dair qələmə aldığı müxbir yazılarını "Açıq söz" qəzetində çap etdirmişdir.

1915-ci il dekabr ayının sonlarında Bakı sərvətdarlarının təşkil etdikləri müsəlman diviziyasının tərkibində molla kimi cəbhəyə yola düşən M.Hadi Karpat dağlarında, Stanislav şəhərində Polşa və Avropanın digər bölgələrində olur. Həmin dövrdə Bakıda çıxan mətbuat orqanlarında M.Hadinin müharibə təəssüratlarını əks etdirən şeirləri çap olunmuşdur. Müharibə qurtarandan sonra Hadi qoşunla birgə Bakıya qayıdır (6).

Azərbaycan Xalq Cümhuriyyəti qurulanda M.Hadi Gəncəyə gəlir və orada Milli Ordunun yaradılmasında əsgərlər üçün qələmə aldığı marş ruhlu şeirləri ilə iştirak edir. Cümhuriyyət hökuməti və "Azərbaycan" qəzeti redaksiyası Bakıya köçərkən M.Hadi də Bakıya gəlir və Azərbaycan Xalq Cümhuriyyətinin möhkəmlənməsinə yönəlmiş əsərlərlə çıxış edir...

1920-ci il aprel çevrilişindən sonra Gəncəyə gedən Məhəmməd Hadi bəzi rəvayətlərə görə, sovetlərə qarşı olan Gəncə üsyanında iştirak etmiş, sonra xəstələnərək dünyasını dəyişmişdir. Məzarı Gəncə şəhərindədir.

M.Hadi A.Səhhətin vəfatına həsr etdiyi "Abbas Səhhətin üfuli əbədisi" məqaləsində yazırdı: "Zata Şeyx Nizamiyə böyük bir hörməti var idi... Ən nəhayət, Pənc Gənc şairi möhtərəmilə həmcivari-məzar oldu". Bu sözlər tamamilə onun (Hadinin) özünə də aiddir.

Gəncədə Məhəmməd Hadinin abidəsi ucaldılmış, Bakıda və respublikamızın digər şəhərlərində onun adı küçələrə, kitabxana və mədəniyyət mərkəzlərinə verilmiş, əsərlərinin nəşri və tədqiqi sahəsində də xeyli işlər görülmüşdür. Əziz Mirəhmədov, Midhət Ağamirov, Vəli Osmanlı, İslam Qəribli, Rəfiq Zəka, Mehdi İsmayılov (Gəncəli) ona monoqrafiyalar həsr etmiş, Mir Cəlal, Məmməd Cəfər, Kamran Əliyev və b. isə haqqında elmi məqalələr çap etdirmişlər.

Hadi bütün gəncliyini insanı kamil, məğrur və xoşbəxt olmağa çağırırdı. O arzu edirdi ki, bu elmi-ürfan qarşısında vird olunan bir dua kimi onların dodaqlarından düşməsin:

Maarifsiz cahanda qabil olmaz bəxtiyar olmaq!..

Maarif bir səadətdir edər məsud insanı.

Kəmali-şevqilə talib olaq kəsbi-kəmalata,

Beşikdən qəbrə tək təhsil edək adabü ürfafı!..

***Rəyçi*: *prof. Z. Əsgərli***

## İstifadə edilmiş ədəbiyyat

1. Bayramoğlu A. Sabir Bakıda. Bakı: Təhsil, 2012.

2. Bayramoğlu A. Məhəmməd Hadi İrəvanda və .. "Azərbaycan" qəzeti, 13 noyabr, 2011.

3. Bayramoğlu A. Quberniya mərkəzinin Şamaxıdan Bakıya köçürülməsinə dair. "Azərbaycan" qəzeti, 20 noyabr, 1996.

4. İsmayılov (Gəncəli) M. Azerbaycanlı şair Mehemmed Hadi. Hayatı, sanatı, eserleri. İstanbul. Ötüken nəşriyyatı, 2011.

5. İsmayılov M. Azerbaycanlı şair Mehemmed Hadinin Türk basınında çıkan yazı ve şeirleri (1910-1913). Metin-İnceleme (Əlyazma). İstanbul, 2002.

6. İlkin Qılman. Məhəmməd Hadi "Dikaya dviziyada". "Respublika" qəzeti, 4 dekabr, 1997.

7. Kazımoğlu (Seyid Hüseyn). Əbdülsəlimzadə Məhəmməd Hadi. Maarif və mədəniyyət, 1923, № 3.

8. Məhəmmədül Hadi Əlhac Əbdülsəlimzadə Şirvani. Tələbəlik xatiratından. "Həyat" qəzeti, 23, 26, 28 aprel, 1906.

9. Mirəhmədov Ə. Məhəmməd Hadi. Bakı: Yazıçı, 1985.

10. Rufik Selim. Türkiyə mətbuatında Mehmet Hadinin şeirləri. "Azərbaycan Yurd Bilgisi" dərgisi. Avqust, 1932, №1.

11. Şaiq Abdulla. Məhəmməd Hadinin faciəsi. Əsərləri. IV c. Bakı, 1977.

**А.Байрамоглы**

**Жизненный путь, начинающийся с просвещенства**

**Резюме**

Основоположник азербайджанского романтизма, поэт и публицист Мухаммеда Хади прожил жизнь полную трудностей и социально-культурных перипетий. В настоящей статье отмеченные проблемы освещены на основе новых обнаруженных фактов и материалов.

**A.Bayramoglu**

**A lifetime dedicated to enlightenment**

**Summary**

Muhammed Hadi, prominent poet and publicist, founder of Azerbaijani romanticism lived his life with full of pain and social-cultural struggles. Also all of these have been reflected in the article in scientific-theoretical form with the analyses of facts and materials which is uncovered new.



# HÜSEYN CAVİDİN PEDAQOJİ GÖRÜŞLƏRİ

**İsgəndər Orucəliyev,**
***ADPU-nun dosenti, filologiya üzrə fəlsəfə doktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *Hüseyn Cavid, pedaqoji görüşlər, məktəb, təhsil, maarif, Avropa, Türkiyə, Azərbaycan, Kant, Con Lokk, Spenser.*

***Ключевые слова:*** *Гусеин Джавид, педагогические взгляды, школа, образования, происвешение, Европа, Турция, Азербайджан, Кант, Джон Локк, Спенсер.*

***Key words:*** *Husein Javid, educational meeting, school, education, enlightenment, Europe, Turkey, Azerbaijan, Kant, John Locke, Spencer.*

Hüseyn Cavid Azərbaycan ədəbiyyatı tarixində görkəmli şair, dramaturq, şair-filosof, publisist, müəllim kimi tanınmış və məşhurlaşmışdır. O, pedaqoji aspektdə silsilə məqalələr yazmış, onları 1910 və 1912-ci illərdə “Həqiqət” qəzetində çap etdirmişdir. Məqalələr 30 kitab səhifəsi həcmindədir. Böyük şair, dramaturq və müəllim Cavid həmin məqalələrdə XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanda məktəb, təhsil, maarif və müəllim kadrları məsələlərini qaldırmış, Məhəmməd Tağı Sidqinin (Naxçıvan) məktəbindəki, Molla Hüseyn Pişnamazzadənin Mədrəsəsindəki (Gəncə) təhsilin səviyyəsini yüksək dəyərləndirmişdir. Azərbaycanda məktəb və təhsilin inkişafı, ibtidai və ali məktəblər üçün yeni düşüncəli və savadlı müəllim kadrları hazırlanmasının konkret yolları və üsullarını göstərmişdir. Özü 1910-cu ildən 1937-ci ilədək Naxçıvan, Tiflis, Gəncə və Bakıda müxtəlif tipli və profilli təhsil ocaqlarında müəllimlik etmişdir. 1921-ci ildə Bakıda təşkil olunmuş Darülmüəllimin (indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin) ilk müəllimlərindən biri olmuşdur. Sonralar Bakı Dövlət Universitetində məsləhətçi və Teatr Texnikumunda müəllim kimi çalışmışdır.

1905-1909-cu illərdə İstanbul Darülfünununda təhsil alarkən Hüseyn Cavid bir neçə elm sahəsinə xüsusi maraq göstərir: Sənət və ədəbiyyat nəzəriyyəsinə; Yaxın və Orta Şərq xalqlarının ədəbiyyatına; tarix və fəlsəfəyə; pedaqogika və psixologiyaya; məktəb, maarif və təhsil problemlərinə. O, həmin sahələrdə mövcud olan elmi, metodiki və pedaqoji ədəbiyyatla, ədəbiyyat və fəlsəfə tarixi ilə, sənətin spesifik xüsusiyyətləri və nəzəriyyəsi ilə ətraflı və dərindən tanış olur. Vətənə qayıtdıqdan sonra öyrəndiklərini və bildiklərini bədii əsərlərində və dövri mətbuatda çap etdirdiyi publisistik məqalələrində verir. “Həsbi-hal” silsilə məqalələrində Avropa, Türkiyə və Azərbaycanda təhsilin vəziyyəti haqqında geniş söz açır. Həmin məqalələr bizim XX əsr pedaqoji fikir tariximizdə əhəmiyyətli yer tutur.

Cavid İstanbulda təhsilin təşkili və texnologiyası, maarif işinin necə qurulması və həyata keçirilməsini ayrıca öyrənir. İstanbula gedərkən gəmi yolüstü Samsunda lövbər salır. Fürsətdən istifadə edən şair, şəhəri səyahət edir, rüşdiyyə məktəbinə gedib, burada uşaqların gimnastik məşq-

lərinə baxır. İstanbulda yaşarkən şəhərin bəzi görməli yerləri ilə, o cümlədən muzeyləri, məscidləri, kitabxanaları və teatrları ilə tanış olur; maarif işlərinin təşkili ilə maraqlanır və ətraflı məlumat alır. Məktublarından birində yazır: "İstanbulda çox böyük qiraətxana və kütübxanalar var, amma layiqincə kitabları və qəzetləri yoxdur... Türkiyədə maarif işi çox iləridir. Bircə İstanbulda otuz dörd dövləti və xüsusi gimnaziya vardır". Bu, şairin Türkiyədə maarif işinin təşkili və vəziyyəti ilə nə dərəcədə yaxından tanış olmasına dəlalət edir.

O, təhsil illərində görkəmli Avropa nəzəriyyəçiləri və filosoflarından İmmanuel Kantın, Con Lokkun, Herbert Spenserin, Benedikt Spinozanın, Türkiyə pedaqoqu Ayişə Sədiqənin pedaqogika və təlim-tərbiyəyə aid əsərlərini mütaliə edir. Onların təhsil, təlim və tərbiyə haqqında nəzəri fikir və konsepsiyaları ilə tanış olur. Vətənə döndükdən sonra mətbuat vasitəsi ilə onların məktəb, maarif, ibtidai təhsil, təlim və tərbiyə barəsində fikir və mülahizələri ilə Azərbaycan müəllimlərini və maarif işçilərini tanış edir. Şairin bu mövzuda yazdığı silsilə məqalələri nəinki Naxçıvanda, bütövlükdə çar Rusiyası dövründə Qafqazda və Azərbaycanda maarif, ibtidai təhsil, təlim və tərbiyə işlərinin təşkili və vəziyyətini öyrənmək baxımından əhəmiyyətlidir.

Mən XX əsrin əvvəllərində (1900-1920) Azərbaycanda maarif və mədəniyyətin səviyyəsini öyrənmək baxımından Cavidin məqalələrini yüksək qiymətləndirirəm və məqalələrdəki fikir və mülahizələrin ictimai və pedaqoji əhəmiyyətini xüsusi qeyd etmək istəyirəm. Şair qaldırdığı problemlərə "Naxçıvana nə lazım?" [3], "Naxçıvanda nə gördüm?" [4] və "Həsbi-hal" [5] silsilə məqalələrində, Abdulla Tofiqə (Abdulla Sura) aid nekroloqunda [6], Qurbanəli Şərifova yazdığı məktublarda geniş yer vermişdir:

"Bir millətin tərəqqi və tədənnisini bilmək için o millətin məktəblərini, daha doğrusu, ibtidai məktəblərini görmək kifayət edər. Avropaya meydan oquyan Almaniyanı, qoca Rusiyanı həyəcana düşürən Yaponiyanın bütün bu tərəqqiyati-ciddiyələri həp ibtidai məktəblər sayəsindədir".

Cavidin bu fikirlərini onun maarif və məktəb məsələlərinə həsr etdiyi məqalələrinin leytmotivi hesab etmək olar. XIX əsrin sonu və XX əsrin əvvəllərində Naxçıvanda məktəb, maarif və təhsilin vəziyyətini nəzərdən keçirən müəllif, diqqəti Gəncə məktəbinə yönəldir. Onu Qafqazın ən birinci və ən parlaq məktəbi hesab edir. Uşaq və gənclərin ana dilində (türk dilində) təhsil almalarına və elm öyrənmələrinə böyük önəm verən şair, Azərbaycan balalarının xaricdə deyil, Gəncədə təhsil almalarına üstünlük verir, pedaqoji ictimaiyyətin diqqətini buna yönəldir və yazır: "Həmin məktəb haqqında azacıq məlumatı olan kəs, bir-iki il orada oxuyub məqsədinə nail ola bilər". Arzu edir ki, məktəbin özünəməxsus pansionu da olsun ki, valideynlər 13-14 yaşında olan uşaqları ora göndərib, orada oxuda bilsinlər. O, böyük bir ümidlə yazır: "Gəncə məktəbi böyüyəcək, artacaq, yüksələcək, geniş bir proqram tərtib edəcək, səbatlı bir Darülmüəllim olacaq. Çünki sahibləri yalnız maddətən deyil, mənən də geniş bir mühakimə, təmiz bir məslək sahibləridir".

Şair elmin, təhsilin, dünya və axirətin cəmini məktəblərdə görür. Qız və oğlanların ibtidai məktəblərdə icbari və məcburi təhsil almaları fikrini müdafiə edir. Sənət və məslək məktəblərini tiplərinə görə belə qruplaşdırır: Qorodskoy məktəblər, gimnaziyalar, realnı məktəblər və seminariyalar. Düşünür ki, iqtidarı, varı, həvəsi olanlar üçün həmin təhsil ocaqları həm münasib, faydalı, həm də istifadəlidir.

Cavid məqalələrində Türkiyədə maa-

rif, mədəniyyət və təhsilin yüksək səviyyədə olmasını təqdir etmişdir. Bu, onunla bağlı idi ki, Türkiyə artıq XIX əsrin ikinci yarısından başlayaraq, Avropa təhsilinə inteqrasiya olunmuşdur. Buna görə də o, yazmışdır: "Türkiyədə əsnayi-inqilabda vüqua gələn müvəffəqiyyətlər, qılıc parıltısından, qol zorundan ziyadə məktəb tərbiyəsinə və o məktəbləri idarə edən müəllimlərə mədyundur".

Şair millətin dirçəlişini, tərəqqidə uğurlar qazanmasını və gələcəyini elm və təhsildə görürdü və yazırdı: "Bir millətin halını tədqiq etmək için ən doğru meyar, ən kəsdirmə yol o millətin məktəbləridir. Əgər dünyada hər iş, hər hərəkət bir qanuna, bir rəhbərə möhtacdırsa, o rəhbər yenə də məktəblər ola bilir. Hər kəs, o cümlədən müəllim öz sənətində mahir olmalıdır. Sənətində mahir olmağı bizə öyrədən isə elm və məktəbdir. Məktəb, elm və savad hər bir peşə sahibinə lazımdır. Buna görə də "tarixi-ədyan", fəlsəfeyi-din bilməyən xoca hidayət, şəriət yerinə səfsəfə, zəlalət toxumu saçar... Təlim və tərbiyədən anlamayan bir müəllim tənviri-əfkar edəcək yerdə fəsadi-əxlaqa bais olur. Fəzilət yerinə rəzalət öyrədir, elm yerinə cəhalət örətmiş olur".

Cavid təhsildə mövcud olan problemləri yalnız Azərbaycan kontekstində deyil, türklərin çoxluq təşkil etdiyi bütün Qafqaz kontekstində qoyur. Məktəbi həqiqətin əks olunduğu yer, məkan hesab edir. "Həsbi-hal" məqaləsinin birinci hissəsində həmin problemi daha da qabardır. Düşünür ki, təbiət aləmində hər nəyə təsadüf etsək, onun ən mükəmməl, ən gözəl nümunəsini məktəbdə görmək olar. Bu səbəbdən də məktəb, məktəb adına layiq olmalıdır. "Təəssüf ki, belə deyil. Məktəblərimiz bir ətalətxanədən başqa bir şey deyildi" deyə təəssüf edir. "Bir çoq məktəblərdə müəllimlər vaqt öldürməkdən başqa bir şeyə yaramıyorlar. Daima şagirdlərdən miskinanə bir inqiyad, cahilanə bir itaət istərlər. Dərsləri hərfi-hərfinə tutuquşu kibi əzbərlətməyi kəndilərincə üsuli-cədid zənn edib öz-özlərini aldatıyorlar".

Hüseyn Cavid əsl və ciddi müəllim əməyinə, müəllim şəxsiyyətinə yüksək qiymət verirdi və deyirdi: "Ciddi müəllim pək şərəfli, pək böyük bir adamdır; əgər üsuli-təlimi və öz vəzifəsini bilirsə. Cahil müəllim pək bayağı, pək aşağı bir insandır, əgər həddini aşıb təlim və tərbiyə meydanına atılırsa..." O, bu cəhətdən 1903-1904-cü illərdə Qafqazda mövcud olan vəziyyətə nəzər salaraq, məktəblərin sayının artmasını müsbət bir hal kimi dəyərləndirir. Fəqət onların təsis və idarə edilməsində ciddi nöqsanlar görür. İstər kənddəki, istərsə də şəhərdəki məktəblərin seçkilər vasitəsilə təsis edilməsinə qarşı çıxır.

O, məqalələrində yeni üsullu məktəblərdə pedaqoji prosesin düzgün və səmərəli təşkil edilməsində müəllim kadrlarına ciddi ehtiyac olduğunu real faktlarla açıb göstərir. Düşünür ki, məktəb idarə heyəti müəllimlərə qarşı prinsipial olmalı, düzgün və sağlam məqsəd izləməlidir. Fənlərin tədrisinə öz işini bilən və öz sənətini sevən bilikli müəllimlər cəlb edilməlidirlər. Yoxsa "İdarə heyətinin ədəmi-isabətindən istifadə edərək bir taqım cahil, təcrübəsiz, fənni-tərbiyəyə biganə adamlar da dürlü-dürlü yaltaqlıqlar, iltimaslar sayəsində dərs işlərinə daxil olub ortalığı zirü zəbər edərlər".

Cavid Avropada və Asiyada təhsilin vəziyyətini Türkiyə, Qafqaz, Azərbaycan, İran və Yaponiyanın timsalında nəzərdən keçirdikdən sonra belə bir nəticəyə gəlir ki, Avropada təhsilin texnologiyası daha çox inkişaf etmişdir. İran təhsil sahəsində nə qədər geridə qalmışdırsa, Yaponiya bir o qədər irəliləmişdir və Asiya da nümunəvi təhsil sisteminə malikdir. Yaponiyanı çıxmaq şərtilə, Asiyada yaşayan xalqların

əksəriyyəti məktəb, maarif və təhsil sahəsində geri qalmışlar. Həmin ölkələrdə əhalinin, demək olar ki, 99 faizi savadsız və avam, 1 faizi isə işbilən təhsil və maarifdən anlayanlardır. Bu səbəbdən Asiya xalqlarının və müsəlmanların maariflənməsinə ciddi ehtiyac vardır. Mövcud problemin həllinə əngəl olan isə cahillik və cəhalətdir. "Cühəla elmin fəzilətini və nə yolda irəliləməsini təqdir edəməz, çünki cahildir. Maarifi sevən adam heç bir zaman cahil qalmaz, şübhəsiz ki, təhsil edib alim olmuş olardı".

Müəllif Qafqazda, o cümlədən Azərbaycanda maarif, məktəb və təhsil məsələlərinin vəziyyətini geniş araşdırıb təhlil etdikdən sonra sualı bu cür qoyur: "Şimdi nə yapmalı?" Sualın cavabını və problemin həllini məktəblər açmaqda görür. Cavid İstanbuldan vətənə qayıtdıqdan sonra Azərbaycan müəllimləri, maarifçiləri və məktəbdarlarına təlim və tərbiyənin nəzəriyyəsi barəsində geniş məlumat verməyi özünün vətəndaşlıq vəzifəsi hesab edir. Bu məqsədlə "Həsbi-hal" adlı silsilə məqalələr yazıb, "Həqiqət" qəzetində çap etdirir. Həmin məqalələr onun məktəb, maarif və təhsil problemlərinə nə dərəcədə vaqif olması, böyük maraq və diqqət göstərməsi haqda geniş və dolğun təsəvvür yaradır. Məqalələr öz məzmunu, ruhu, qaldırılan problemin müasirliyi və aktuallığı baxımından bu gün də diqqətəlayiqdir. Şair sayca ikinci məqaləsində daha çox Avropa filosofları və nəzəriyyəçilərinin təlim və tərbiyə haqqında fikir və konsepsiyalarını ortaya qoyur və buna öz münasibətini bildirir.

"Tərbiyə - pedaqogika nədir?" sualına İmmanuel Kantın (alman filosofu, 1724-1804), Con Lokkun (ingilis maarifçisi və filosofu, 1632-1704) və Herbert Spenserin (ingilis maarifçisi və filosofu, 1820-1903) tərbiyə barəsində mülahizələri ilə cavab verir. Kanta görə, "Tərbiyə, təbiəti-bəşəriyyənin bütün qabiliyyətlərini müntəzəmən və mütənasibən təməniyyə etdirməli və bütün insanları qayeyi-müqəddələrinə isal eyləməlidir".

Con Lokka görə, "Tərbiyə insanları fəzilətli, cəmiyyətə faydalı və kəndi məsləklərində məharətli bir hala gətirmək için ən qolay və ən qısa üsuldur".

Herbert Spenser isə belə hesab edirdi ki, "Tərbiyənin qayəsi bizi mükəmməl surətdə yaşamağa hazırlamaqdır".

Cavid həmin filosof və maarifçilərin fikirlərini təqdir edərək, bizim maarifçilik və pedaqoji fikrimiz tarixində, demək olar ki, ilk dəfə olaraq Qərbi Avropa filosoflarının təlim və tərbiyə haqqında fikirlərini Azərbaycan oxucuları və maarifçilərinin nəzərinə çatdırır. Məqsədi məktəbdarların diqqətini yerli məktəblərdə təlim və tərbiyə prosesini elmi və pedaqoji cəhətdən Avropa modeli əsasında düzgün və səmərəli təşkil etməyə yönəltmək idi. "Fənni-tərbiyənin insanları bəxtiyar edəcəyi, parlaq və məsud bir həyata nail eyləyəcəyi hər kəsə müsəlləm bir həqiqət olsa gərək" fikrini vurğulayan şair, düşünürdü ki, pedaqogika (tərbiyə) sahəsində yaxşı bir nəticəyə nail olmaq mürəbbiyələrdən, müəllimlərdən, onların pedaqoji hazırlığından, əfəndilərin "səviyeyi-irfanı və təşəbbüsati-ciddiyələrindən" asılıdır. Bu cəhətdən müəllim "Elmi-həyat" (həyat elmi), "Elmi-əxlaq" (etika) və "Elmi-ruh" (psixologiya) elmlərinə vaqif olmalıdır. O, həmin elmlərin pedaqoji mahiyyəti haqda yazırdı: "Elmi-həyat məktəb şagirdlərinin yeyib-içmək, gəzib-oturmaq, zəif və qüvvətli olmaq kibi hallardan bəhs edir. Elmi-ruh çocuqların fikrini, hissiyatını, əxlaqını öyrənib bilmək için böyük bir vasitədir. Elmi-əxlaq isə xeyir və şərin nədən ibarət olduğunu, tərbiyədə necə bir qayə təqib etdiyini öyrədir". Müəllif bu üç fənni bir-birindən ayırmırdı, əksinə, bir-birini tamamladığını, tərbiyə üçün mühüm əsas olduğunu düşünürdü.

Cavidə görə, şagirdlərin əxlaq və davranışları donuq və dəyişməz deyildir. Sinifdə nə qədər sifət varsa, bir o qədər əxlaq və davranış var. Uşaqlarda əxlaq və davranış nə qədər müxtəlif olsa da, zaman keçdikcə onlar dəyişir. Buna görə də müəllimin yeknəsək tərbiyəsi mənfəət yerinə zərər verə bilər. Müəllim təlim və tərbiyədə bunu nəzərə almalı və psixologiya elminə əsaslanaraq, şagirdlərin müxtəlif təbiətini nəzər-diqqətdə saxlamalıdır.

Şair uşaqların ev və ailə tərbiyəsi ilə məktəb tərbiyəsi arasında qırılmaz bağlılıq görürdü. Qeyd edirdi ki, məktəbə daxil olan şagird (istəyinə görə) 5, 10, 15 il vaxtını məktəbdə keçirir. Bu, az vaxt deyil!.. “Ev tərbiyəsi ilə məktəb tərbiyəsinin hər ikisi çocuqlarda dürlü-dürlü təsirlər bağışlar, bir çocuq evdə ata-ana tərbiyəsi sayəsində xəluq, çalışqan, mütəşəbbis bir qəhrəman olduğu halda, məktəbə dəvam edər-etməz əxlaqı, təbiəti büsbütün dəyişir, fəna, uyğunsuz bir hal kəsb etmiş olur”. Başqa sözlə, məktəb və sinif şəraiti, mühiti uşağın əxlaq və psixolojisinə təsir etdiyindən, müəllimlər buna xüsusi diqqət yetirməli və əhəmiyyət verməlidirlər. Əgər müəllim tərbiyədən anlayan olsa, məktəb şagirdlərində “müzzür əxlaq, fəna təbiətlər bulunmaz; bulunsa da, pək səthi, pək təsirsiz qalır” yazan müəllif, demək istəyirdi ki, ailədə böyüyən uşaqların əxlaq və tərbiyəsi də müxtəlif olur.

O, məqalələrində müəllim və valideynlərin diqqətini ümumi ictimai tərbiyəyə cəlb edir və düşünür ki, bu tərbiyə təhsili bitirdikdən sonra 35-40 yaşına qədər olan bir dövrü əhatə edir. İnsanın tərbiyəsi həmin yaş dövrünə qədər davam edir ki, buna ümumi mühitdən gələn ictimai tərbiyə deyilir. Bu zaman insanın ailə çərçivəsində, yaxud məktəblərdə aldığı tərbiyə büsbütün dəyişilə bilər. İnsan başqa bir aləmə, başqa bir cərəyana tabe ola bilər. “Maddi və mənəvi təsir insanın aldığı tərbiyələri zirü zəbər edəcək dərəcədə məsləkinə müğayir hallara sevq edə bilir”.

Müəllif tərbiyələrin ən əhəmiyyətlisini ümumi ictimai tərbiyədə, mühitin tərbiyəyə təsirində görür. Bu cəhətdən diqqəti nəfs məsələsinə çəkir. Hesab edir ki, “nəfs əksərən öncəki tərbiyələrə tabe olmaqdan varəstə ola bilməz, lakin fövqəladə mətanətə malik olan insanlarda onu islah etmək mümkündür”.

Şair ailə tərbiyəsi və bədənin sağlamlığı haqda yazır: “Ailə tərbiyəsi və vücud sağlamlığı (səhhəti-bədən) həyati-bəşəriyyənin ən mühüm əsasını təşkil edər. Vücudun sağlam olmasının yeganə səbəbi və müəssiri isə ata-anadır”. Nə üçün? O, bu suala bir həkim kimi cavab verir, məqalələrində bir psixoloq, bir müəllim, pedaqogikanı gözəl bilən bir mütəxəssis kimi çıxış edir.

Cavid hesab edirdi ki, anadan xəstə doğulan çocuq, xəstə yaşar, xəstə vücudu ilə də ölər. Həmin xəstəliyi icad edən isə ata və anadır. Çünki bir çox xəstəliklər uşağa irsən keçir. “Çocuqlara sirayət edən xəstəliklərdə ən dərin fəlakətlərə yol açan analardır. Çünki uşaq ana rəhminə düşdüyü zamandan başlayaraq doquz aya qadar qanından, təvəllüddən sonra da sütündən” qidalanır. Ən mühlik – sağalmaz xəstəliklərə də bu zaman tutulur. Təhlükəli xəstəliklər də onunla bərabər böyüməyə başlayır. Uşaqlar yalnız buna görə xəstə olmurlar. Onlar həm də yeyəcəyi, içəcəyi, geyəcəyi üzündən xəstələnirlər. Tənəffüs etdiyi hava, hərəkətsizlik, valideynlərin qeydsizliyi onların sağlamlığını pozur. Ata-analar və müəllimlər bunu bilməli, uşaqların təmiz və saf havada yaşamalarına, oynamaqdan qalmamalarına diqqət yetirməli, onların sərbəstliyinə mane olmamalıdırlar.

Məqalələrində bu kimi ciddi əxlaqi, tərbiyəvi, pedaqoji və psixoloji problemlərə toxunan müəllif sualı belə qoyurdu:

“Qafqasiyada çocuq tərbiyəsindən anlayan qaç anaya təsadüf edə biliriz? Çocuq tərbiyəsinə diqqət etmək için tərbiyə görmüş analar lazım deyilmi? Hanı ana yetişdirəcək məktəblərimiz?” Cavid vətənin və millətin inkişafını məktəbdə, təhsildə, elmdə, müəllimlərdə və analarda görürdü. “Vətəni, vətənin qiymət və əhəmiyyətini, tərəqqi və səadətini kimdən bəkləyə biləriz?” sualına belə cavab verirdi: − ...Şübhəsiz ki, vətənə, millətə, millətin gələcəyinə ağlayacaq, tərəqqisinə çalışacaq olsa-olsa ancaq ana qucaqlarında, məktəb sıralarında çırpınan məsumlar ola bilir. Fəqət bu nevzadların yeyib-içməsinə, geyinib gəzməsinə, təlim və tərbiyəsinə diqqət edəcək analar nerdə?..

Sualı doğuran zaman, ona cavab axtaran Cavid idi. O, savadlı analar gəzirdi. Düşünürdü ki, analar nə qədər savadlı olsalar, bir o qədər savadlı və nəzakətli uşaqlar tərbiyə edə bilərlər. Azərbaycanda belə analar isə çox az idi. O, tərəqqinin ilk vasitəsini analarda və qız məktəblərində görürdü. Yeni nəslin savadlı və tərbiyəli olması üçün gələcək anaları təhsilli və savadlı görmək istəyirdi. Qadınların ailə tərbiyəsindəki və cəmiyyətindəki rolunu yüksək qiymətləndirərək yazırdı ki, kişilərin maddi surətdə doğulub böyüməsinə qadınlar səbəb olduğu kibi, mənəviyyatca münəvvərfikir və tərəqqipərvər olmalarına yeganə vasitə yenə qadınlardır.

*Rəyçi: prof. Himalay Qasımov*

## İstifadə edilmiş ədəbiyyat

1. Hüseyn C. Əsərləri. V cild. Bakı, 2005.
2. Əziz Ş. Keçmiş günlərdən. Bakı, 1977.
3. Qasımov H. Sənət və sənətkarlıq məsələləri yeni düşüncə müstəvisində. Bakı, 2011.
4. “Həqiqət” qəzeti. 4 yanvar 1910.
5. “Həqiqət” qəzeti. 5 yanvar 1910.
6. “Həqiqət” qəzeti. 12, 14, 17, 24 və 25 may, 3, 7 və 8 iyun 1910.
7. “İqbal” qəzeti. 9 oktyabr 1913.
8. Ağayev Ə. XX əsrin əvvəllərində Azərbaycan məktəb və pedaqoji fikrinin inkişaf istiqamətləri. Azərbaycan məktəbi, 1987, №10.

**И.Оруджалиев**

**Педагогические мировоззрения Гусейна Джавида**

**Резюме**

В статье, основываясь на концепции И.Канта, Дж.Локка, Г.Спенсера, Б.Спинозы и других философов, Г.Джавид дает анализ педагогических взглядов начального образования и ситуаций просветительных работ в Азербайджане и на всем Кавказе.

**I.Orujaliyev**

**Hussein Javid’s pedagogical thoughts**

**Summary**

In clause, were based on the concept İ.Kants, C.Lokks, Q.Spensers, Б.Spinoza and other philosophers, H.Djavids gives the analysis of pedagogical sights of initial education and situations of educational jobs in Azerbaijan and on all Caucasus.

# QƏRBİ AZƏRBAYCANIN MİLLİ MƏKTƏB TARİXİNDƏN





**Əli Adıgözəlov,**
***Sumqayıt Dövlət Universitetinin dosenti***

**Şəlalə Adıgözəlova,**
***pedaqogika üzrə fəlsəfə doktoru***

Məqalədə XIX-XX əsrlərdə Qərbi Azərbaycanda mövcud olan təhsil ocaqlarının tarixindən bəhs edilir. Azərbaycanlıların deportasiyasının məktəb sisteminə təsirinə də toxunulur.

***Açar sözlər:*** *Qərbi Azərbaycan, milli məktəb, rus-tatar məktəbləri, təhsil tarixi, dünyəvi təhsil.*

***Ключевые слова:*** *Западный Азербайджан, национальная школа, русско-татарские школы, история образования, светская образования.*

***Key words:*** *Western Azerbaijan, national school, Russian-tartar schools, history of education, secular education.*

Yüksək intellekt sahibi olan Azərbaycan xalqı qədim mədəniyyətə malikdir. Azərbaycan torpağı məhsuldar, iqlimi mülayim olduğundan, yadların gözləri həmişə bu ərazidə olmuşdur. Vaxtaşırı bu torpaq təcavüzə məruz qalmış, ölkə talan edilmiş, kənd və şəhərlər dağıdılmışdır. Antik dövrün coğrafiyaşünası Strabon hələ eramızdan əvvəl ulu babalarımızdan olan albanlar haqqında yazırdı ki, orada adamlar gözəlliyi və hündür boyları ilə seçilirlər, eyni zamanda ürəyiaçıqdır-lar, xırdaçı və dalaşqan deyillər. İqlim əlverişlidir, torpaqdan ildə 2-3 dəfə məhsul götürmək olur. Bu torpaqların bir parçası olan Qərbi Azərbaycan zaman-zaman itkilərə məruz qalmışdır.

Qərbi Azərbaycandakı Azərbaycan türkləri, əsasən, İrəvan və 1868-ci ildə təşkil edilmiş Yelizavetpol quberniyasında yaşayırdılar. Yelizavetpol quberniyasına müxtəlif vaxtlarda Şuşa, Şəki, Gəncə, Cəbrayıl, Qazax, Ərəş və Zəngəzur qəzaları daxil idi. Zəngəzur qəzası isə Qubadlı, Laçın, Zəngilan, Mehri, Qafan, Gorus və Sisiyan ərazilərini əhatə edirdi. 1923-cü ildə Azərbaycanla Ermənistan respublikaları arasında sərhədlər müəyyən edilərkən Azərbaycanın Zəngəzur bölgəsinin böyük bir hissəsi (Gorus, Sisiyan, Qafan və Mehri rayonları) Ermənistana verildi. Tarixi ədalətsizliyin bu gün də davam edən bünövrəsi qoyuldu.

Qərbi Azərbaycanda sayca az olsa da, qədimdən məktəblər fəaliyyət göstərmişdir. Lakin Azərbaycan və Zaqafqaziya VII əsrdə ərəb xilafəti tərəfindən işğal edildikdən sonra ərəblər həmin ərazilərdə İslam dininin yayılmasında əsas vasitə olan mollaxana və mədrəsələrin təşkili üçün xəlifənin əmr və canişinlərinə hər cür şərait yaratdılar.

Məktəb (mollaxana) və ibtidai mədrəsələr uzun zaman azərbaycanlılar üçün yeganə təhsil ocaqları olmuşdur. Həmin məktəb və mədrəsələr vasitəsi ilə müsəlman ruhaniləri gənc nəslə oxuyub-yazmaq öyrətməklə bərabər, dini və qismən dünyəvi təhsil də verirdilər. Bu məktəblərdə xalqımızın görkəmli nümayəndələri təhsil almışlar.

İrəvan qəzasında azərbaycanlıların oxuması üçün ilk dəfə dünyəvi məktəblər

XIX əsrin 80-ci illərində açılmağa başlanmışdır. 1881-ci ildə Uluxanlıda, 1882-ci ildə İrəvanda, 1883-cü ildə İmanşalıda, 1884-cü ildə Basarkeçər rayonunun Zod kəndində ibtidai rus məktəbləri açılmışdır. 1898-ci ildə İrəvanda və Böyük Vedidə, 1905-ci ildə isə Qəmərlidə rus-tatar məktəbləri açılmışdır. 1914-cü il yanvarın 20-nə olan məlumata görə Qərbi Azərbaycandakı 15 rus-tatar məktəbində 911 nəfər şagird oxumuşdur. Həmin məktəblərdə oxuyan qızların sayı 60 nəfər, orada dərs deyən müəllimlərin sayı isə 39 nəfər olmuşdur. Bu hal ölkədə xalq maarifinin nə dərəcədə aşağı olduğuna sübutdur. Belə ibtidai rus məktəblərindən biri də 22 sentyabr 1885-ci ildə Dərələyəz qəzasındakı azərbaycanlılar üçün açılmış, orada 50 nəfər şagird oxumuşdur.

Çar hökuməti heç vaxt müstəmləkəsi olan ucqar yerlərdə yaşayan xalqların maariflənməsi qayğısına qalmamış, əksinə, müxtəlif vasitələrlə onlara mane olmağa çalışmışdır. XX əsrin əvvəllərində müxtəlif bəhanələrlə rus-tatar məktəbləri bağlanmışdı. Belə ki, 1920-ci ilə kimi Qərbi Azərbaycanda ancaq 15 rus-tatar məktəbi qalmışdır. Bu məktəblərdə dərs deyən 38 müəllimin az bir hissəsinin orta təhsili vardı. Məktəblərin bağlanmasında ermənilər əsas rol oynamışlar. Bədnam daşnak hakimiyyətinin hökm sürdüyü ağır illərdə həmin məktəblər də bağlanmış və 1920-ci ildə bütün Qərbi Azərbaycanda 2-3 rus-tatar (Azərbaycan məktəbləri) məktəbi mövcud olmuşdur.

Çarizmin müstəmləkəçilik və ruslaşdırma siyasəti ilə əlaqədar olaraq rus-tatar məktəblərində ana dili tədrisi gündən-günə sıxışdırılır və dərslərin tədricən tamamilə rus dilində keçilməsinə rəvac verilirdi.

Dövlət tərəfindən açılmasına və maliyyələşdirilməsinə baxmayaraq, bu məktəblərdə azərbaycanlıların oxumalarına erməni ziyalı və çinovnikləri hər cür maneçilik törədirdilər.

Sovet hakimiyyəti illərində, xüsusən 1921/1922-ci tədris ilində açılacaq yeni məktəblərin idarə edilməsi və digər məsələlərə dair bir sıra məktəb sənədləri tərtib edilib yerlərə göndərildi. 1922/1923-cü dərs ilində Ermənistanda 36 Azərbaycan məktəbi fəaliyyət göstərirdi ki, orada da 1521 şagird təhsil alırdı. Bu məktəblərdə 40 nəfər azərbaycanlı müəllim dərs deyirdi. Həmin müddətdə təkcə Zəngəzurun Azərbaycan kəndlərindən Qafanın Gığı, Şəhərcik, Sisiyanın Qızıl Şəfəq (İşıqlar), Vağüdü, Ərəfsə, Mehrinin Vartanazor və Aldərə kəndlərində yeni qaydada ibtidai məktəblər fəaliyyət göstərirdi.

1924-cü il dekabrın 25-də Ermənistan müəllimlərinin I qurultayı oldu. Qurultayın qərarı ilə 1926-cı ildən Azərbaycan dilində "Xalq maarifi" jurnalı nəşr edildi. Bununla belə müəllim hazırlığı problemi hamını narahat edirdi.

Azərbaycanlıların Moskvaya dəfələrlə müraciətinin nəticəsi olaraq 1925-ci ilin ikinci yarısında İrəvan şəhərində Azərbaycan dilində pedaqoji texnikum açıldı. Həmin texnikum 1948-ci ilə kimi fəaliyyət göstərmişdir. 23 il fəaliyyət göstərən həmin texnikum Azərbaycan məktəbləri üçün yüzlərlə müəllim hazırladı. Texnikuma müxtəlif vaxtlarda Bəhlul Yusifov və Mehdi Kazımov başçılıq etmişlər. Yusif Məmmədəliyev (sonralar Azərbaycan Elmlər Akademiyasının akademiki və prezidenti olub. İlk əmək fəaliyyətinə bu texnikumda başlayıb), Bala Əfəndiyev və başqa görkəmli maarif işçiləri də burada dərs demişlər. Texnikuma qəbulun sayı Ermənistan rayonlarındakı Azərbaycan əhalisinin sayı ilə tərs mütənasiblik təşkil edirdi. Məsələn, 1927/1928-ci tədris ilində texnikuma 139 nəfər tələbə qəbul edilmişdi.

Ermənistan SSR-də yeni açılan

Azərbaycan məktəblərinin normal işləməsini təmin və təşkil etmək məqsədi ilə 1925-ci ilin 25 avqustunda Gümrüdə azərbaycanlı müəllimlərin qurultayı çağırıldı. Qurultayda bütün bölgələrdən nümayəndə vardı.

Qurultayın əsas məqsədi ziyalıları mədəni-maarif ocaqları ətrafında səfərbər etməkdən, məktəblərin təşkili qaydalarını RSFSR, Azərbaycan SSR və Ermənistan SSR məktəblərinin təcrübəsi əsasında qurmaq üçün yeni məktəb müəllimlərinə göstəriş verməkdən, yeni təlim və tərbiyə üsullarının aydınlaşdırılmasından ibarət idi.

Yeni məktəblər təşkil edilərkən qarşıya bir sıra çətinliklər çıxdı. Belə ki, respublikanın ucqar kəndlərində məktəblər açmaq üçün bir tərəfdən pedaqoji hazırlıqlı kadr yox idi, digər tərəfdən kəndlərdə məktəb təşkil etmək üçün hələ kənd sovetləri yaradılmamışdı.

Yeni əlifbaya keçmək üçün Azərbaycan Respublikasından fərqli olaraq burada dövlət və partiya xüsusi hazırlıq görmürdü. Azərbaycanlı ziyalılar bir araya gələrək 1924-cü il aprelin 28-də İrəvanda Yeni Azərbaycan Əlifba Komitəsi yaratdılar. Yeni Azərbaycan Əlifba Komitəsi respublikada 11 kurs təşkil etdi. Həmin kurslarda 1925-ci ildə 350 nəfər yeni Azərbaycan əlifbasını öyrəndi.Yeni əlifba komitəsi 1925/1926-cı dərs ilində birinci dərəcəli məktəblərdə yeni əlifbanın tətbiq edilməsi barədə qərar qəbul etdi.

Ermənistandakı Azərbaycan məktəbləri tədris proqramlarını müvəqqəti olaraq Azərbaycandan aldılar. 1923-cü ilə kimi Ermənistan mətbuatında Azərbaycan məktəbləri üçün heç bir proqram nəşr edilmədi. Bu hal gənc müəllimlərin işini daha da çətinləşdirdi. Qeyd etməliyik ki, Ermənistandakı Azərbaycan məktəbləri mövcud olduğu bütün müddətdə Azərbaycan Maarif Nazirliyi tərəfindən hazırlanıb çap edilən tədris proqramlarından istifadə etmişlər. Bu barədə Ermənistan hökuməti heç vaxt bir addım atmamışdır.

Azərbaycan orta və yeddiillik məktəblərini ixtisaslı müəllim kadrları ilə təmin etmək üçün 1935-ci ildə Gümrüdə (Leninakanda) Azərbaycan dilində qiyabi ikiillik Müəllimlər İnstitutu açıldı. Bu institut bir qədər sonra Dilicana köçürüldü. Burada hər iki respublikanın XMK-larının qarşılıqlı əlaqəsi nəticəsində Bakıdan gələn müəllimlər heyəti dərs deyirdilər.

Azərbaycanın əzəli torpaqları olan Zəngəzur və Göyçəni özünə birləşdirən və Ermənistan adlı respublika yaradan ermənilər və onların havadarları bu işdən narazı insanların diqqətini yayındırmaq məqsədilə azərbaycanlılar yaşayan rayonlarda məktəb tikintisini genişləndirdilər. Yeddiillik məktəblərin sayı çoxalmaqla bərabər, orta məktəblər də təşkil edilməyə başlandı. O vaxta qədər ancaq ibtidai məktəb binaları tikilir və təmir edilirdisə, sonra yeddiillik və orta məktəblərin də inşası genişləndirildi. 1937-1939-cu illərdə dövlət hesabına 109 məktəb binası istifadəyə verilmişdi ki, onlardan 94-ü kəndlərdə tikilmişdi.

1935-ci ildə təşkil edilən Leninakan (Gümrü) ikiillik Qiyabi Pedaqoji Müəllimlər İnstitutunu 1947-ci ildə 31 nəfər bitirdi və işləmək üçün kəndlərə göndərildi. Bu isə mövcud tələbatı ödəmirdi.

Azərbaycan məktəblərinin ixtisaslı kadrlarla təmin edilməsində yol verilmiş nöqsanlar ciddi narazılıqlara səbəb olurdu. Yenidən milli münaqişə zəminində toqquşmaların yaranacağından qorxuya düşən Ermənistan rəhbərliyi 1937-ci ildə İrəvan Pedaqoji İnstitutunda Azərbaycan bölməsinin açılmasına razılıq verdi. Sonralar bu şöbənin Azərbaycan məktəblərini ixtisaslı müəllim kadrları ilə təmin etməkdə böyük rolu olmuşdur.

1941-ci ildə Böyük Vətən müharibəsi başladı. İxtisaslı müəllimlərin bir qismi orduya səfərbər edildi. Onsuz da kadr problemi mövcud idi, müharibə bu problemi daha da dərinləşdirdi. Məktəblər və müəllimlər öz işlərini müharibə şəraitinin

yeni tələblərinə uyğun qurmağa başladılar.

Müharibədən sonra azərbaycanlıların öz ata-baba torpaqları olan Qərbi Azərbaycandan dövlət səviyyəsində 1948-1953-cü illərdəki deportasiyası zamanı İrəvandakı Azərbaycan Pedaqoji Texnikumu və X.Abovyan adına İrəvan Pedaqoji İnstitutunun Azərbaycan bölməsi də deportasiyaya məruz qaldı. İnstitut 1948-ci ildə Gəncəyə, texnikum isə Xanlara köçürüldü. Bundan sonra Ermənistanda qalan Azərbaycan məktəblərini müəllim kadrları ilə ancaq Azərbaycan Respublikası təmin etməli oldu.

Azərbaycan məktəbləri məzunlarından 70 il ərzində 96 nəfər akademik və elmlər doktoru, 618 nəfər elmlər namizədi alimlik dərəcəsinə sahib olub.

Müharibədən sonra Azərbaycanlıların Ermənistandan deportasiyası kütləvi xarakter aldı. Belə ki, Böyük Vətən müharibəsini qələbə ilə başa vuran SSRİ dünyadakı (o dövrə görə) nüfuzundan istifadə edərək yenicə təşkil edilən BMT-ni belə bir məzmunda qərar qəbul etməyə təhrik etdi: "Dünyanın müxtəlif ərazilərinə səpələnmiş almanlar Almaniyaya, yəhudilər İzrailə, ermənilər isə Ermənistana qayıda bilər". BMT-nin bu qərarından (1947-ci il) istifadə edən ermənilər İran, Suriya, Livan, Misir, Türkiyə və digər dövlətlərdən Ermənistan SSR-yə köçürüldülər. Ermənistan ərazisinin onlar üçün az olduğunu bəhanə edən o vaxtkı SSRİ hökumətinin rəhbərləri Ermənistan SSR-yə köçürülən erməniləri yerləşdirmək üçün oradakı azərbaycanlıları Azərbaycan SSR-yə köçürdülər. Bununla da Qərbi Azərbaycandan soydaşlarımızın kütləvi deportasiyası planı baş tutdu. Bu, Qərbi Azərbaycanlılara ciddi mənəvi zərbə oldu, onların mədəni və elmi inkişafını ləngitdi. Uşaqların bir hissəsi təhsildən kənarda qaldı. İqlim şəraitinin onlara uyğun olmaması ilə əlaqədar köçürülən əhalinin bir hissəsi vaxtsız vəfat etdi. Lakin əhalinin bir qismi müqavimət göstərərək öz ata-baba torpaqlarını tərk etmədi. Ancaq tale onların da üzünə gülmədi. SSRİ-nin dağılması ərəfəsində 1988-ci ildə Qərbi Azərbaycanda olan azərbaycanlılar son nəfərinə qədər öz əzəli ata-baba torpaqlarından qovuldular.

Qərbi Azərbaycanın təhsil tarixinin araşdırılması bir daha təsdiq edir ki, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dediyi kimi, Qərbi Azərbaycan bizim tarixi torpaqlarımızdır və onun keçdiyi yol Azərbaycan xalqının keçdiyi tarixi yolun bir parçasıdır.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. Şərif Ə. "Keçmiş günlərdən" adlı sənədli xatirələr. Bakı, 1983.
2. Zeynalov Ə. İrəvan ziyalıları. Bakı, 1999.
3. Nəcəfov N. İrəvan Pedaqoji İnstitutu Azərbaycan bölməsinin acı taleyi. "Azərbaycan müəllimi" qəzeti, 2013, 1 mart, №8.
4. Ələkbərli Ə. Qərbi Azərbaycan. 10 cilddə. I cild. Vedibasar mahalı. Bakı: Ağrıdağ, 2000.
5. Məhərrəmov Z. İrəvanda məkdəbdarlıq və maarifçilik. Bakı, 2010.

**А.Адыгёзалов,**
**Ш.Адыгёзалова**

**О национальной истории школы западного Азербайджана**

**Резюме**

В статье говорится об истории о школах, действующих XIX-XX вв. в территории Западного Азербайджана и об отрицателном влияние депортации азербайджанцев на образователным системе.

**A.Adigozalov,**
**S.Adigozalova**

**On the history of national schools of Western Azerbaijan**

**Summary**

In the article, it is spoken about the history of schools existed in the XIX-XX centuries in Western Azerbaijan, and the influence of deportation of Azerbaijani people had on the school system.



# “AZƏRBAYCAN MƏKTƏBİ” JURNALININ İLK NÖMRƏSİ

**Elnarə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***ADPU-nun elmlər doktoru hazırlığı üzrə dissertantı***

Məqalədə “Azərbaycan məktəbi” jurnalının sələfləri olan “Yeni məktəb” və “Müəllimə kömək” jurnallarının fəaliyyətindən, həmçinin 1943-cü ildən nəşrə başlayan “Azərbaycan məktəbi” jurnalının keçdiyi tarixi yoldan bəhs edilir. Məqalədə əsas diqqət “Azərbaycan məktəbi” jurnalının ilk nömrəsi üzərində cəmləndirilmişdir.

***Açar sözlər:*** *elmi-nəzəri, pedaqogika elmi, pedaqoji fikir, pedaqoji düşüncələr.*
***Ключевые слова:*** *научно-теоретический, педагогическая наука, педагогическая мысль, педагогические размышления.*
***Key words:*** *scientific-theoretic, pedagogical science, pedagogical thoughts, ideas on pedagogy.*

Azərbaycan Respublikası Təhsil Nazirliyinin elmi-nəzəri və pedaqoji jurnalı olan “Azərbaycan məktəbi” Azərbaycan pedaqoji fikrinin formalaşmasında aparıcı qüvvələrdən biri kimi qəbul edilən ən uzunömürlü mətbuat orqanıdır. 93 illik fəaliyyəti dövründə o, ən mürəkkəb vəziyyətlərdə təhsilimizə dayaq olmuş, təhsilimizi istiqamətləndirən pedaqoji elmimizin keşiyində durmuşdur. Tarixin ağır sınaqlarından keçmiş jurnal müxtəlif situasiyalara, dövrün basqılarına sinə gərmiş, müəllim-lərin və bütün pedaqoji işçilərin yaxın dostu, həmkarı kimi ardıcıl mövqedə dayanmış, yeni pedaqoji fikirlərin, qabaqcıl təcrübənin, innovasiyalar və texnologiyaların təbliğatçısı və yazıçısı olmuşdur. Öz ətrafına təcrübəli pedaqoqlar toplayan bu jurnalın adı həmişə SSRİ miqyasında tanınan pedaqoji jurnallar sırasında çəkilmişdir. Uzun illər boyu “Azərbaycan məktəbi” təhsil mədəniyyətinin yaradılması və inkişaf etdirilməsində ən çevik və etibarlı mətbuat orqanı kimi tanınmışdır.

“Azərbaycan məktəbi” Azərbaycan milli təhsilinin salnaməsidir. Onun səhifələrində xalqımızın ən görkəmli pedaqoqları, elm, sənət adamları, maarifçilər, metodistlər, məktəb rəhbərləri çıxış etmiş, təhsilimizin uğurları və inkişaf yolları haqqında dəyərli fikirləri pedaqoji ictimaiyyətə çatdırmışlar. Bütün bunlar isə təhsilimizin inkişafına öz müsbət təsirini göstərməmiş qalmamışdır. Görkəmli pedaqoqlar həmişə bu fikirdə olmuşlar ki, məktəb təcrübəsində, ümumiyyətlə, pedaqoji sahədə əldə edilmiş yeniliklərə əsasən pedaqoji mətbuatın səhifələrində rast gəlmək olar. Belə məqalələr qiymətli məxəzlər kimi nəsillər üçün miras saxlanılır. Azərbaycan təhsilinin inkişaf tarixi də bu qaynaqlardan qidalanaraq pedaqoji fikir tariximizlə eyni müstəvidə püxtələşmişdir. Azərbaycan pedaqoji fikrinin təşəkkül dövründəki fikirlər də ilk növbədə nüfuzlu pedaqoji mətbuatda “Azərbaycan məktəbi”ndə yer almışdır. Azərbaycan pedaqoqları üçün bu jurnal əvəzsiz mənbə olmuşdur. Pedaqoqların elmi əsərlərinin nəşri jurnala nisbətən daha uzun sürən proses idi. Ona görə də “Azərbaycan

məktəbi" önəmli pedaqoji fikirləri, eləcə də Qərb və Şərq pedaqoqlarının fikirlərinin oxuculara, müəllimlərə çatdırılması üçün çox əlverişli münasib nəşrlərdən biri idi. Həm də bu mərhələdə jurnal Əhməd Seyidov, Mehdi Mehdizadə, Mərdan Muradxanov kimi korifeylərin fundamental elmi əsərləri ilə zənginləşdirildi. Sonrakı nəsil pedaqoqların, müasirlərimiz olan Əjdər Ağayev, Nurəddin Kazımov, Hüseyn Əhmədov, Yusif Talıbov, Əliheydər Haşımov, Fərrux Rüstəmov və başqalarının gərgin əməyi sayəsində daha etibarlı məxəzə çevrilirdi. Jurnal oxucuları onları düşündürən məsələlərlə əlaqədar səmərəli fikirlərdən zaman-zaman bəhrələnmiş, belə məqalələrin gərgin axtarışların nəticəsi olduğunu bir daha yəqin edirdilər. Azərbaycanın istedadlı pedaqoq-psixoloq alimlərinin yetişməsində, onların irsinin qorunub saxlanılmasında, şübhəsiz ki, "Azərbaycan məktəbi"nin rolu danılmazdır. Akademik M.Mehdizadənin sözləri ilə desək: "Azərbaycan məktəbi" jurnalı respublikada məktəb təhsilinin tərəqqi yollarını işıqlandırmaqda çox böyük və mənalı fəaliyyət göstərmiş və göstərməkdədir". 30-cu illərədək "Yeni məktəb", qırxıncı illərin əvvəllərinədək "Müəllimə kömək" adları ilə çıxan bu jurnal indiki adını 1943-cü ildən daşıyır. "Azərbaycan məktəbi" adını jurnala o zaman Xalq Maarif Komissarı olan Mirzə İbrahimov vermişdir. O bu adı verəndə təhsilimizin bütün pillələrini nəzərdə tutmuşdu.

"Azərbaycan məktəbi" Azərbaycan SSR Xalq Maarif Komissarının 23 fevral 1943-cü il tarixli, 17 nömrəli əmri ilə yaradılmışdır. Əmrdə deyilirdi: "Müəllimlərin ixtisasını və ideya-siyasi səviyyələrini yüksəltmək, pedaqoji prosesə metodik rəhbərliyi düzgün təşkil etmək, ən yaxşı müəllimlərin təcrübəsini bütün müəllimlərə çatdırmaq məqsədilə Azərbaycan SSR XMK-nın "Azərbaycan məktəbi" adlı metodik bülleteni nəşr edilsin".

"Azərbaycan məktəbi" jurnalının ilk nömrəsi 1943-cü ilin noyabrında 10 çap vərəqi həcmində 3000 nüsxə ilə nəşr edilmişdir. İki ayda bir dəfə çıxan jurnal Azərbaycan Xalq Maarif Komissarlığının orqanı idi. Jurnalın birinci nömrəsinin mündəricatı ("Mündəricə") aşağıdakı yazıları əhatə edirdi: "Azərbaycan məktəbi", "Müəllimlər və müharibə", "Gənclər Qızıl Ordunun şanlı ənənələri əsasında tərbiyə edilməlidir", "Şeirlər", "Natamam orta və orta məktəblərin təlim-tərbiyə və pedaqoji işində təhrif faktları haqqında", "Məktəblilər kənd təsərrüfat işlərində yaxından iştirak etməlidirlər", "Azərbaycanın bütün müəllimlərinə və maarif orqanları işçilərinə!", "Vətən müharibəsi şəraitində ədəbiyyat üzrə sinifdən və məktəbdənxaric iş", "Mənim qeydlərim", "Əmrlər və qərarlar", "Tənqid və biblioqrafiya".

Jurnal "Azərbaycan məktəbi" adlı baş məqalə ilə açılır. Məqalə vətəni tərənnüm edən sözlərlə başlanır: "Uzun əsrlər boyu gün doğan ölkələrə açılan qapıların ağzında durmuş Azərbaycan torpağının qədim və şərəfli bir tarixi vardır. Ulu əcdadımızın gözəl və nəcib arzuları, bahar suları tək coşğun duyğuları ana torpağa və öz milli istiqlaliyyətinə saf bir məhəbbətdən doğan qürur və heysiyyəti bu tarixin hər bir səhifəsini əlvan boyalarla bəzəmişdir. Bu ölkə ta qədim zamanlardan bəri insanlığa məxsus olan hər cür xoş əməllərin, istək və xəyalların beşiyi, zülmün təzyiqinə və işgəncələrin möhnətinə dözərək xalqı parlaq, işıqlı aləmə, səadətə çıxarmaq, mərifətin və elmin qapılarını onun üzünə açmaq üçün həyatını əsirgəməyən insanların müqəddəs

vətəni olmuşdur. Onların gözəl arzuları, düşüncələri bu ölkənin hər bir daşında həkk olunmuş, qocaman Kəpəzin, qarlı Savalanın buzlu sinəsinə etibarlı və bacarıqlı əllərlə nərş edilmişdir. Çox işğalçılar bu ölkəni çalıb-çapmağa, daşını daş üstündə qoymamağa, azad xalq oğullarının alınlarına əbədi köləlik damğası vurmağa çalışdılar, xalqın varlığını, milli mədəniyyətini əlindən almağa cəhd etdilər. Lakin xalqımız heç bir işğalçıya baş əymədi. Ağsaqqallı qocaların nuraniliyinə, anaların halal südünə, gəlin və qızların pak namuslarına and içmiş Azərbaycan oğulları son damla qanlarına qədər fədakarlıqla vuruşaraq tarixə qılıncla böyük rəşadət səhifələri yazdılar”.

Sonra baş məqalədə dövrün hakim ideologiyasına uyğun olaraq dini ehkamlar, mollaxana və mədrəsələrə münasibət bildirilir, belə hallara yol verilməsi qəti pislənilir. Bununla yanaşı Seyid Əzimdən, Nizamidən, Sabirdən gətirilmiş nümunələr əsasında gənc nəslin elmə hərtərəfli yiyələnməsinin vacibliyi əsaslandırılır, məktəblərdə aparılan işlər bu istiqamətə yönəldilirdi. Burada müqayisə üçün bəzi rəqəmlər də gətirilir və son rəqəmlərə istinad edilirdi. Belə ki, 1942-ci ildə respublikada şagirdlərin ümumi sayının, yəni 694203 nəfərin 394000-nin azərbaycanlı balaları olduğu da vurğulanırdı. Məqalə məktəblər və müəllimlərin qarşısında böyük vəzifələr durduğunu xatırladır, onlara müvafiq tövsiyə və tapşırıqlar verilirdi.

Jurnaldakı “Müəllimlər və müharibə” adlı sanballı məqalədə hərbi vəziyyət dövründə məktəbin qarşısında duran vəzifələr bir daha yada salınmış dəyərli pedaqoji fikirlər söylənmişdir. Aşağıdakı sözlər bu gün də öz əhəmiyyətini itirməyən pedaqoji tövsiyyələrdir: “Pedaqoji sənət – xüsusi bir sənətdir, bu sənət təlim işi ilə zahirən heç də bilavasitə bağlı olmadan xüsusi keyfiyyət tələb edir. Bununla belə keyfiyyətlərin olmaması təlimin müvəffəqiyyətlə keçməsinə çox təsir edir”. Göründüyü kimi, təhsilin ən başlıca vəzifələrindən hesab olunan keyfiyyət tələbləri müharibənin ağır günlərində də gündəmdə qalırdı.

Çox maraqlıdır ki, müəllim sözünün daşıdığı məna yükü də vurğulanırdı. Orada deyilir: “Müəllim sözünün iki mənası vardır: dar mənada – bu və ya digər dərsin müəllimi deməkdir; sözün geniş mənasında isə - adamlara böyük təsir göstərən nüfuzlu, müdrik adam deməkdir. Sonra əlavə olunurdu ki, “hələ qədim zamanlarda müdrik adamları müəllim adlandırırdılar. Misal üçün filosof Platon Sokratı müəllim adlandırırdı”. Burada müasir pedaqoji tədqiqatlarda öz yerini tutan bir sıra fikirlər və mülahizələr də səslənirdi:

“Öz-özlüyündə aydındır ki, birinci növbədə müəllim öyrətdiyi dərsi yaxşı bilməlidir; müəllim öz predmetini bilməzsə və ya zəif bilərsə müvəffəqiyyət qazana bilməz. Bundan başqa müəllim həmin predmet sahəsində öz bildiyini daima təkmilləşdirməli, onun bütün incəliklərini başa düşməli, həmin predmetə dair ədəbiyyatda olan müxtəlif nöqteyi-nəzərlərdən xəbərdar olmalı, dərs kitablarının keyfiyyətini bilməli, deyildiyi kimi, öz işinin məlumatlı mütəxəssisi olmalıdır. Bu, təlimi müvəffəqiyyətlə keçirmək üçün bünövrə, əsasdır”. Sonra yuxarıdakı fikirlər bir az genişləndirilirdi:

“Lakin bilik sahibi olmaqla iş bitmir, bu, ancaq materiala malik olmaq deməkdir. Söz yox ki, material keyfiyyətcə yaxşı ola bilər, lakin bununla birlikdə həmin materialdan səmərəli surətdə istifadə etməyi bacarmaq, biliyi başqalarına vermək də tələb olu-

nur. Unutmamaq lazımdır ki, ibtidai və orta məktəbdə 8 yaşından 18 yaşına qədər uşaqlar oxuyurlar. Çox zaman belə olur ki, aşağı siniflərdə yaxşı dərs verən müəllimlər yuxarı siniflərdə yaxşı dərs verə bilmirlər və ya əksinə olur. Mənə elə gəlir ki, aşağı siniflərdə dərs vermək daha çətin və həm də daha məsuliyyətlidir.

Təcrübəli pedaqoqlar həmişə bu fikirdə olmuşlar ki, dərs vermək təkcə elm deyil, həm də məharətdir. Görünür ki, onlar haqlıdırlar, çünki müəllim uşaqlara təsir edə bilməli, onların yanında nüfuz qazanmalıdır. Bunun üçün isə, aydındır ki, təkcə bilik azdır, müəllimin hissləri, həyəcanı, hətta onun bütün instinktiv hərəkətləri uşaqlara yaxşı təsir etməlidir. Misal üçün, uşaqları sevmək, onların müvəffəqiyyətinə sevinmək, şagirdlərin dərsi bilməməsindən müəllimin kədərlənməsi hallarını götürək. Çox danışmağın, öyüd-nəsihət verməyin təsiri azdır. Lakin uşaqlar müəllimin ürəkdən sevindiyini və ya kədərləndiyini gördükdə bu, uşaq zehnində iz buraxmamış olmur. Misal üçün, uşağı maraqlandırmaq, uşaq beynini mücərrəd arifmetik rəqəmlərin konkretliyini anlamağa vadar etmək məgər məharət deyilmi?"

Müəllif nüfuzuna yüksək qiymət verilmiş bu yazıda uşaqlarda ömürlük iz buraxan müəllimlər haqqında danışılır və onlar talantlı insanlar adlandırılırdı. "Belə müəllimlər eyni zamanda həm də tərbiyəçidirlər", - deyilirdi. Burada fikrin əsaslandırılması üçün görkəmli rus pedaqoqu Dobrolyubovdan sitat gətirilir: "Bəli, müəllim şagird üçün pərəstişkarlıqla heyrət doğuran təkmil insanın yüksək nümunəsini təşkil edir. Bir balaca qız kitabında dövrəsinə karandaşla cızıq çəkilmiş bir yeri ehtiramla göstərərək mənə: "Bu yerə bizim müəllim barmağını vurmuşdur"- dedi". Böyük pedaqoqun bu cəhdə belə həssaslıqla yanaşması müəllimlərə çox şey deyirdi.

Məqalənin bir qədər aşağısında müəllimin vəzifələri daha da dəqiqləşdirilir və onun üzərinə müəyyən vəzifələr qoyulur. Pedaqoji ədəbiyyatda tərbiyəçilər haqqında bu barədə gedən fikirlər şərh olunurdu:

"Tərbiyə etmək rəsmən müəllimin vəzifəsinə daxil olmasa da, bu məsələ onun işində görkəmli yer tutur. Başqa cür də ola bilməz. Axı hər gün onlarca uşaq gözü diqqətlə müəllimə baxır və onun həm müsbət, həm də mənfi təsiri uşaqların xarakterində özünü göstərir. Vicdanlı müəllim bu tərbiyəçilik vəzifəsindən boyun qaçıra bilməz və həmişə öz hərəkətlərində uşaqlara nə kimi təsir bağışlayacağını nəzərdə tutur. Buna görə də müəllimin bu tərbiyəçilik vəzifəsini yerinə yetirməyi düşüncəli surətdə öz öhdəsinə götürməsi yaxşı iş üçün məqsədəuyğun və effektli olar".

Bir qədər aşağıda dövrün tələbi də dilə gətirilir, tərbiyə işi faşistlərə qarşı müharibə ilə əlaqələndirilir: "Əlbəttə, tərbiyə müxtəlif olur, müxtəlif məqsədlər güdür. Misal üçün, faşist tərbiyəsi insanın hər şeyi öyrənməyə olan marağını öldürməyə cəhd edir, insanı avtomat etməyə, ona kor-korana itaət etmə hissi aşılamağa çalışır, insanlarda düşüncəli olaraq heyvani instinktlər inkişaf etdirir. Gördüyümüz kimi, faşistlər bu işdə əhəmiyyətli nəticələr əldə etmişlər ki, bunu indi nemeslərin işğal etdiyi bütün ölkələrdə müşahidə etmək olar".

Sonra məqalədə müəllimlərin faşistlərə qarşı mübarizəyə hazır olmasından, doğma vətənin tarixini, ədəbiyyatımızı və dilçiliyimizi şagirdlərə dərindən mənimsədilməsindən, onların kənd təsərrüfatı işlərinə cəlb edilməsinin zəruriliyindən bəhs edilir.

Məqalədə pedaqoji fikirlərlə yanaşı dövrün ideyalarından doğan məsləhət və

tövsiyələr də qabarıq şəkildə öz yerini tuturdu. Məqalə əminliklə belə bir sonluqla bitirdi ki, “Müəllimlər nemes-faşist işğalçıları üzərində qələbəni təşkil etmək üçün xalqımızın siyasi, mənəvi və maddi qüdrətini artırmağa özlərinin bütün yaradıcılıq qüvvələrini sərf edəcək”.

Sonrakı məqalə “Gənclər Qızıl Ordunun şanlı ənənələri əsasında tərbiyə edilməlidir” adlanırdı. Burada RSFSR Xalq Maarif Komissarının müavini, general-mayor A.Borisovun tələbləri müəllimlərə çatdırılırdı. O məqaləni belə yekunlaşdırırdı: “Xalqımızın qarşısında sovet məktəbinin vəzifəsi Qızıl Ordumuz üçün vuruşmağı bacaran, bədəncə bərkimiş, mənəvi cəhətdən möhkəm olan ehtiyat qüvvələri yetişdirməkdir”. Bu fikirlər də o zaman hər yerdə rast gəlinən “hər şey müharibə üçün, hər şey qələbə üçün” özləri ilə səslənirdi. Bu fikirlər ona görə yada salınır ki, tədqiqatçılar müəyyən məsələləri dəyərləndirdikdə dövrün tələbini, həmin ideologiyanı nəzərə alsınlar. O dövr yaşanmışdır, onu olduğu kimi görmək və qeyd etmək lazımdır.

Birinci nömrədə bəzi qərarlar da dərc edilmişdir: “Müəllimlərin və məktəblilərin mədəni yaşayış şəraitini yaxşılaşdırmaq tədbirləri haqqında” qərar geniş müzakirənin nəticəsi kimi verilmişdir. “Natamam orta və orta məktəblərin təlim-tərbiyə və pedaqoji işində təhrif faktları haqqında” qərarda respublikamızın bir sıra məktəblərində buraxılmış nöqsanlar sadalanır və müvafiq göstərişlər verilirdi. “Vətən müharibəsi şəraitində ədəbiyyat üzrə sinifdən və məktəbdənxaric iş” adlı məqalədə deyilirdi ki, Böyük Vətən müharibəsi dövründə bütün müəllimlərin, xüsusən dil-ədəbiyyat müəllimlərinin üzərinə olduqca şərəfli bir vəzifə düşür: “Ədəbiyyat dərsi şagirdləri mənəvi cəhətdən hazırlamalı, onlara mərdlik, cəsarət, vətənpərvərlik kimi bəşəri duyğular aşılamalı, onlarda alçaq və xain düşmənə sönməz, ölçülməz bir kin və nifrət duyğusu aşılanmalıdır”. Burada indi də aktual olan fikirlər də vardı: “Ancaq... bədii ədəbiyyat üzərində tək sinif və məktəb daxilində işləmək kifayət deyildir. Təcrübə göstərir ki, bəzən sinifdə öz işini çox yaxşı quran müəllimlərin də şagirdləri ədəbi bilikdən az inkişaf etmiş olur və ədəbi dil, bədii ifadə vasitələri zəif olduğu kimi bədii zövqləri də olmur. Bunun əsl səbəbi müəllimin ədəbiyyat üzrə sinifdən və məktəbdən xaric iş üzərində az işləməsi və ya heç işləməsidir.

Ədəbiyyat üzrə sinif və məktəbdən xaric iş sinifdə görülən işin ayrılmaz bir hissəsi olub, onun tamamlanmasını, dərinləndirilməsini təmin etməlidir. Göründüyü kimi, o zaman qoyulan pedaqoji yanaşma yenə də öz müstəvisindədir”.

Sonra məqalədə aşağıdakı başlıqlar altında: “Dərnəklərlə iş”, “Məktəb jurnalı və divar qəzeti”, “Tamaşalar, müsamirələr, ədəbi-bədii gecələr”, “Ədəbi-bədii sərgilər”, “Ədəbi ekskursiyalar”, “Kino və teatr”, “Sinifdən və məktəbdən kənar işin başqa növləri”, “Biblioqrafiya” kimi bölmələr də ədəbiyyat müəlliminə gündəlik istifadə olunacaq metodiki tövsiyyələr verirdi. Qeyd etmək lazımdır ki, burada bu gün də ədəbiyyat müəllimlərinə gərək olan fikirlər vardır. Bəzi ədəbiyyat metodistlərinə belə məxəzlərdən istifadə etməsi faydalı olardı. Sonra ədəbiyyat müəlliminin vəzifələri konkretləşdirilirdi.

Jurnalda “Qabaqcıl müəllimlərin iş təcrübələri” adlı rubrika da vardır. “Mənim qeydlərim” adlı məqalənin müəllifi, Bakı şəhəri 1 nömrəli tam orta məktəbin tarix müəllimi Ə.Mehdiyevdir. Müəllim dərslərində istifadə etdiyi üsullardan, dərsin necə qurulmasından geniş bəhs edir, sonra sözü

öz üzərinə gətirirdi: "Müəllimin tələbkar olması şagirdləri müntəzəm surətdə mənimsənilən dərsin keyfiyyətini yüksəldir. Odur ki, mən bu işə artıq diqqət yetirirəm. Dərslərimdə geridə qalan şagirdlərdən daha tez-tez soruşuram". Müəllimin fikirləri o zamanın tələblərinə tam uyğun gəlir.

Jurnalın sonunda Xalq Maarif Komissarının 23 fevral 1943-cü il tarixli, 17- 2 mart 1943-cü il tarixli, 19 və 14 aprel 1943-cü il tarixli 873 nömrəli əmrləri də dərc edilmişdir.

"Tənqid və biblioqrafiya" rubrikasında Ə.Əbdürrəhimovun "Orta məktəbdə kimya dərslərini ölkə müdafiəsi ilə necə əlaqələndirməli", T.Cabbarlı "Məktəbdə matematika tədrisi və şagirdlərin hərbi işə hazırlığı", professor B.Pobedinski "Hərbi topoqrafiyanın əsas məsələlərinin öyrənilməsində orta məktəb rəsmxətt və matematika kursunun tətbiqi" kitabları haqqında qısa anonslar verilmişdir.

Beləliklə, ilk nömrə nəzərdən keçirildikdən sonra bu qənaətə gəlmək olur ki, "Azərbaycan məktəbi" öz qarşısında elə ilk nömrədən təhsilimizə kömək etmək məqsədini qoymuş və onun baş redaktorları R.Hüseynov, Ə.Ağayev, Z.Əliyevanın yaradıcı səyi ilə ən uzunömürlü mətbuat orqanı olmuşdur. O Azərbaycan pedaqogika elmi, pedaqoji fikrini də yaşatmış və onu inkişaf etdirmişdir. "Azərbaycan məktəbi" təbii ki, indiki "Azərbaycan məktəbi" ilə eyni deyildi. Bunu o vaxtkı və indiki məzmunlar da təsdiq edir. Çünki tələblər, vəzifələr dəyişib. Lakin təməl o vaxt qoyulubdu. "Azərbaycan məktəbi" bugünkü səviyyəsində öz sələflərinin layiqli, ardıcıl davamçısı kimi çıxış edir, elmi-nəzəri və pedaqoji jurnal kimi öz statusunu yenə də saxlaya bilir, mətbuatımız tarixinə yazdığı şərəfli, mütərəqqi ənənələri şərəflə davam etdirir.

***Rəyçi*: *prof. İ.İsayev***

## İstifadə edilmiş ədəbiyyat

1. "Azərbaycan məktəbi" jurnalı. 1943, №1.
2. "Yeni məktəb" jurnalı. 1924, № 1-3.
3. "Müəllimə kömək" məcmuəsi. 1930, №1.
4. Ağayev Ə. "Azərbaycan məktəbi" 50 ildə. Azərbaycan məktəbi, 1976, №10.
5. Rüstəmov F. Azərbaycan pedaqogikaşünaslığı. Bakı: Elm və təhsil, 2016.
6. Mərdandov M. Azərbaycan təhsil tarixi. II cild. Bakı, 2011.
7. Əliyeva Z. Xalq maarifimizin salnaməsi. Azərbaycan məktəbi, 1981, №4.

**Э.Мамедова**

**Первый номер журнала**
**"Азербайджан мектеби"**
**Резюме**

В статье повествуется о деятельности предшественниках журнала "Азербайджан мектеби" - "Ени мектеб" и "Муаллиме кёмек". А также говорится о журнале "Азербайджан мектеби", начавшего свое издание с 1943 года и о пройденном им историческом пути. В статье основное внимание сконцентрируется на первом номере журнала "Азербайджан мектеби".

**E.Mammedova**

**The first number of**
**"The Azerbaijani School" journal**
**Summary**

In the article it is spoken about the journals"The New School" and "The Teacher Aid", the predecessors of "The Azerbaijani School" journal. The history of "The Azerbaijani School" since 1943 is discussed. Special attention in the article is paid to the first number of "The Azerbaijani School" journal.

# TƏVAZÖKAR MÜƏLLİM

**Əli Vəliyev**

1926-27-ci illərdə “Şərq qadını” jurnalında – “Yasay”, “Yanlış intiqam” adlı hekayələr çıxırdı. Bu yazılarda bahar təravəti, bənövşə qoxusu duyulurdu. Əsər sahibinin isti və geniş qəlbə, dərin mühakiməyə, səlis dilə, zəngin təxəyyülə malik olduğu görünürdü. O zaman hələ çox gənc olan bu oğlanda yaradıcılıq qabiliyyəti, istedad, yazıçılıq, yazmaq və yaratmaq bacarığı, özünü göstərirdi.

1923-cü ildə Bakı Pedaqoji Texnikumunu bitirmiş bu gənc olduqca təvazökar və özünə qarşı həddindən artıq tələbkardır. Bu gənc Azərbaycan SSR Baş Soveti Prizidumunun fərmanı ilə əməkdar müəllim adını alan Mirəli Axundovdur.

15-16 il bundan qabaq ədəbiyyatla müntəzəm surətdə məşğul olan şirin, dadlı və maraqlı hekayələr yazan Mirəli indi başqa sahədə çalışır. Mirəli hansı sahədə çalışırsa müvəffəq olur. Bunun sirri ondan ibarət idi ki, o öz üzərində müntəzəm surətdə çalışır, loğalanmır, öz əməyindən həzz alır. Mirəli yaxşı bilir ki, öz yaratdığından razı, öz yaradıcılığının yüksək nöqtəyə çatdığını iddia edən hər bir sənətkar yüksək inkişafdan məhrumdur. Bu nöqteyi-nəzərdən Mirəli Axundovun keçdiyi həyat yoluna nəzər saldıqda onun həmişə boy atdığını, yüksəldiyini, yaxşı bar verdiyini görürük.

Azərbaycan Dövlət Darülfününunu bitirdikdən sonra biliyini artırmaq, məlumatını təkmilləşdirmək və yaxşı alim olmaq üçün Moskvada İkinci Darülfününunun aspiranturasına daxil olmuş və burada biologiya elmləri namizədi rütbəsini almışdır.

1935-ci ildən bu vaxta kimi Kirov adına Azərbaycan Dövlət Darülfünununda işləyir, hazırda biologiya fakültəsinin dekanı, “Genetika və Darvinizm” kafedrasının müdiridir. Mirəli Axundovun 40 yaşı vardır. Yaşının tən yarısını müəllimlikdə keçirmişdir. O, müəllimliyini çox sevir, təlim-tərbiyəyə verdiyi yüzlərcə tələbələr, indi orta məktəblərdə dərs verir, cəbhələrdə qəhrəmanlıqla vuruşur, elmi müəssisələrdə tədqiqat işləri aparır. “Darvinizmin bəzi məsələləri”, iki hissədən ibarət “Darvinizm” (ali məktəblər üçün dərs kitabı), “Təkamül təliminin terminologiyası” kimi əsərlər Mirəli qələmindən çıxmışdır.

Bu çalışqan alim, həm də çox həssas insandır. Onu həm müəllim yoldaşları, həm də tələbələr çox sevir. Mirəli Axundov yalnız dərs verməklə kifayətlənmir, o, müxtəlif jurnalların daimi mühərriridir. Azərbaycan jurnallarında müntəzəm iştirak etdiyi kimi, Moskva jurnallarında da elmi və nəzəri məqalələr yazır.

Mirəli yaradıcılığı vətən müharibəsi günlərində həm genişlənmiş, həm də dərinləşmişdir. O, “German faşizminin irqçilik nəzəriyyəsi və onun ifşası” əsərindən sonra mühüm bir məsələ ilə ciddi surətdə məşğul olmaqdadır. Çoxdan bəridir ki, Azərbaycanda heyvandarlıq təsərrüfatına böyük zərər vuran qara ciyər xəstəliyi və onunla mübarizə yolları Mirəli Axundovu düşündürürdü. Müharibə dövründə qəhrəman Qızıl Orduya və arxadakı vətənpərvərlərə çoxlu ət, yağ, süd, pendir lazım olduğu kimi yun, dəri, gönün də nə qədər əhəmiyyətli olduğunu Mirəli başa düşür. Bunun üçün də o, 7 mindən artıq heyvan yarmış və tədqiqat işləri aparmışdır. Laboratoriya işində gözəl nəticələr əldə edilmişdir. Ancaq bu,hələ işin başlanğıcıdır. Mirəli təcrübəvi olaraq Xaçmaz rayonunda bu xüsusda bəzi işlər gördü.

Bu il Mirəli Axundov Darülfünunun elmi sessiyasında bu xüsusda elmi məruzə söylədi. Sessiyada iştirak edən bütün professorlar, elmi işçilər və müəllimlər onun məruzəsinə məftun oldular. Mirəli Axundov bu məruzəsilə nə qədər irəlilədiyini, yüksəldiyini və inkişaf etdiyini bir daha göstərdi.

Mirəli Axundovun yaxşı cəhətləri çoxdur. Biz onların haımsını saymaq fikrində deyilik. Yalnız onun həssas insanlığını, təvazökarlığını və özünə qarşı tələbkar olduğunu bir daha qeyd etməliyik. Belə ki, özünə tələbkar olan insanlar həmişə irəliləyir və inkişaf edir.

Tarix göstərir ki, yüksək məlumat və dərin elm sahibləri həmişə təvazökar və özünə qarşı tələbkar olan insanlardır. Hətta atalar sözündə deyilir ki, “ağac bar gətirdikcə başını aşağı əyər”. Mirəli Axundov da barlı və meyvəli ağac kimi həmişə başı aşağıdadır. O, çox təvazökardır. Bu qədər yüksəlməsi və inkişaf etməsinə əsas səbəb də onun təvazökarlığıdır.

Azərbaycan hökumətinin ali mükafatı ona, o da bu mükafata layiqdir.

Biologiya elmləri kandidatı, Azərbaycan SSR əməkdar müəllimi Mirəli Axundova gələcək işlərində böyük müvəffəqiyyətlər arzu edirik.

**“Azərbaycan məktəbi”, 1943, № 1-2**



# NATİQLİK HAQQINDA FRAQMENTAL DÜŞÜNCƏLƏRİMİZ

**Vaqif Qurbanov,**
***pedaqogika üzrə elmlər doktoru***

**"O şey ki bizlərə lap aşikardır,**
**Onda da gizli bir xəzinə vardır".**
**Nizami Gəncəvi**

***Açar sözlər:*** *natiqlik, başlıca amil, maraq, çatdırmaq, ümumilpəşdirmə, keyfiyyət, nəticə, biliyin qiymətləndirilməsi, son nəticə.*

***Ключевые слова:*** *ораторство, главный фактор, интерес, довести, обобщения, качество, результат, оценка знаний, окончательная результать.*

***Key words:*** *oratory, basic factor, interest, to generalize, deliver, quality, result, valuing of the knowledge, last word.*

"Natiqlik haqqında fundamental düşüncələrimiz" adlı məqaləyə giriş məqsədilə dillərdə dastan olan belə bir məlum fikirlə başlayaq: "Söz nitqin əsasıdır," – "Слово –речи основа".

Bəs sözün gücü, qüdrəti nədədir? sualına hər kəs cavab verə bilməz. Deməli, natiqlər sözə qiymət verməyi bacaran insanlardır. N.Gəncəvi sözü "gözəllik", M.Füzuli "şahanə inci", S.Vurğun "dahilərin eşqi" adlandırmışdır. M.Ə.Sabir "Söz" şeirində sözü "göylərin günəşi" adlandırmışdır. O yazırdı ki, söz həqiqət nurudur və bütün zərrələr öz ziyasını sözdən alır. Söz insanlıq aləminin gülşəninə mənəvi səadət, feyz, xeyir-bərəkət gətirir. Söz fikrin ildırımı, qəlbin parıltısı, xəyalın işığıdır. Həmin fikir nəzmlə belə səslənir:

Ey söz, nola, dersəm sənə xürşidi-səmavat,
Səndən alıyor nurü-ziyayi həmə zərrat.
Bir nuri- həqiqətsən, edib həq səni nazil
Kim, bəxş edəsən gülşəni-nasütə füyuzat (2).

Hər bir xalqın öz qəhrəman övladları- igid oğul və qızları olduğu kimi, onların içərisində iti zehni, parlaq nitqi və dərin zəkası ilə parlayanları da var. Azərbaycan xalqının tarixində A.Bakıxanov, M.F. Axundzadə, Ə.Hüseynzadə, M.Ə.Rəsulzadə, N.Nərimanov, M.Rəfili, Ə.Sultanlı, Ş.Qurbanov fenomen natiqlər sayılırlar.

XX əsrdə Azərbaycan səmasında Heydər Əliyev ulduzu parlamış və xalqın üzərinə şəfəq saçmışdır. Ulu öndər tarixə həm də hikmət xəzinəsi saçan parlaq nitqi ilə düşmüşdür. "Mədəniyyəti yüksək olan xalq həmişə inkişaf edəcək", "Hər bir xalqın milliliyini, mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən onun dilidir" (1) deyən o böyük azərbaycanlı öz zəmanəsinin görkəmli natiqlərini heyrətdə qoyan aydın bir dillə danışırdı. O, müdrik qərarları ilə yanaşı, dünya natiqliyinə parlaq nitqi, habelə dilin keşiyində duran bənzərsiz şəxsiyyət və böyük mütəfəkkir kimi düşmüşdür.

Ulu öndər siyasi və hüquqi natiqlikdə əvəzedilməz şəxsiyyət idi. Onun nitqində polad kimi möhkəm məntiq vardı. Alimlərimiz öz çıxışlarında ulu öndərin nit-

qinin akademik səviyyəsindən necə bəhrələndiklərindən həvəslə danışırlar...

Akademik natiqlik tələbələr, magistrlər, müəllimlər, alimlər qarşısında elmi üslubda səslənən və özünəməxsus cəhətləri ilə xarakterizə olunan məharətli nitq növüdür.

Akademik natiqlikdə mövzu və problem sırf elmi arqumentlərin sayəsində analitik təfəkkürün məhsuluna çevrilir. Odur ki, alim – natiq adını doğrultmaqdan ötrü humanitar və planetar düşüncə tərzinə yiyələnməklə yanaşı, nitq normalarının düzgünlük, dəqiqlik, aydınlıq, səlislik, məntiqilik, yığcamlıq, orijinallıq, ifadəlilik və s. kimi amillər kompleksini öz məharət arsenalına daxil etməlidir.

Bu mövzuda başlıca amillər kompleksini nəzərdən keçirək:

1. Akademik natiqin hər bir elmə (təbiət, texniki, humanitar) məxsus ümumi cəhətlərə, o cümlədən fəlsəfəyə bələd olması təbiidir. Çünki bu cəhət onun funksioloji vəzifəsinə daxildir.

Bizə elə gəlir ki, elm sahəsindən və ixtisasından asılı olmayaraq, alim fəlsəfi anlayışlardan dürüst şəkildə baş çıxarmalıdır. Böyük yunan filosofu Aristotel 335-ci ildə "Ritorika" kitabını yazana qədər "Kateqoriyalar", "Estetika", "Etika", "Poetika" və s. kitablarını yazmışdı. Bizim bu gün haqqında danışdığımız akademik natiqliyin də fəlsəfəsini şərh etməkdən ötrü üzümüzü ya gərək Aristotel əsərlərinə və yaxud da onun ideya ardıcıllarının (İbn Sina, Bəhmənyar, N.Tusi) idrak nəzəriyyəsinə çevirək.

2. Metodologiyanı həm idrakın, həm də təlimin əsası, dəyərləndirmə və şərhetmə meyarı hesab edirlər. Aydın ideya istiqaməti, yolu olan alimlər metodoloqlar adlanırlar. Metodoloq alim öz nitqinə fəlsəfi aspektdən qiymət verməklə başlayır. Onun nitqində müvafiq mövzunun fəlsəfi əsasları xüsusi mövzuya çevrilir.

Son bir neçə ildə bu məsələ ali təhsildə xeyli aktuallaşıb. Misal üçün, institut, universitet və s. strukturlardan təkmilləşməyə və yaxud da ixtisasartırmaya göndərilən müdavimlər tələb edirlər ki, onların qarşısında ideya generatorları, animatorları və moderatorları çıxış etsinlər. Dəvət olunan alimlər humanitar elmlərdə aparıcı nəzəriyyələrin tarixi təkamülü və cəmiyyətin inkişafında alimlərin rolu, Azərbaycan alimlərinin dünya elmində mövqeyi, idrakın və təlimin metodlarından istifadə, yaxud da modern təfəkkürün nəticələri - Milli Təhsil Konsepsiyası (Milli Kurikulum), interaktiv və inteqrativ təlim və s. barədə problemli mühazirə söyləsinlər. Kibernetik və tarixçi natiqlər öz mühazirələrini XXI əsrin tələbi ilə elmi idarəetmə və tətbiqetmə elminin stukturuna uyğun qursunlar.

Dilçi natiqin mövzusu əgər konkret olaraq "dillərin zənginləşməsi"dirsə, o, mütləq fəlsəfi ümumiləşdirmələrini müvafiq tezislər üzərində quraraq deməlidir: "Ədəbi dilin zənginləşməsi ünsiyyətin dinamik xarakter alması hesabına baş verir. Yəni bir dil öz mövcud sözlərindən istifadə ilə dinamik inkişafa çevrilirsə, bu, onun artma, çoxalma, yenisini yaratma imkanlarını zənginləşdirir.

3. İxtisasartırma kurslarında filoloq dilçi natiqi bütün elm və ya fənn sahəsindən olan müəllimlər maraqla dinləmək istəyirlər. Son illərin müşahidələri göstərir ki, təkmilləşdirmə kurslarında dinləniləcək mühazirələr müdavimlərin rəyi əsasında proqramlaşır. Müdavimlər öz rəylərində daha çox xalqımız tərəfindən tanınan alimlərdən filoloji nitqlər dinləmək istəyirlər. Çünki onların öz mühazirələrini interaktiv formalarda və məzmunda debat, diskussiya-dialoq metodları əsasında qurmaları, xüsusən də alimləri fikir söyləməyə,

məsələyə münasibət bildirməyə imkan yaratmaları ali təhsil müəssisələrindən gələn alimləri xüsusilə razı salır.

Müasir natiqin məharəti təhlil olunan məsələ ətrafında deyilənləri ümumiləşdirmə qabiliyyəti ilə ölçülür. Bu cəhət nəinki akademik mühazirələrə, eyni zamanda orta, orta ixtisas və ali təhsildə müəllimin şərhinə də aiddir.

Parlaq nitq sahiblərindən mühazirələrə ciddi hazırlıq tələb olunur. Misal üçün, alim-natiq əgər humanitar ixtisaslıdırsa, mühazirələrində dəqiq elmlərdən danışarkən ehtiyatlı olmalı, hökmlərində, mülahizələrində diletant təsəvvürü yaratmamalıdır.

Ərəb-fars dillərini incəliklərinə qədər bilməyən, yalnız eşitdiklərinə əsasən hökm verən alimin dəfələrlə fakt qarşısında qoyulduqlarının şahidi olmuşuq. Belə vəziyyətə düşməmək üçün natiqin dəqiqlik prinsipinə əməl etməsi tələb olunur. Bu prinsip düzgünlük, dəqiqlik norması kimi akademik natiqlikdə xüsusilə gözlənilməlidir.

Eyni zamanda siyasətşünas, dilşünas və ya hüquqşünas ixtisaslı akademik natiqlərə də haşiyəyə çıxmalarında, improvizələrində uzunçuluq etməmək tövsiyə olunur. Üslubu dəyişməklə dinləyicidə improvizə ilə maraq yaratmaq istəyən natiq boşboğaz yunan natiqlərinin tarixi səhvlərini təkrar etməməlidir. Görkəmli natiq Şıxəli Qurbanov deyirdi ki, yunan–Roma natiqləri Demosfen, Sisserondan hüquq və siyasət natiqliyini öyrənək, ancaq dinləyiciyə məlum olan, qulaqları deşən şablon xarakterli frazalar işlətməyi yox.

4. Dahi Nizaminin dövründə də məlumu deyənlərə münasibət sərt olmuşdur. Şair "məlumu deməkdən kimə fayda var?" hikmətini bu məqsədlə yazmışdır.

Təkrarlar standartların yaranması və ənənəyə çevrilməsidir. Odur ki, alim-natiq hər il öz nitqini eyni cür qurursa, öz fənni və ya oxuduğu mühazirə mövzusu barədə dərindən düşünmürsə, necə deyərlər, yerində sayır; beləliklə, bakalavrda dediklərini magistraturada da təkrar edir. Bu, yolverilməzdir. Akademik natiqlikdə dahi Nizaminin elmlə bağlı hikmətlərindən (biologiyaya, astronomiyaya, fizikaya, riyaziyyata dair aforizmlərindən sübut məqsədilə) istifadə edilməlidir.

"Öyrənmək, öyrənmək, yenə də öyrənmək" – deyən humanitar düşüncə sahibləri dilindən, dinindən, milli mənsubiyyətindən asılı olmayaraq, bəşəriyyətə məxsus zəka sahibləridir. Onların peyğəmbərcəsinə söylədikləri insanları yeni-yeni anlayışlarla silahlandırmışdır. Bu mənada dərslərdə Aristotel, Platon, Sokrat, İbn-Sina, Nəsirəddin Tusi, Şeyx Sədi, Nizami Gəncəvi və başqa görkəmli şəxsiyyətlərdən gətirilən sitatlar və ya iqtibaslar nitqi məzmunlu etməlidir.

Əlbəttə, akademik natiqin öz dinləyiciləri qarşısında yaradıcılığından dəm vurması (o nə qədər böyük alim olsa belə) həssas dinləyicini razı salmır. AMEA-nın müxbir üzvü N.Cəfərov demişkən: "Akademik natiq elmdən danışmalıdır, özündən yox".

Yeri gəlmişkən, burada Nizami müəllimlə bu barədə keçirdiyimiz söhbəti xatırlatmaq yerinə düşərdi:

V.Q.: Nizami müəllim, Siz Azərbaycan dilindən, Heydər Əliyevin dil siyasətindən danışdınız, iqtibaslar etdiniz, şərhlər verdiniz, lakin kitablarınızın adını çəkmədiniz.

N.C.: Mən Tofiq Hacıyevin, Ağamusa Axundovun, Rafael Hüseynovun yazdıqlarını dedim, ulu öndərin dil siyasətinin ideya istiqamətlərinə ümumiləşmiş qiymət verməyə çalışdım.

V.Q.: Ona görə də müdavimlər Sizi dinləmək istədilər. Öz müəllimləriniz olan Mir Cəlal Paşayev və Muxtar Hüseyn-

zadənin qətiyyətli çıxışlarından, eyni zamanda son dərəcə təvazökarlıqlarından həm yazır və həm də danışırsınız. Bunlar mənim ürəyimdən xəbər verir.

Ancaq heç də bütün alimlər öz müəllimlərindən danışmırlar. Özlərindən danışırlar. Kitablarını tərifləyir, orada qaldırdıqları məsələni kəşfə bərabər yenilik hesab edirlər.

N.C.: -Təəssüf ki.

V.Q.:Rafiq Əliyev də heç vaxt özündən danışmadı. Lütvi Zadədən danışdı. İdarəetmə elmindən danışdı. Çingiz Abdullayev detektiv romanlarından danışdı, özündən yox.

N.C.: Elə də olmalıdır. Bilirsinizmi, müəllim-natiq alimliyi ilə fəxr etməli deyil; çünki onun da bilmədikləri çox olur. O, daima müdriklərdən öyrənməyi tövsiyə etməli və dahi Füzulini nümunə göstərməlidir. Füzuli deyirdi: “İlahi, könlümə hər elmdən bir pay ver, bilirsən ki, mənim könlüm müəllimdir, mənəm tiflidəbistani”.

Yaxud dahi şair hikməti, həqiqəti, müəmmanı öyrənməyə can atmağın vacibliyini hamıya məsləhət görər və deyərdi:

Güman etmə hər hikmətdən xəbərdar idi Əflatun,

Həqiqət elmdən agah alim sanma sən Loğmanı.

V.Q.: Akademik natiqlikdə hər bir müddəa, hər bir mülahizə, hər bir hökmün əsasında idrakın qanunları dayanmalıdır.

Natiqin özünə gün kimi aydın olmayan fikirləri, əslinə müvafiq olmayaraq şərh etməsi yolverilməzdir. Alimlərimiz dahi Füzulinin humanitar qayəli fikirlərini çox vaxt öz bildikləri kimi şərh edərək elmi səhvlərə yol verirlər. Onlar Füzulinin “Söz” qəzəlinin ikinci beytini səhv izah edirlər:

Artıran söz qədrini sidq ilə qədrin artırar
Kim, nə miqdar olsa, əhlin eylər ol miqdar söz.

Burada “kim” sözünün əvəzlik deyil, bağlayıcı olduğunu göstərmək fikrin daha düzgün çatdırılmasını təmin etmiş olur.

Görkəmli ədəbiyyatşünas alim M.Əsgərov bu beytin şərhini belə verir: “Çünki söz nə qədər qiymətli olsa, bir o qədər əhlinin (yəni onu danışığında işlədənin) qiymətini və hörmətini artırar”.

N.C.: Nitqdə diferensiasiya olunanlar inteqrasiya edilərək ümumiləşdirilməlidir. Akademik natiqlikdə dilin fəlsəfəsinin materialist, idealist və yaxud da metafizikcəsinə yozumlarına da bələdlik vacib şərtdir. Məsələyə sofist və ya monist baxışlar antik yunan filosoflarının nəzəriyyələrində var. Odur ki, akademik natiqdən müntəzəm mütaliə əsasında dərin düşüncə tələb edilir. Qədim dövrlərdə bütün məlum elmlər fəlsəfə elmindən ehtiva olunardı. Eyni zamanda, ana dili dilin qayda-qanunlarına və bu dildə yaradılan ədəbiyyata birlikdə deyilərmiş. Əslində elə indi də elə olmalıdır. Ana dili deyəndə biz gərək dilimizi və ədəbiyyatımızı birlikdə nəzərdə tutaq. Ədəbiyyat dilin ifadə formasıdır. Eyni zamanda bu günün natiqliyində başlıca istiqamət ideya istiqaməti olmalıdır. Filoloq da, tarixçi də, filosoflar da öz elmi mülahizələrində gənclərə vətənpərvərlik, qəhrəmanlıq çağırışları ilə müraciət etməli, onlara böyük Cavidin bu sözlərini inamla xatırlatmalıdır:

Gücsüz tanrıdansa güclü qəhrəman,
Hörmətə, təzimə layiq hər zaman!

V. Q.: Mühazirə metodikası interaktiv aparılmalıdır. Halbuki çox vaxt bu, belə olmur. Bu prosesdə müəllim fəal olursa, tələbə qeyri-fəal qalır. Müəllim elmi hökmlərini mənbələrə, məxəzlərə, mülahizələrə, ideyalara istinadən deyil, kitabdan köçürdükləri əsasında vermiş olur.

Konkret desək, “Qarabağ problemi ilə üz- üzə” mövzusunda mühazirənin motivasiyası və aparılması ardıcıllığı belə olma-

lıdır:

1. Psixoloji ovqat yaradılır və mövzu dinləyicidən alınır;

2. Mövzudan irəli gələn əsas ideya müəyyənləşdirilir;

3. İdraki suallarla mühazirədə toxunulacaq "açar" məsələlər göstərilir (Azərbaycan torpaqları, mübarizə əhvali-ruhiyyəsi, Qarabağ düyünü, ümidin əsgərlərimizə olması, komandana inam və s.).

4. Tələbələrə qeydlər götürmək və sual vermək hüquqları xatırladılır;

5. Sual-cavab dəqiqəsi keçirilir (bunlar əks-əlaqə istiqamətində qurula bilər) və s. və mövzu ilə bağlı açıqlanmış məsələlər (məzmun) ümumiləşdirilir.

Qeyd edək ki, bu yol müəllimin (natiqin) elmi potensialını da, səriştəsini də göstərər, tələbələrin dinləyib-anlama, dərketmə, sualvermə, söhbətəqoşulma mədəniyyətini də təkmilləşdirmiş olar. Yeri gəlmişkən, Qərb təhsilində mühazirə metodologiyası məhz belə qurulur.

Rusiya Federasiyası lisey, gimnaziya, seminariya, kollec və s. təhsil müəssisələrində akademik mühazirələr keçirildiyindən, eyni zamanda alimlərin öz metodikalarından, inkişafetdirici və tərbiyəedici innovasiyalardan istifadə etdiklərindən "Народное образование" jurnalının nömrələrində silsilə yazılar dərc olunur.

Son illərdə ali təhsil müəssisələrində nitq mədəniyyətinə dair tədris, elmi-metodik konpaniyaların keçirilməsi bu sahədə görülən işləri canlandırmışdır. Bu kimi tədbirlərin də televiziyanın "Mədəniyyət" kanalı ilə nümayiş etdirilməsi də bu qəbildəndir. Çünki gələcəyin alim natiqləri, yəni müəllim–natiqlər bu yolla təkmilləşməli və ixtisaslaşmalıdır.

***Rəyçi: prof. N.Abduallayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili. Bakı: Elm, 1998.

2. M.Ə. Sabir. Hophopnamə. II cild. Bakı: Şərq-Qərb, 2004.

3. Əsgərov M. Natiqlik sənətinin əsasları. Bakı: Maarif, 1985.

4. Əhmədov Ş. Mühazirəçilik məharəti, natiqlik sənəti. Bakı: Gənclik, 1985.

5. Qurbanov V. Natiqlikdə başlıca amillər. Azərbaycan Müəllimlər İnstitutunun "Xəbərləri". Bakı: Müəllim, 2008.

**В.Курбанов**

**Фрагментарные мысли о риторике**

**Резюме**

В статье конкретно раскрываются все комплексы требований, относящиеся к этому виду ораторства, поднимаются вопросы, высказываются мнения и предлагаются конкретные направления для улучшения преподавания в институте.

**V.Qurbanov**

**Fragmented thoughts about rhetoric**

**Summary**

In this (article) all complexes of requirements conserning to this kind of speaking are particularly opened, questions rise, opinions express and concrete directions in this area improvement of teaching in institute are offered.

# 70 İL PEDAQOJİ ELMİN KEŞİYİNDƏ

Azərbaycanda pedaqoji elmin inkişafında böyük xidmətləri olan görkəmli alim-pedaqoq, SSRİ PEA-nın müxbir üzvü, Rusiya Dövlət Təhsil Akademiyasının xarici üzvü, Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının, Pedaqoji və Sosial Elmlər Akademiyalarının həqiqi üzvü və Azərbaycan Milli Yaradıcılıq Akademiyasının akademiki, Azərbaycan Respublikasının Əməkdar ali məktəb işçisi, SSRİ-nin və Azərbaycan SSR-nin maarif əlaçısı, prezident təqaüdçüsü, pedaqoji elmlər doktoru, professor Hüseyn Mustafa oğlu Əhmədov 70 ildir ki, bütün qüvvə və bacarığını Azərbaycanda məktəb və pedaqoji fikir tarixinin hərtərəfli tədqiqi və təbliğinə, pedaqoji və elmi-pedaqoji kadr hazırlığına həsr edir. O, ibtidai məktəb müəllimliyindən akademikliyədək mənalı və şərəfli həyat yolu keçmiş, qəlbinin odunu və hərarətini, ömrünün qaynar və coşğun illərini millətin gələcəyi olan gəncliyin tərbiyəsinə həsr etmiş, fundamental elmi əsərlər yazmış, proqram və dərsliklər hazırlamış, pedaqoji fikir və məktəb tariximizdə hələ durulmamış başlıca məsələləri zəngin dəlillər, məntiqi mühakimə ilə aydınlaşdırmış, özünün elmi məktəbini yaratmış, sağlığında ikən özünə mənəvi abidə ucaltmışdır.

Hüseyn Əhmədov 1926-cı il iyulun 17-də Qərbi Azərbaycan torpağı olan qədim Göyçə mahalında – Krasnoselo rayonunun Toxluca kəndində anadan olmuşdur. O, 1932-ci ildə arzuların sorağında, xəyalların qanadında I sinfə qədəm qoymuşdur. Sevinc və fərəhlə VIII sinfi bitirən Hüseyn çox keçmir ki, həyatın sərt və amansız sınağı ilə üzləşir. Böyük bir nəslin gəncliyini və gələcəyini məhv edən 40-cı illərin müharibə alovu, yaşıdları kimi onun da arzusunu qarsıdır. Böyük bir ailənin başçısı və ümid çırağı Mustafa kişi İrəvan yaxınlığında düşmən tankı əleyhinə xəndək və səngər qazmağa səfərbər olunur. Böyük qardaşları isə milyonlarla insanlara ölüm və fəlakət gətirən, günahsız insanların ah-naləsinə çevrilən müharibənin ön cəbhəsinə göndərilir. 1941-



ci ilin soyuq oktyabr ayı onların qapısını acı xəbərlə döyür… Atasını vaxtsız itirir, niskilli-kədərli günlər yaşayır. Belə bir ağır gündə yalnız ana məhəbbətinə, ana təsəllisinə, ana istisinə sığınan Hüseyn çox erkən əmək fəaliyyətinə başlamaq məcburiyyətində qalır. Ailəni dolandırmaq üçün kolxozda çalışır. Hələ orta məktəbin X sinfində oxumalı olarkən, fəhmini və bacarığını nəzərə alaraq 1943-cü ilin sentyabrında doğma kəndlərindəki məktəbə sinif müəllimi və V-X siniflərdə erməni dili müəllimi təyin edilir. Bu işdə 1946-cı ilə qədər işlədikdən sonra pedaqoji məktəbə daxil olmaq məqsədilə Qazaxa gəlir. Arzusunu burada reallaşdıra bilmir. Gəncə şəhərinə gələrək K.Setkin adına Pedaqoji Texnikumun son (III) kursu-

na qəbul olunur. 1947-ci ildə texnikumu əla qiymətlərlə bitirən Hüseyn həmin ildə H.Zərdabi adına Gəncə Pedaqoji İnstitutunun tarix fakültəsinə qəbul olunur. Təhsil illərində ictimai fəallığına və əla qiymətlərlə oxuduğuna görə ona II kursdan Lenin komsomolu təqaüdü verilir. 1951-ci ildə institutu bitirən Hüseyn Əhmədov gənc kadr kimi orada saxlanılır. O, həm də toxuculuq və pambıqçılıq texnikumlarında müəllimlik edir.

Elmə böyük həvəs göstərən Hüseyn təhsilini davam etdirmək üçün 1952-ci ildə Bakı şəhərinə göndərilir və V.İ.Lenin adına APİ-nin (ADPU) o zamanlar elmi-pedaqoji kadr hazırlığında respublikada yeganə mərkəz sayılan pedaqogika kafedrası nəzdində aspiranturaya qəbul olunur. Azərbaycanın məşhur alim-pedaqoqlarının, o cümlədən professor Əhməd Seyidov, Mehdi Mehdizadə, Mərdan Muradxanovun çalışdığı həmin kafedrada namizədlik dissertasiyası üzərində işləyir. Elmi rəhbəri Ə.Seyidovla hər bir görüşü zamanı gənc aspirant nəinki elmi biliyə yiyələnir, həm də daxilən zənginləşir, ünsiyyət məktəbi keçirdi. 1958-ci ildə "İbtidai məktəb şagirdlərinin kommunist əxlaqı tərbiyəsində nümunənin rolu və ondan istifadə etmək yolları" adlı namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edir. Hüseyn Əhmədovun qələminin ilkin məhsulu olan həmin dissertasiya işi o zamanlar akademik A.Makovelski, professor B.Komarovski, professor M.Muradxanov, dosent D.Mustafayeva tərəfindən yüksək qiymətləndirilir.

Hüseyn Əhmədov 1955-1956-cı illərdə V.İ.Lenin adına APİ-nin komsomol komitəsinin birinci katibi, 1957-ci ildə Azərbaycan ETPEİ-də kiçik elmi işçi vəzifəsində işləyir. 1958-ci ildən H.Əhmədovun elmi-pedaqoji fəaliyyətinin bütöv bir mərhələsi ADPU-nun pedaqogika kafedrası ilə bağlı olmuşdur. O, pedaqogika kafedrasında assistent, baş müəllim, dosent və professor (1977) vəzifələrində çalışaraq respublika ümumtəhsil məktəbləri üçün yüksək ixtisaslı müəllim kadrlarının hazırlanmasında yaxından iştirak etmiş, bir müddət 1974-1977-ci illərdə APİ-də orta məktəb müəllimlərinin ixtisasartırma fakültəsinin dekanı (1974-1977-ci illərdə) vəzifəsində çalışmışdır. Həmin fakültənin qabaqcıl iş təcrübəsi o vaxtlar Respublika Maarif Nazirliyi, SSRİ Maarif Nazirliyi tərəfindən bəyənilmiş, bu barədə mətbuatda xeyli məqalələr dərc edilmişdir.

H.Əhmədov 1972-ci ildə Azərbaycan Dövlət Universitetində (indiki BDU) "XIX əsrdə Azərbaycanda məktəb təhsilinin inkişaf tarixi" mövzusunda doktorluq dissertasiyası müdafiə edir. Professor Hüseyn Əhmədov uzun müddət respublika "Bilik" cəmiyyətinin üzvü, sonralar isə Pedaqogika bölməsinin sədr müavini və sədri kimi təkcə Azərbaycanda deyil, həm də Gürcüstan və Ermənistan Respublikalarında yaşayan azərbaycanlılar arasında pedaqoji biliklərin yayılması və təbliği sahəsində xeyli və məhsuldar işlər görmüşdür. Bu sahədəki xidmətlərinə görə H.Əhmədov 1985-ci ildə SSRİ "Bilik" cəmiyyəti idarə heyətinin qərarı ilə "Fəal işinə görə" döş nişanı ilə təltif edilmişdir. Hüseyn Əhmədov uzun müddət ADPU-da fəaliyyət göstərən ixtisaslaşdırılmış dissertasiya Şurasının sədri və müavini olmuşdur. Professor Hüseyn Əhmədov 35 ildən artıq bir müddətdə ADPU-nun ümumi pedaqogika kafedrasına rəhbərlik etmişdir. Bu müddət ərzində o, kafedra əməkdaşlarına qarşı olduqca səmimi, qayğıkeş, alim kimi tələbkar və məsuliyyətli olmuş, kollektivdə səfərbəredici ruh və işgüzar mühit yaratmağa nail olmuşdur.

Onun elmi-pedaqoji fəaliyyəti dövlət və hökumət tərəfindən yüksək qiymətləndirilmişdir. O, 1973-cü ildə Azərbaycan SSR-

nin “Qabaqcıl maarif xadimi”, 1977-ci ildə “SSRİ Maarif əlaçısı” döş nişanı ilə, müxtəlif vaxtlarda Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin, SSRİ Maarif Nazirliyinin, ÜİHİMŞ-in, SSRİ PEA-nın Fəxri fərmanları ilə təltif edilmişdir.

Professor H.Əhmədova elmin inkişafında, yüksək ixtisaslı elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə 1981-ci ildə “Azərbaycan SSR Əməkdar ali məktəb işçisi” fəxri adı verilmişdir. O, həmçinin SSRİ Ali Soveti Rəyasət Heyətinin fərmanları ilə “Böyük Vətən müharibəsində rəşadətli əməyə görə” medalları ilə təltif edilmişdir. Azərbaycan komsomolunun, “Bilik” cəmiyyəti və respublika müəllimlərinin bir sıra qurultaylarının nümayəndəsi olmuşdur. Professor Hüseyn Əhmədov təkcə Azərbaycanda deyil, keçmiş SSRİ-də də yaxşı tanınan nüfuzlu alimlərdəndir. Məhz bunun nəticəsidir ki, o, 1990-cı il dekabrın 20-də SSRİ Pedaqoji Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. Xatırlatmaq yerinə düşər ki, varlığı ərzində həmin akademiyaya (1943-cü ildə yaradılıb) cəmi 4 nəfər azərbaycanlı üzv seçilmişdir. Mərhum akademik M.Mehdizadə onun həqiqi üzvü, A.Abbaszadə, S.İmanov və H.Əhmədov isə müxbir üzvləri olmuşlar.

Hüseyn Əhmədov 1993-cü il mayın 19-da Azərbaycan Milli Yaradıcılıq Akademiyasının həqiqi üzvü (akademiki), 1993-cü il iyunun 18-də Moskvadakı Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının, 1995-ci il 12 iyunda Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü (akademiki) seçilmişdir. 1998-ci ildə elmi-pedaqoji sahədəki yaradıcılıq uğurlarına, elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə Beynəlxalq Pedaqoji Akademiyanın Y.Komenski adına Böyük Qızıl Medalı ilə təltif olunmuşdur. 1999-cu ildə isə Rusiya Dövlət Təhsil Akademiyasının xarici üzvü seçilmişdir. Hüseyn Əhmədov 2005-ci ildə Türk Dünyası Araşdırmaları Uluslararası Elmlər Akademiyası tərəfindən “Türk Dünyasına Hizmet” qızıl medalı ilə təltif olunmuşdur. 2006-cı ildə Amerikanın Beynəlxalq Ekspertiza və Bioqrafik Tədqiqatlar İnstitutu Hüseyn Əhmədova pedaqogika elmindəki yüksək xidmətlərinə görə xüsusi sertifikat təqdim etmiş, onu pedaqogika elminin bilicisi hesab etmişdir. 2007-ci il akademik H.Əhmədov üçün daha uğurlu olmuşdur. O, Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin sərəncamı ilə Azərbaycanda təhsilin inkişafındakı böyük xidmətlərinə görə Prezidentin fərdi təqaüdünə layiq görülmüş, Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin “K.Uşinski” medalı, həmçinin Rusiyanın “Dolq i çestğ” ordeni ilə təltif olunmuş, Rusiya Təhsil Akademiyasının qızıl medalına və fəxri fərmanına layiq görülmüşdür. Hüseyn Əhmədov elmi-pedaqoji fəaliyyətində nailiyyətlər, uğurlar qazanmış, müxtəlif akademiyaların üzvü seçilməyi ilə şöhrətin uca, həmçinin də şərəfli bir mərtəbəsinə yüksəlmişdir. Akademik Hüseyn Əhmədov məhsuldar, yaradıcı, geniş erudisiyaya malik zəhmətkeş pedaqoqdur. Onun elmi-pedaqoji fəaliyyəti zəngin və çoxşaxəlidir. İndiyə kimi 200-dən artıq elmi əsəri, 300-dən çox qəzet məqaləsi, ümumilikdə isə 25 cildlik seçilmiş pedaqoji əsərləri nəşr edilmişdir ki, onlardan da 3 cildi rus dilində yazılmışdır.

Akademik Hüseyn Əhmədovun elmi tədqiqatlarının mövzu və istiqamət-lərini aşağıdakı kimi qruplaşdırmaq olar: 1) pedaqogikanın nəzəri problemlərinin araşdırılması; 2) Azərbaycanda pedaqoji fikir tarixinin tədqiqi; 3) Azərbaycanda məktəb tarixinin tədqiqi; 4) xarici ölkələrin məktəb və pedaqoji fikir tarixinin tədqiqi və təbliği. Akademik Hüseyn Əhmədovun elmi fəaliyyətində pedaqogikanın nəzəri problemlərinin araşdırılması mühüm yer tutur. O, elmi yaradıcılığa tərbiyəşünaslığın mühüm

problemlərinin tədqiqi ilə başlamışdır. O, ilk yaradıcılıq uğuru olan "İbtidai məktəb şagirdlərinin kommunist əxlaqı tərbiyəsində nümunənin rolu və ondan istifadə etmək yolları" (1958) adlı namizədlik dissertasiyasında cəmiyyətdə tərbiyənin rolunu, mövqeyini, təsir qüvvəsini şərh etmiş, dövlət və qabaqcıl əmək adamlarının, müəllimlərin, valideynlərin, bədii obrazların nümunəsi ilə ibtidai sinif şagirdlərinin əxlaq tərbiyəsinin elmi-pedaqoji və nəzəri əsaslarını araşdırmış, qabaqcıl təcrübəni ümumiləşdirmiş, praktiklərə dəyərli tövsiyələr vermişdir. "Təlimdə əyaniliyin rolu nə qədərdirsə, tərbiyədə də nümunənin rolu bir o qədərdir" – tezisi onun dissertasiyasının, "İbtidai məktəb şagirdlərinin kommunist əxlaqı tərbiyəsində nümunənin rolu və ondan istifadə etmək yolları" (1958), "Uşaqların tərbiyəsində valideynin şəxsi nümunəsi" (1962) kitablarının və silsilə məqalələrinin leytmotivini təşkil edir.

Onun redaktoru və müəlliflərindən biri olduğu "Pedaqogikaya giriş" (1973) tədris vəsaitində pedaqoji elmin bir sıra nəzəri və metodoloji məsələləri qismən öz elmi həllini tapmışdır. "Pedaqogikada qanun və qanunauyğunluq" (1974), "Sözdən işə keçək" (1978) əsərlərində Hüseyn Əhmədov pedaqogikanın digər metodoloji məsələlərinin həllinə girişmiş, elmi diskussiyalarda fəal iştirak etmiş, problemin bir çox cəhətinin aydınlaşdırılmasında, pedaqoji qanun və qanunauyğunluğun müəyyənləşdirilməsində pedaqoji anlayış və kateqoriyaların mahiyyətinin düzgün, elmi şəkildə əsaslandırılmasında, vahid terminoloji sistemin yaradılmasında hansı elmi prinsiplərə əsaslanmağı şərh etmiş, maraqlı elmi-nəzəri fikirlər söyləmişdir.

Akademik Hüseyn Əhmədovun Azərbaycan məktəb və pedaqoji fikir tarixi sahəsində apardığı ardıcıl və sistemli tədqiqatları onun çoxşaxəli elmi yaradıcılığının mərkəzində dayanır. O, tələbə ikən tarix elminin metodologiyasını mənimsəmiş, produktiv tarixçi təfəkkürü inkişaf edərək fakt və hadisələri zaman və məkan daxilində qiymətləndirməyi, pedaqoji problemləri mədəni-ictimai, siyasi-iqtisadi hadisələrin fonunda dəyərləndirməyi öyrənmiş, yaradıcılığı boyu həmin prinsipə sadiq qalmış, tədqiqatlarında tarixi mənbələrə əsaslanmaq nümunəsi göstərilmişdir. Pedaqogika tarixi sahəsində Hüseyn Əhmədovun tədqiqat dairəsi xeyli geniş olmuşdur. O, Azərbaycan pedaqoji fikir klassiklərinin, maarifçilərinin, məktəbdarlarının, ilk növbədə N.Tusi, A.A.Bakıxanov, M.Ş.Vazeh, M.F.Axundov, H.Zərdabi, S.Ə.Şirvani, S.M.Qənizadə, A.O.Çernyayevski, M.Ə.Elxanov, F.B.Köçərli, M.H.Ruşdiyyə, S.B.Vəlibəyov, C.Məmmədquluzadə, M.T.Sidqi, N.Nərimanov, Ü.Hacıbəyov, R.Əfəndiyev, R.Əfəndizadə, Ə.Y.Seyidov və digərlərinin pedaqoji ideyalarını tədqiqata cəlb etmiş, onların xalq maarifi, məktəb təhsili, təlim-tərbiyə ilə bağlı fikirlərini aşkarlamış, pedaqoji fikrin qaynaqlarını üzə çıxarmış, gənc nəslin tərbiyəsində həmin irsin əhəmiyyətini əsaslandırmış, bu günümüz üçün əhəmiyyətli olan elmi müddəalar irəli sürmüşdür.

Pedaqogika nəzəriyyəsi üzrə namizədlik dissertasiyası müdafiə etsə də, 60-cı illərdən başlayaraq Azərbaycanda məktəb təhsilinin tarixini öyrənməyə başlayır. 1968-1970-ci illərdə elmi-yaradıcılıq ezamiyyətinə gedən H.Əhmədov Moskva, Leninqrad, Tbilisi, Bakı, Həştərxan, İrəvan dövlət arxivlərində çalışır, üstünü toz basmış xeyli sənədləri aşkara çıxarır, külli miqdarda material toplayır, sistemə salır və "XIX əsrdə Azərbaycanda məktəb təhsilinin inkişaf tarixi" adlı doktorluq dissertasiyasını tamamlayır. Akademik M.Mehdizadənin rəsmi elmi məsləhətçisi olduğu həmin dissertasiya işini H.Əhmədov 1972-ci ildə

müvəffəqiyyətlə müdafiə edərək pedaqoji elmlər doktoru alimlik dərəcəsi alır. Hüseyn Əhmədovun doktorluq dissertasiyası pedaqoji ictimaiyyət və mütəxəssislər tərəfindən yüksək qiymətləndirilir. SSRİ PEA-nın həqiqi üzvlərindən M.Mehdizadə, N.Qonçarov (Moskva), A.Qurbanov (Aşxabad), professorlardan Ə.Seyidov, A.Abdullayev, N.Kazımov, F.Köçərli, M.Qazıyev, A.Zamanov və başqalarının dissertasiyaya verdikləri yüksək qiymət dediklərimizi təsdiq edir.

Professor Hüseyn Əhmədovun həmin sahədəki tədqiqatlarının praktik əhəmiyyətinə aid iki cəhəti qeyd etmək yerinə düşərdi. Onlardan birincisi budur ki, rəsmi dövlət qərarları ilə bir sıra şəhər və kənd məktəblərinin yubileyi geniş qeyd edilmiş, pedaqoji ictimaiyyətin böyük rəğbətini qazanmışdır. Tarixi keçmişi olan həmin məktəblərimizin fəaliyyətinin xalqa çatdırılmasında professor H.Əhmədov xeyli əmək sərf etmiş, “100 yaşlı Yuxarı Salahlı kənd məktəbi” (1978), “100 yaşlı Qarğabazar məktəbi” (1983), “150 yaşlı Şəki məktəbi” (1983) kitablarını, “Qocaman maarif ocaqlarımız” (1984), “Şəkidə ilk dünyəvi təhsil məktəbi” (1982), “Salyanda ilk məktəb” (1969), “Qutqaşen məktəbinin 90 yaşı var” (1972), “Dağkəsəmən məktəbin yaşı yüzdür” (1976), “İlk savad məktəblərindən biri” (1982), “Lənkəranda ilk dünyəvi təhsil məktəbi” (1982), “Yüz yaşlı Vəndam məktəbi” (1984), “Qubadlıda 100 yaşlı məktəb” (1984), “170 yaşlı Naxçıvan şəhər məktəbi” (2008), “Əbcəddən cədidədək” və s. əsər və məqalələrini yazmışdır. Əsərlərdə həmin məktəblərin tarixi inkişaf yolu araşdırılır, məktəb təhsili sahəsində uğurlar, nailiyyətlər ümumiləşdirilir, məktəbin məzunlarının fəaliyyətlərindən bəhs olunur.

Həmin tədqiqatların ikinci praktik əhəmiyyəti onunla izah olunur ki, bu tədqiqatlar əsasında professor H.Əhmədovun təşəbbüsü ilə hələ 1977-ci ildə “Azərbaycanda məktəb və pedaqoji fikir tarixi” adlı xüsusi kursun proqramı hazırlanaraq Azərbaycan və rus dilində çap edilmişdir. Akademik Hüseyn Əhmədov həmin proqram əsasında rus və Azərbaycan dillərində “Azərbaycan məktəb və pedaqoji fikir tarixi” dərsliyinin nəşrinə nail olmuşdur.

Hüseyn Əhmədov Azərbaycan məktəb və pedaqoji fikir tarixinin həm mahir tədqiqatçısı, həm də layiqli təbliğatçısıdır. O, Moskvada nəşr edilən 40 çap vərəqindən artıq olan “Azərbaycan pedaqoji fikir antologiyası” adlı iri həcmli monumental əsərin, SSRİ PEA tərəfindən çap olunan “SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixinə dair oçerklər” adlı çox cildliyin I və IV cildlərinin (Moskva, 1989, 1991), “Böyük rus ensiklopediyası” Dövlət Elm nəşriyyatı tərəfindən çap olunmuş 2 cildlik “Rus pedaqoji ensiklopediyası”nın, həmçinin 10 cildlik Azərbaycan Sovet Ensiklopediyasının IV-X cildlərinin əsas müəlliflərindən biridir. “Sovetskaya pedaqoqika”, “Narodnoe obrazovanie” və s. mətbuat orqanlarında çap olunmaqla Azərbaycan pedaqoji elminin nailiyyətlərini nəinki keçmiş İttifaqda, həm də xaricdə layiqincə təbliğ etmişdir. O, Moskva, Leninqrad, Kiyev, Daşkənd, Poltava, Penza, Səmərqənd, Ulyanovsk və digər şəhərlərdə keçirilən elmi konfrans və sessiyalarda fəal iştirak etmiş, nüfuzlu, kəsərli, orijinal fikirləri ilə həmkarlarının rəğbətini qazanmışdır.

Azərbaycan alim-pedaqoqları, o cümlədən xarici ölkə pedaqoqlarının nəzəri irsi ilə bağlı onlarla tədqiqat xarakterli məqalələr yazmış, onların pedaqoji baxışlarını, ideya və nəzəriyyələrini təhlil etmiş, bu fikirlərdə indi də öz qüvvəsini itirməyən mütərəqqi cəhətləri üzə çıxarmışdır. Akademik Hüseyn Əhmədovun elmi fəaliyyətinin mühüm bir hissəsini ali məktəb

pedaqogikası və metodikası təşkil edir. Onun "Pedaqogikaya giriş" (1973), "Pedaqogika tarixindən mühazirə mətnləri" (1987) dərs vəsaitləri, üç cilddə nəzərdə tutulan "Azərbaycan pedaqoji antologiyası" (2-ci cild) (2011), "Azərbaycan məktəb və pedaqoji fikir tarixi" dərsliyi (2014) də tələbələr və müəllimlərin stolüstü kitablarındandır.

Professor H.Əhmədov respublika miqyaslı elmi-pedaqoji konfransların mahir təşkilatçısı kimi tanınmışdır. Onun rəhbərlik etdiyi ümumi pedaqogika kafedrasının hazırladığı və keçirdiyi "Qori Müəllimlər seminariyasının Azərbaycan şöbəsinin 100 illiyi" (1979), "Pedaqogika tarixi kursunun tədrisinin təkmilləşdirilməsi və respublikada tarixi-pedaqoji tədqiqatların təşkili" (1984), "Nəriman Nərimanovun anadan olmasının 120 illiyi" (1990), "Y.A.Komenski-400" (1992), "Ə.Y.Seyidov-100" (1992), "Pedaqoji peşəyönümünün aktual problemləri" (1993), "Qloballaşma və Azərbaycanda təhsilin aktual problemləri" (2003), "K.D.Uşinski-180" (2004), "A.S.Makarenko-125" (2013) elmi-praktik konfransları pedaqoji ictimaiyyət tərəfindən yüksək qiymətləndirilmişdir. "Tələbələrlə fərdi işin təşkilinə dair metodik göstərişlər" (I-II hissə) (1985), "Pedaqoji təcrübə" (1982) və b. əsərlərində ali məktəb pedaqogikasının bəzi problemləri şərh olunur. Akademik Hüseyn Əhmədovun elmi-pedaqoji fəaliyyətində Nəriman Nərimanovun pedaqoji irsinin tədqiqi və təbliği ayrıca bir mərhələ təşkil edir. 1957-ci ildən bugünədək ardıcıl olaraq bu mövzu üzrə tədqiqatını davam etdirən müəllif təhsil və pedaqoji fikir tarixinə N.Nərimanovun görkəmli tədqiqatçısı kimi daxil olmuşdur. Onun böyük maarifçi, siyasət və dövlət adamı Nəriman Nərimanovla bağlı Azərbaycan, rus, erməni və gürcü dillərində Bakıda, İrəvanda, Tbilisidə, Moskvada, Həştərxanda, Saratovda çap olunan məqalələri, "N.Nərimanovun pedaqoji fikirləri" adlı sanballı monoqrafiyası nərimanovşünaslığa dəyərli töhfədir.

Akademik Hüseyn Əhmədov Nəriman Nərimanovun pedaqoji irsinin tədqiqi ilə kifayətlənməmiş, o eyni zamanda N.Nərimanovun pedaqoji fəaliyyətə başladığı Borçalı qəzasının Qızıl Hacılı kənd məktəbinə onun adının verilməsinə, anadan olduğu evin yerləşdiyi "Tatariski pereuloq" küçəsinin adının dəyişdirilərək onun adı ilə adlandırılmasına nail olmuşdur. Bu məqsədlə o, Tiflis şəhər rəhbərliyinin dəfələrlə qəbulunda olmuş, gərgin zəhməti, əziyyəti və inadkarlığı nəticəsində öz istəyinə nail olmuşdur. Hazırda həmin küçə M.Ş.Vazehin adını daşıyır. Akademik Hüseyn Əhmədov Nərimanovun anadan olduğu evdən onun Moskvada dəfni zamanı çəkilmiş fotonu əldə etmiş, digər arxiv sənədləri ilə birlikdə Azərbaycan Tarixi Muzeyinə verilmişdir.

Azərbaycan müstəqillik qazandıqdan sonra Hüseyn Əhmədovun yaradıcılığında yeni bir elmi istiqamət formalaşmağa başlamışdır. Türkdilli ölkələr arasında elm və təhsil sahəsində əməkdaşlığa töhfə vermək məqsədilə bu istiqamətli araşdırmalara başlamış, "Avrasiya xalqlarının məktəb və pedaqoji fikir tarixinə dair oçerklər" (2012) sanballı elmi-tədqiqat əsərinin nəşrinə nail olmuşdur. Uzunmüddətli dərin elmi axtarışların nəticəsi olan bu kitabda Avrasiya məkanında yaşayan müsəlman xalqlarının məktəb və pedaqoji fikir tarixinə aid maraqlı və bir-birini tamamlayan oçerklər toplanmışdır. XIX əsrin ikinci yarısında və XX əsrin əvvəllərində Tiflisdə, Təbrizdə və Bakıda nəşr olunmuş Azərbaycan dili və hesab dərsliklərini ilk növbədə N.Dementyevin "Təmsillər və hekayələr" (Tiflis, 1839), İ.Qriqoryevlə M.Ş.Vazehin "Kitabi-türki" (Təbriz, 1855), A.O.Çernyayevskinin "Və-tən dili" (I hissə, Tiflis, 1882), Rəşid bəy Əfəndiyevin "Uşaq bağçası" (Tiflis,

1912), “Bəsirət-ül-ətfal” (Bakı, 1901), A.Çernya-yevski və S.Vəlibəyovun “Vətən dili” (II hissə, Tiflis, 1888), S.Vəlibəyovun “Qüdrəti-Xuda” (Tiflis, 1888), Üzeyir Hacıbəyovun “Hesab məsələləri” (Bakı, 1907) adlı dərsliklərini ərəb əlifbasından mövcud latın qrafikasına çevirmiş, onlara lüğət, izahat və şərhlər əlavə etməklə transliterasiya və faksimiliya yolu ilə yenidən nəşr etdirməklə akademik Hüseyn Əhmədov onlara yeni həyat, yeni nəfəs bəxş etmiş, mətbuatda “Ana dili dərsliklərimiz milli sərvətimizdir” başlıqlı silsilə məqalələrlə çıxış etmişdir. Hüseyn müəllim bu dərslikləri əldə etmək üçün Bakı, Tiflis, Leninqrad, Moskva arxivlərində və kitabxanalarında illərlə araşdırmalar aparmışdır. Yeri gəlmişkən bunlarla bağlı bir cəhəti də qeyd etmək yerinə düşər. O, İrəvan Dövlət Arxivində işləyərkən İrəvan gimnaziyasının Azərbaycan dili müəllimi M.Elxanovun çapa hazırladığı “Vətən dili” adlı dərsliyini üzə çıxarmış, bu kitaba Peterburq Universitetinin Şərq dilləri fakültəsinin dosenti V.Smirnovun bu dərsliyə yazdığı yeddi səhifəli resenziyanı əldə etmiş və onun “Avroasiya xalqlarının məktəb və pedaqoji fikir tarixinə dair oçerklər” adlı kitabına daxil etmişdir (Bakı: Maarif, 2012). Akademik Hüseyn Əhmədovun uzun sürən axtarışları nəticəsində əldə etdiyi digər bir dərslik 1939-cu ildə Tiflisdə nəşr edilmiş “Təmsillər və hekayətlər”dir ki, bu kitabı müəllif İrəvan Mərkəzi Dövlət Kitabxanasının nadir fondundan tapmışdır (inventar N 4395). Araşdırmalar nəticəsində məlum olmuşdur ki, mənfur qonşularımız - ermənilər bu kitabı erməni kitabı hesab etmiş və onu 1967-ci ildə nəşr olunmuş “Erməni kitabı”na (1801-1850) daxil etmişlər (səh. 248, N 1008). Halbuki bu dərslik ərəb əlifbası ilə çap edilmişdir və Azərbaycan xalqına məxsus təmsillər və hekayələrdən ibarətdir. Kitabın “Giriş”ində müəllif açıq-aşkar etiraf edir ki, bu kitab çapa hazırlanarkən Tiflisdə yaşayan azərbaycanlıların köməyindən faydalanmışdır.

Akademik Hüseyn Əhmədovun İrəvan arxivindən əldə etdiyi üçüncü vacib sənəd böyük maarifçi və ədəbiyyatşünas Firidun bəy Köçərlinin İrəvan gimnaziyasında Azərbaycan dili müəllimi vəzifəsində işləyərkən 1885-ci ildə tərtib etdiyi “Azərbaycan dili proqramı”dır. Bu proqramın tam mətnini əldə edən Hüseyn Əhmədov onu “Maarif fədailəri: Firidun bəy Köçərli-150, Rəşid bəy Əfəndiyev-150” (Bakı: ADPU, 2013) adlı monoqrafiyasına daxil edərək çap etməklə faydalı bir iş görmüşdür. Professor Hüseyn Əhmədovun Azərbaycanda pedaqoji və xüsusilə elmi-pedaqoji kadrların hazırlanmasında böyük əməyi olmuşdur. İndiyə kimi onun ürəyinin odundan, gözlərinin nurundan, qələminin gücündən mənim kimi 60-a yaxın tədqiqatçının ömrünə pay düşüb.

Bu gün respublikamızın pedaqoji təmayüllü institut və universitetlərinin, demək olar ki, hamısında professorun yetirmələri fəaliyyət göstərir, pedaqoji elmin, milli məktəb və pedaqoji fikrimizin ən maraqlı məsələləri ilə bağlı tədqiqatlar aparırlar. Hüseyn Əhmədovun rəsmi opponentliyi ilə xeyli namizədlik və doktorluq dissertasiyası müdafiə olunub. Onun Orta Asiya və Gürcüstan Respublikaları üçün elmi-pedaqoji kadr hazırlığındakı xidmətləri də təqdirəlayiqdir. O, yüksək ixtisaslı elmi kadrların yetişməsinə son dərəcə tələbkarlıq və qayğıkeşliklə yanaşır. Dəfələrlə SSRİ və Azərbaycan Respublikası AAK-nin qərarı ilə ADPU-da doktorluq dissertasiyalarının müdafiəsi üçün birdəfəlik ixtisaslaşdırılmış müdafiə şuralarının sədri təsdiq edilmişdir. Həmin zamanlar şuranın iclasları mütəşəkkil keçmiş, təqdim edilmiş dissertasiyalar müvəffəqiyyətlə müdafiə edilmiş və hamısını AAK yekdilliklə təsdiq etmişdir. Hüseyn

Əhmədov hazırda bir neçə aspiranta, dissertanta, doktoranta rəhbərlik edir. 60-dan çox kitabın redaktoru kimi həmkarlarının əsərlərinin nəşrinə böyük qayğı və tələbkarlıq göstərir. Hüseyn Əhmədovun elmi-pedaqoji yaradıcılığı həmişə pedaqoji tənqidin diqqət mərkəzində olmuş, hər bir əsəri vaxtında elmi qiymətini almışdır. Özü və əsərləri haqqında yazılmış saysız-hesabsız yazılar buna əyani sübutdur. Akademik Hüseyn Əhmədov haqqında müasirlərinin yazdıqları 13 kitabda toplanmışdır. Respublikada (eləcə də keçmiş İttifaq miqyasında) alim-pedaqoqlardan ilk dəfə məhz onun haqqında izahlı biblioqrafiya hazırlanmış, çap olunaraq pedaqogikanın nəzəriyyəsi və tarixi sahəsində tədqiqat aparanlar, ilk növbədə tələbələr, müəllimlər və aspirantlar üçün qiymətli mənbəyə çevrilmişdir.

Akademik Hüseyn Əhmədovun təhsil və pedaqoji fikir tarixi ilə bağlı əsərləri Azərbaycan pedaqoji elminin qızıl fonduna daxil edilmişdir. Onun müstəqillik illərində respublikanın dövlət qəzetlərində çap etdirdiyi silsilə məqalələri dövlətçiliyimizin daha da möhkəmlənməsinə, müstəqil Azərbaycan dövlətinin memarı olan ulu öndər Heydər Əliyevin və prezident İlham Əliyevin uşaq və gənclərin təhsil-tərbiyəsinə, şəxsiyyət kimi formalaşmasına, cəmiyyətə layiqli vətəndaş kimi yetişməsinə göstərdikləri qayğıya həsr olunmuşdur.

Son illərdə onun tədqiqatlarında yeni bir elmi istiqamət formalaşmış, Azərbaycanın yaxın və orta Şərq xalqları, Almaniya, Rusiya və Özbəkistanla elmi-pedaqoji əlaqələri ilə bağlı maraqlı elmi araşdırmalar aparmışdır. Azərbaycanın digər xalqlarla elmi-pedaqoji, ədəbi və mədəni əlaqələrinin sistemli araşdırılmasına həsr olunmuş məqalələr tarixiliyi və müasirliyi ilə diqqəti cəlb edir.

Akademik H.Əhmədovun yaradıcılıq diapozonu genişdir. O, həm pedaqogika, həm də pedaqogika tarixinin aktual problemlərinə müdaxilə etmiş, öz sözünü demiş, orijinal fikirləri ilə həmkarları arasında yüksək nüfuz qazanmışdır. O, bütün mənalı həyatını elmin inkişafına, məktəb və pedaqoji fikir tarixinin tədqiqinə, tədrisinə, təbliğinə sərf etmişdir. Azərbaycan və xarici ölkə alimləri Hüseyn müəllimin elmi-pedaqoji fəaliyyətinə yüksək dəyər vermiş, onu müəllimlər müəllimi, qayğıkeş insan, Azərbaycan pedaqogika elminin korifeyi, təkcə Azərbaycanda deyil, həm də MDB məkanında pedaqogika elminin patriarxlarından biri kimi qiymətləndirmişlər.

Müharibə və əmək veteranı olan akademik Hüseyn Əhmədov ömrünün müdriklik və məhsuldar çağlarını yaşayır. Öz sələflərinin – professor Əhməd Seyidovun, akademik Mehdi Mehdizadənin, professor Mərdan Muradxanovun başladıqları işi bu gün də şərəflə davam etdirir. Azərbaycan məktəb və pedaqoji fikir tarixinin tədqiqi, təbliği və tədrisi sahəsindəki çoxşaxəli fəaliyyətinə və yaradıcılıq uğurlarına görə çoxdan pedaqogika elmimizin patriarxına çevrilən akademik Hüseyn Əhmədovun bu il elmi-pedaqoji fəaliyyətinin 70, anadan olmasının 90 illiyi tamam olur. Elimizin və elmimizin ağsaqqalını təbrik edir, ona möhkəm cansağlığı və yeni-yeni yaradıcılıq uğurları arzulayıram.

**Fərrux Rüstəmov,**
***ADPU-nun ibtidai təhsil fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru, professor, əməkdar elm xadimi***

# FƏDAKAR ALİM, PEŞƏKAR PEDAQOQ

Azərbaycan MEA-nın müxbir üzvü, əməkdar elm xadimi, iqtisad elmləri doktoru, professor, Beynəlxalq Enerji-İnformasiya Akademiyasının akademiki, Beynəlxalq Menecment Akademiyasının həqiqi üzvü, Beynəlxalq İqtisadçılar İttifaqının üzvü Aqil Əliyevin elmi-pedaqoji fəaliyyəti tamamilə Azərbaycan Tibb Universiteti ilə bağlı olmuşdur. 80 illik ömrünün 50 ilini o, gənc nəslin tərbiyəsinə və savadlanmasına həsr etmişdir.

Aqil Əlirza oğlu Əliyev 1926-cı il dekabrın 10-da anadan olmuşdur. İlk təhsilini Naxçıvan şəhərində aldıqdan sonra 1946-cı ildə Bakı Dövlət Universitetinə qəbul olunmuş və 1951-ci ildə oranı bitirərək Azərbaycan EA-nın Tarix İnstitutunda elmi işçi vəzifəsində çalışmışdır. İqtisad elminə böyük marağı onu 1953-cü ilin may ayında Azərbaycan Tibb İnstitutunun siyasi iqtisad kafedrasına gətirir və 1970-ci ildə o burada dissertasiya müdafiə edərək iqtisad elmləri namizədi, 1983-cü ildə iqtisad elmləri doktoru alimlik dərəcəsi almışdır. 1973-cü ildə dosent, 1979-cu ildə isə professor elmi adlarına layiq görülən Aqil Əliyev 2001-ci ildə Azərbaycan MEA-nın müxbir üzvü seçilmişdir.

Gənclik illərindən ali məktəbə, elmi mühitə düşən Aqil Əliyev orada baş müəllimlikdən dosent, sonra professor və kafedra müdiri vəzifələrinə qədər yüksəlmiş, işlədiyi kafedranın tarix salnaməsinin yazılmasına böyük əmək sərf etmişdir. Fədakar alim elmi fəaliyyətini pedaqoji işlə əlaqələndirərək öz tələbələrinə iqtisad elminin sirlərini öyrətməyə çalışmış, onları həyata, əməyə hazırlamışdır. Aqil müəllim tədqiqatçılıq işini də davam etdirmiş, tələbələrin ciddi ehtiyac duyduğu ali məktəblər üçün “İqtisadi nəzəriyyə” kursu üzrə yazılmış 2 cildlik dərsliyin müəlliflərindən biri olmuşdur. Məhsuldar alim dövri mətbuatda dərc olunan yüzlərcə elmi-kütləvi və publisistik məqalələrin də müəllifidir.



Professor A.Ə.Əliyevin yüksək ixtisaslı tibb kadrlarının hazırlanmasında əvəzsiz xidmətləri olmuşdur. Müəllimlik sənətinə böyük hörmətlə yanaşan alim, tezliklə peşəkar pedaqoq kimi tanınmışdır. O öz tələbələrinə qayğı ilə yanaşır, onların problemləri ilə yaxından maraqlanır, lazım gəlsə, onlara kömək göstərirdi. Tələbələrinin dediyinə görə, güclü yaddaşa malik olan Aqil müəllim dərs vaxtı sual-cavablarda fəal iştirak edən tələbələri yaxşı yadda saxlayır

və bunu imtahanlarda nəzərə alırdı. Bəzən tələbənin bilmədiyi və ya yaxşı izah edə bilmədiyi sualları elə imtahan vaxtı özü izah edər, tələbəni başa salardı. Sadəliyi, qayğıkeşliyi ilə, dərsi yaxşı izah etmə xüsusiyyətlərinə görə Aqil müəllimin tələbələr arasında xüsusi hörməti var idi. Ona görə də, tələbələri hamısı onu sevirdi.

Hər bir insan ömrü onun özü və yaxınları üçün mənalı hesab olunur. Sözün geniş mənasında Aqil müəllim mənalı ömür yaşamışdır. Onun gördüyü işlər cəmiyyət üçün yararlı olmuş, əməlləri başqalarına fayda vermişdir.

Onun ömrünü insan kimi, alim kimi, müəllim kimi, dost kimi, ailə başçısı kimi, vətəndaş kimi dəyərləndirənlər, həmişə Aqil müəllimə tam şəxsiyyət kimi yanaşmışlar. Aqil müəllim həyatının bütün axarı boyunca hər an, hər zaman səmimiyyəti və obyektivliyi ilə fərqlənmişdir.

Aqil müəllimin respublika əhalisinin istehlakının yaxşılaşdırılması istiqamətində apardığı tədqiqatları iqtisad elminin diqqətindən kənarda qalmamışdır. Onun Azərbaycanda səhiyyənin iqtisadiyyatı fənninin formalaşdırılmasında, onun bir elm sahəsi kimi təşəkkül tapması və inkişafında da danılmaz xidmətləri olmuşdur.

ABŞ-da professor Aqil Əliyevin 90 illik yubileyində qeyd edilmişdir ki, böyük və sadə şəxsiyyət kimi tanınan Aqil Əliyev hər zaman arxasız, imkansız insanlara böyük arxa, dayaq olurdu. O, tələbələrinə çox böyük diqqət ayırır, onlara təmənnasız olaraq dəstək olardı, o heç zaman gəncləri unutmurdu. Aqil müəllim bütün işləri xalqının yaşaması və rifahı naminə edirdi. O, xeyirxah əməlləri və addımları, fərdi xüsusiyyətləri, əvəzsiz xidmətləri ilə onu tanıyanların qəlbində əbədi heykəl ucaltmışdı.

Ən yaxşı illərini müxtəlif mülkiyyət formalarının mövcudluğu şəraitində, xüsusilə də keçid dövründə əhalinin sağlamlığının qorunmasının iqtisadi problemlərinə sərf etmiş alim respublikada həkimlər ordusunun püxtələşdirilməsində öz zəhmətini əsirgəməmiş, tibbi kadrların yetişdirilməsinə öz payını vermişdir. Onun əməyi layiqincə qiymətləndirilmiş, 1982-ci ildə "Əməkdar elm xadimi" fəxri adına, 1976-cı ildə "Qırmızı Əmək Bayrağı" ordeni və bir sıra fəxri təltiflərə layiq görülmüşdür.

Aqil müəllim 1959-cu ildə "Səhiyyə əlaçısı" döş nişanına, 1970-ci ildə "Fədakar əməyə görə", 1997-ci ildə "Sovet İttifaqı Marşalı Jukov" medalları və bir sıra fəxri fərmanlarla təltif edilmişdir. 2001-ci ildə isə müstəqil Azərbaycanın "Şöhrət" ordeni ilə təltif olunmuşdur.

Aqil Əliyev başçılıq etdiyi kafedranın əməkdaşları üçün də diqqət və qayğısını əsirgəməmişdir. Onun rəhbərliyi altında kafedrada görülən işlər sayəsində bir sıra nailiyyətlərin təməli qoyulmuşdur. Bilavasitə onun rəhbərliyi altında 4 doktorluq və 6 namizədlik dissertasiyası müdafiə olunmuşdur. Onun tələbələri bu gün də ölkəmizdə müxtəlif sahələrdə öz müəllimlərinin yolunu uğurla davam etdirirlər. ATU-nun "Siyasi iqtisad" kafedrası uzun illər "Ən yaxşı kafedra" fəxri adına layiq görülmüş, kollektivin işi əsl nümunə məktəbinə çevrilmişdir.

Aqil Əliyev uzun illər respublikamızın ali təhsil sistemində məhsuldar və səmərəli fəaliyyət göstərən görkəmli iqtisadçı alimlərdəndir. Yarıməsrlik fəaliyyəti ona böyük şöhrət qazandırmışdır.

130-dan artıq elmi əsərin, o cümlədən 19 monoqrafiya və kitabın müəllifi

olan Aqil Əliyevin bir sıra əsərləri Moskvada, Sankt-Peterburqda və digər xarici ölkələrdə çap olunmuşdur. O, Azərbaycanda ilk dəfə tədqiq olunan "Şəxsi istehlakın iqtisadiyyatı", "Tibbin iqtisadiyyatı", "Xalq istehlakı", "Aqrar iqtisadiyyatın aktual problemləri" və sair sanballı monoqrafiyaların müəllifidir.

Həmçinin qeyd edilməlidir ki, professor Aqil Əliyev uzun müddət qazandığı elmi-pedaqoji potensialından istifadə edərək respublikanın suveren dövlət kimi bazar münasibətləri şəraitində iqtisadi islahatların əhəmiyyətini qiymətləndirmiş, sağlam düşüncəyə, təhsilin aktual problemlərinin dövrü tələblərinə uyğun tibbi kadrların yetişdirilməsini həyata keçirmişdir.

Köklü bir nəslin övladı olan Aqil Əliyev mənalı ömründə gənc nəsil üçün dəyərli izlər qoyub getmişdir. Respublikamızın nüfuzlu alimləri bunu dönə-dönə qeyd etmiş və onun bu sahədəki xidmətlərini gənc nəslə xatırlatmışdır.

“Onun bazar münasibətləri şəraitində dövlətin iqtisadi siyasətinə uyğun sahibkarlığın formalaşması, inkişafı, pul-kredit, vergi münasibətləri və s. haqqında yazıları, fikirləri respublikanın iqtisadi, sosial inkişafına dair mühüm təklifləri kimi qiymətləndirilmişdir. Aqil Əliyevin elmi əsərlərində əsas istiqamət həmişə əhalinin maddi və mədəni həyat səviyyəsinin yaxşılaşdırılmasına yönəlmişdir. 2005-ci ildə nəşr etdirdiyi “Sosial sferanın iqtisadi və metodoloji əsasları” monoqrafiyasında müəllif, müasir dövrdə əhalinin sosial müdafiəsinin təşkilinin iqtisadi əsaslarının nəzəri və praktiki məsələlərini araşdırmışdır” (G.Gəraybəyli).

Yalnız bazar iqtisadiyyatına keçid şəraitində professorun 32 elmi əsəri çap olunmuşdur. O, beynəlxalq və respublika konfranslarında, simpoziumlarda, seminarlarda maraqlı məruzələrlə çıxış etmişdir.

Aqil Əliyev təcrübəli və nüfuzlu alim, mütəxəssis kimi Azərbaycanın elmi-texniki inkişafının kompleks proqramının işlənməsindən kənarda qalmamış, uzun müddət "əhalinin sağlamlığının qorunması" problem komissiyasının sədri olmuşdur. Əhalinin sağlamlığının qorunması bölməsi onun tərəfindən tərtib edilərək kompleks proqrama daxil edilmişdir.

Aqil müəllim ATİ-nin divarları arasında fəaliyyət göstərdiyi müddətdə tibb kadrlarının yetişdirilməsindəki uğurlarına görə “Səhiyyə əlaçısı” döş nişanına layiq görülmüşdür.

Uzun illərin elmi-pedaqoji fəaliyyəti, bu sahədə qazandığı təcrübələr Aqil Əliyevi müdrik bir insan kimi yetişdirmiş, bu müdriklik, xasiyyətindəki profesionallıq, obyektivlik, xeyirxahlıq və humanizm alimi ölkəmizin tanınmış şəxsiyyətləri sırasına çıxarmışdır.

Təəssüflə qeyd etmək lazımdır ki, böyük alimin həyat yolu o qədər də hamar olmamışdır. 1988-1992-ci illərdə bütün şüurlu həyatını sərf etdiyi, müəllimlikdən kafedra müdirliyinə qədər yüksəldiyi Azərbaycan Tibb İnstitutundan çıxarıldı, kafedrası ləğv edildi. Xeyirxah, təvazökar, səmimi və məsuliyyətli pedaqoq bir müddət öz doğma kollektivindən ayrı düşdü, xeyli müddət işsiz gəzdi. Necə deyərlər, o illərin repressiyasına məruz qaldı. Lakin belə günlərin ömrü uzun olmadı. O, 1992-ci ildə yenidən öz kafedrasına qayıtdı və “İqtisadi nəzəriyyə və tarix” kafedrasının professoru vəzifəsində öz işini davam etdirməyə başladı.

Professor Aqil Əliyevə elmi işlərinin və monoqrafiyalarının sayına görə keçmiş

SSRİ Ali Attestasiya Komissiyası ona professor elmi adını vermişdi. Lakin zəhmətkeş alim bundan sonra da öz elmi araşdırmalarını ciddi davam etdirmiş, qarşıya qoyulan vəzifələrin həllinə daha məsuliyyətlə yanaşmışdır. O deyirdi ki, insan daim çalışmalı, elmi axtarışlarını davam etdirməlidir, ətrafında olanlara nümunə göstərməli, özünün nəyə qadir olduğunu büruzə verməyi bacarmalıdır. Hamı onu yaxşı tanıyırdı. O, nəyə qadir olduğunu elmi əsərləri ilə göstərirdi. Onun daim yazıb-yaratmaq həvəsi yaşlı vaxtında da aşıb-daşırdı. Bu minvalla o, 150-dən çox elmi əsərin, 20-dən artıq sanballı monoqrafiyanın, çoxsaylı dərslik və dərs vəsaitlərinin müəllifi oldu.

A.Əliyevin elmi fəaliyyət sahəsi rəngarəng, tədqiqat meydanı geniş və əhatəlidir. Onun əsərləri elmiliyi, professionallığı ilə seçilir. Dərin, sərrast, elmi təfəkkürə malik olan alim çoxcəhətli fəaliyyəti ilə seçilirdi.

Müstəqillik illərində Aqil Əliyevin 80 elmi əsəri çap olunmuşdur. "Azərbaycanın sosial-iqtisadi inkişafında islahatların rolu", "İpək Yolunun bərpası bəşəriyyətin tərəqqi yoludur", "Azərbaycanda bazar münasibətləri şəraitində əhalinin sosial problemləri", "Səhiyyənin iqtisadiyyatı", "Azərbaycanda əhalinin səviyyəsinin yüksəldilməsinin aktual problemləri", ikicildlik "Naxçıvan Muxtar Respublikası: nailiyyətlər, problemlər", "Bazar iqtisadiyyatına keçid: dövlətin iqtisadi siyasəti", "Bələdiyyələr. Metodik kömək", "Dünya iqtisadiyyatı: müasir dövrün problemləri", "Müstəqil Azərbaycan iqtisadiyyatının aktual problemləri" və başqa əsərləri bazar iqtisadiyyatına keçid şəraitinin təhlilinə həsr olunmuşdur.

Onun kitabları fədakarlıq, dözüm və səbrin, ağır yaradıcı əməyin məhsuludur. Alimin elmi araşdırmaları kifayət qədər sanballıdır və böyük nəzəri əhəmiyyət kəsb edir. Onun tədqiqatları həm perspektivli, həm də aktual olmuşdur.

Aqil müəllimə xas olan gözəl keyfiyyətlərin ən başlıcalarından biri də onun hədsiz təvazökarlığı, insanlara gərək olmaq hissləri idi. Aqil müəllim övladına da, iş yoldaşlarına da, tələbələrinə da daim eyni dərəcədə qayğı göstərirdi. Uzun illər yuxusuz gecələr keçirərək elmi axtarışlarla məşğul olurdu. Görkəmli bir alim, istedadlı, yorulmaz tədqiqatçı kimi onu digərlərindən fərqləndirən çox böyük üstün cəhətləri var idi.

Aqil müəllim böyük və qüdrətli alim kimi çoxlarına nümunə idi. O həm də çox səmimi, sevimli müəllim idi. İllər keçsə də onun nurlu siması unudulmamışdır. O, özünü Şərqin müdrik alimləri kimi təsdiqlətmiş və vətənin ən tanınan məşhur bir iqtisadçı alimi adını tarixin səhifələrinə həkk etdirmişdir.

Aqil Əliyev ömrünün sonuna qədər ATU-da "İqtisadi nəzəriyyə və hüququn əsasları" kafedrasının müdiri vəzifəsində çalışmışdır. O, 2006-cı il mart ayının 7-də vəfat etmişdir.

**Vaqif Şadlinski,**
***Azərbaycan Tibb Universitetinin insan anatomiyası kafedrasının müdiri, Rusiya Elmlər Akademiyasının akademiki, əməkdar elm xadimi, professor***

***Fənlərin tədrisi***



# KEYFİYYƏTLİ TƏHSİL ÖLKƏNİN DİNAMİK İNKİŞAFINI TƏMİN EDƏN ƏSAS GÖSTƏRİCİLƏRDƏN BİRİDİR

**Şəkər Abdullayeva,**
***Qax şəhər 2 nömrəli məktəb-liseyin direktoru, əməkdar müəllim***

*Məqsədimiz ölkənin dinamik inkişafında fəal iştirak edəcək gənclərin yetişdirilməsidir.*
***İlham Əliyev***

***Açar sözlər:*** *kurikulum islahatı, layihə, müsabiqə, davamlı inkişaf, modernləşdirmə, əməkdaşlıq, təhsilin inkişafı.*

***Ключевые слова:*** *реформа учебной программы, проект, конкурс, устойчивое развитие, модернизация, сотрудничество, развитие образования.*

***Key words:*** *curriculum reform, project, competition, quality, modernization, cooperation, educational development.*

Məlum olduğu kimi, ulu öndər Heydər Əliyevin müstəqilliyə qovuşdurduğu Azərbaycan hazırda Prezident İlham Əliyevin rəhbərliyi altında sürətlə inkişaf edir. Dinamik, davamlı inkişaf bu gün ölkəmizdə prioritetdir və Azərbaycanın inkişafı beynəlxalq təşkilatların hesabatlarında təqdir olunur. Bu isə o deməkdir ki, ölkədə uğurla reallaşdırılan sürətli innovativ inkişaf siyasəti Azərbaycan Respublikasının davamlı inkişaf göstəricilərinə görə liderlər qrupuna yüksəlməsi faktını təmin edir. Davamlı inkişaf edən cəmiyyətin bərqərar olması üçün peşəkarlıqları, vətəndaş mövqeləri və həyat tərzi yeni çağırışlara cavab verən yeni nəslin formalaşdırılması zəruridir. Azərbaycanın ictimai, siyasi və mədəni həyatındakı dəyişikliklər bütövlükdə cəmiyyətin inkişafından xəbər verir. Təbiidir ki, təhsil sahəsində son illərdə əldə edilmiş nailiyyətlər də cəmiyyətin inkişafı ilə bağlıdır.

“Azərbaycan 2020: Gələcəyə baxış” İnkişaf Konsepsiyasında göstərildiyi kimi, son illərdə təhsil sahəsində nəzərə çarpan nailiyyətlərin əldə olunması da bilavasitə ölkəmizin modernləşdirilməsinə istiqamətlənmiş sosial-iqtisadi siyasətlə bağlıdır. “Təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biridir”- deyən ölkə Prezidentinin fikri bu gün təhsil işçiləri qarşısında çox möhtəşəm və əhəmiyyətli vəzifələrin həyata keçirilməsi istiqamətində aparılan işin səviyyəsini yüksəltməyi tələb edir.

Hər şeydən əvvəl, 2013-cü il oktyabrın 24-də qəbul edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi istiqamətində aparılan işin səviyyəsinin daha da yüksəldilməsi təmin olunmalıdır. Bunu nəzərə alaraq məktəbimizin pedaqoji kollektivi “məktəbdə təhsili idarəetmə sistemini təkmilləşdirməklə təhsilin keyfiyyətini yüksəltmək və ölkənin modernləşdirilməsində fəal iştirak edəcək “İnsan kapitalı”nın formalaşdırılması problemi” üzərində

işləyir. Fəaliyyətimizdə təhsil strategiyasında irəli sürülmüş yeniləşmə və müasirləşdirilməni əsas götürmüşük. Bunu reallaşdırmaq üçün lazımi bazanın olması çox vacibdir.

Yüksək uğurları olan Qax şəhər 2 nömrəli məktəb-liseyi 2007/2008 və 2012/2013-cü dərs illərində respublika üzrə keçirilən "Ən yaxşı ümumtəhsil məktəbi" müsabiqəsinin qalibi olmuşdur. Tələbə qəbulu ilə bağlı statistik rəyə əsasən ardıcıl olaraq hər il "İlin ən yaxşı məktəbi" adına layiq görülmüşdür. TQDK-nın 2014-cü ildə 12 ilin nəticəsinə görə verdiyi statistik rəyə əsasən məktəb respublikamızda fərqlənən 432 məktəb arasında 9 əsas fənn üzrə yekunda I yeri qazanmışdır.

Məlum olduğu kimi, UNESKO-nun "Təhsil əsri", "İntellekt əsri" elan etdiyi XXI əsr həm də Azərbaycanda milli təhsil quruculuğu sahəsində islahatlar əsridir.

Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu ilə müəyyən edilmiş təhsilin əsas məqsədini, müstəqil Azərbaycanın dövlət və milli mənafeyini nəzərə alsaq, belə nəticəyə gələ bilərik ki, müasir Azərbaycan məktəbi, ilk növbədə məhz ağıl məktəbi olmalıdır. Bu yolun bələdçiləri müəllimlərdir. Deməli, məktəbdə həm də yüksək hazırlığa və nüfuza malik olan müəllim ordusu formalaşmalıdır. Bununla əlaqədar müstəqillik illərində ardıcıl olaraq təhsil sahəsində həyata keçirilən islahatlar "Təhsil xalqımızın bu günü, millətimizin, dövlətimizin gələcəyi üçün ən vacib bir sahədir"-deyən ulu öndərimiz H.Əliyevin ideyalarının təntənəsi olmaqla, məktəbin yeniləşməsinə, müəllimin daha da inkişafına və formalaşmasına imkan yaratdı.

2008-2016-cı illər ərzində məktəbin 4 müəllimi "100 ən yaxşı müəllim" müsabiqəsinin qalibi olmuş, 2 müəllim "Əməkdar müəllim" adı almış, 4 müəllim "Tərəqqi" medalı ilə təltif olunmuş və 4 müəllim Azərbaycan Respublikasının "Qabaqcıl təhsil işçisi" adına layiq görülmüşdür. Həmin illər ərzində rayon üzrə 12 müəllim "Ən yaxşı müəllim", 44 müəllim "İlin ən yaxşı mühazirəçisi", 32 müəllim "İlin ən yaxşı kabinet rəhbəri" adına layiq görülmüşdür. Həmçinin 16 müəllimin qabaqcıl iş təcrübəsinin rayon təhsil işçiləri arasında yayılması üçün rayon təhsil şöbəsinə təklif verilmişdir. Müəllim-lərdən Rəna Məmmədova, Nərminə Abdul-layeva, Adilə Aşurova, Ramil Həbilov, Gülbəniz Seyidova respublika üzrə keçirilən müsabiqələrdə iştirak edərək diplomlarla təltif edilmişlər. Bütün müəllimlər müxtəlif hazırlıq kurslarından keçərək sertifikat almışdır. 10 müəllim ixtisasartırma kursunda, 8 müəllim "Öyrədənlərin öyrədilməsi" kursunda iştirak edərək "Öyrədən" adını almışdır. 3 müəllim "Məktəb rəhbərlərinin hazırlıq kursu"nda iştirak etmişdir.

Qabaqcıl elmi idarəetmə qabiliyyətinə malik müəllimlərin qüvvəsindən səmərəli istifadə etmək məqsədilə 2011-ci ildə məktəbdə "Yaradıcı müəllimlər mərkəzi" təşkil olunmuşdur. Mərkəzin əsas məqsədi müəllimlərin elmi və metodiki hazırlığının yüksəldilməsinə, texnologiyalardan istifadə edilməsi bacarığının daha da artırılmasına xidmət etməkdir. Mərkəzin rəhbəri "Əməkdar müəllim" G.Seyidova qabaqcıl təcrübənin öyrənilməsi üzrə müntəzəm iş aparır, müxtəlif layihələrin həyata keçirilməsinə nail olur. 2016-cı ilin əvvəlindən məktəbdə "Əlini mənə ver" layihəsi həyata keçirilir ki, bu da hazırlığında problemi olan müəllimlərə kömək etmək məqsədini daşıyır. Müəllim hazırlığına texnologiyalardan istifadəyə baxış ongünlükləri təşkil edilir. Mərkəz vasitəsilə dəyirmi masalar, seminarlar təşkil olunur.

"Tədris prosesinin elmi idarə edilməsinin təlim-tərbiyənin kompleks həllində rolu və bunun fəaliyyətdə reallaşdırılmasının əsas istiqamətləri" mövzusunda

təşkil edilmiş “dəyirmi masa”, “Tədris prosesində yaradıcı düşüncə tərzinin formalaşdırılması “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının əsas tələblərindəndir” mövzusunda elmi praktik konfranslar nümunə olaraq göstərilə bilər.

Təhsil sahəsində gedən yeniləşmələr təhsilin elmi idarə olunması sahəsində yeniliklərin tətbiqini tələb edir. Bunu nəzərə alaraq 2015/2016-cı dərs ilinin əvvəlindən məktəbdə fənn birləşmələri fənn kafedraları ilə əvəz olundu. Bunun da əsas məqsədi məktəb müəllimlərinin məktəbin idarə edilməsində fəallığını daha da genişləndirmək, məktəblə ictimaiyyət və valideyn əməkdaşlığının yeni səviyyəyə qaldırılmasını təmin etməkdən ibarət idi.

Məktəbdə fəaliyyət göstərən “Gənc müəllimlər məktəbi” də gənc müəllimlərin formalaşmasında mühüm rol oynayır. Gənc müəllimlər hamiləri ilə əlaqəli işləyir, onların təcrübəsini öyrənir, müxtəlif seminarlarda iştirak edirlər. Gənc müəllimlərə kömək məqsədilə nümunəvi dərslər təşkil edilir.

Onu da qeyd etmək lazımdır ki, fənn birləşmələrini əvəz edən kafedraların fəaliyyət sahələri genişlənib, eyni zamanda müasir tələblərə uyğun olaraq 3 yeni kafedranın fəaliyyəti təşkil olunub.

1. Direktiv sənədlərin öyrənilməsi, tətbiqi, idarəetmə, qiymətləndirmə, monitorinq və qabaqcıl təcrübənin öyrənilməsi.

2. Ölkənin iqtisadi, sosial həyatı, iqtisadi biliklərin formalaşdırılması, bazar iqtisadiyyatı, iqtisadiyyat fənni.

3. Yaradıcı fəaliyyət, tədqiqat, yeni layihələrin hazırlanması və həyata keçirilməsi.

Kafedralar proqramların yaradıcı tətbiqinə, keyfiyyətcə yerinə yetirilməsinə, açıq dərslərin təşkilinə, fənn üzrə yaradıcı fəaliyyət üçün şəraitin yaradılmasına, müəllimlərin elmi hazırlığının və peşəkarlığının yüksəldilməsinə, tədqiqat işlərinin və sinifdənxaric tədbirlərin hazırlanıb həyata keçirilməsinə köməklik göstərirlər. 2015/2016-cı tədris ilində fənn kafedraları xətti ilə 182 saat, o cümlədən 73 saat nümunəvi dərs dinlənilmiş, 5 müəllimin qabaqcıl təcrübəsinin öyrənilib rayonda yayılması həll olunmuşdur. Kafedraların xətti ilə 153 məsələ müzakirə olunmuş, 12 layihə irəli sürülmüş, 8 respublika əhəmiyyətli layihədə iştirak etmişdir. 80-dən çox sinifdənxaric tədbirlər (dəyirmi masa, gecə, görüş, müsabiqə, müzakirə, yarış), ayrı-ayrı siniflərdə məktəbdaxili monitorinqlər keçirilmiş və nəticəsi müzakirə olunmuşdur. Cari tədris ilində də bu istiqamətdə iş davam etdirilir. Belə ki, dekabr ayında “Ana dili, ədəbiyyat və bədii yaradıcılıq” kafedrası xətti ilə məktəbin “Əməkdar müəllim”, “Yaradıcı müəllimlər mərkəzi”nin rəhbəri G.Seyidovanın IX sinifdə ana dilindən “açıq dərs saatı” təşkil olunmuşdu. Məktəbin iclas zalında təşkil olunmuş bu açıq dərs saatında RTŞ-nin işçiləri ilə yanaşı, ictimaiyyətin nümayəndələri, valideyn komitəsinin üzvləri, dərs aparılan sinifdə oxuyan şagirdlərin valideynləri və məktəbin müəllimləri olmaqla 230-dan artıq adam iştirak etmişdir.

“Sabahın alimləri” adlandırılan sinif şagirdləri yüksək hazırlıq, müəllim isə kurikulumla işləmək sahəsində yüksək ustalıq nümayiş etdirdi. Açıq dərsdən sonra sinif şagirdlərinin qüvvəsi ilə nümayiş etdirilən səhnəcik onların həyata nə dərəcədə hazır olduğunu bir daha göstərdi. Rayonda birinci dəfə təşkil olunan bu açıq dərs saatı təhsildə baş verən yeniliklərin tətbiqini tamamilə əks etdirdi. İştirakçıların yüksək rəyləri alqışlarla qarşılandı.

Ölkə prezidentinin düzgün siyasəti ölkənin yeni uğurlar qazanmasına, dinamik inkişafına imkan yaratmışdır. Əsas vəzifə bu inkişafın dayanıqlı olmasını təmin etməkdir.

2016-cı ilin əvvəlindən başlayaraq ölkədə sahibkarlığın genişləndirilməsi və ona yardım edilməsi sahəsində aparılan məqsədyönümlü işlər məhz bu məqsədə xidmət edir.

2015-ci ilin əvvəlindən məktəbimizdə "Ölkənin iqtisadi-sosial həyatı, biznes və sahibkarlıq fəaliyyəti, bazar iqtisadiyyatı" kafedrası fəaliyyət göstərir. Kafedra X sinif şagirdləri tərəfindən irəli sürülmüş "Ölkənin iqtisadi-sosial inkişafı naminə" layihəsini müdafiə etdi və onun həyata keçirilməsi üçün ardıcıl tədbirlərin yerinə yetirilməsini təmin etməyə başladı. Kafedra öz fəaliyyətində şagirdlərin həyata hazırlanmasına xüsusi yer verir, tədqiqat işlərində iştirakına da yardım edir.

Strategiyanın əsas məqsədlərindən biri də ölkəmizin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla da Azərbaycanın beynəlxalq rəqabət qabiliyyətini yüksəltməkdən ibarətdir. Ölkə prezidenti İlham Əliyevin böyük uzaqgörənliklə dediyi "Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik" fikri məktəbin bütün fəaliyyət sahələrində nəzərə alınır. Məktəbin fəaliyyət planını həyata keçirmək üçün "Dərs və dərsdənkənar fəaliyyətin inteqrasiyasını təmin etməklə müasir təfəkkürlü, yüksək bilik və bacarıqlara yiyələnən, rəqabətə davamlı insan resursu yetişdirmək" layihəsinin həyata keçirilməsinə başlanmışdır.

Tədris prosesində müəllimlərin apardığı işlər də öz təsirini göstərir. Xüsusilə kurikulum siniflərində dərsin motivasiya, tədqiqat və yaradıcı tətbiqetmə mərhələləri istedadlı şagirdlərin üzə çıxarılmasına daha çox imkan yaradır. Belə şagirdlərin ayrıca siyahısı hazırlanır və onlarla müntəzəm iş aparılır.

Aparılan işin nəticəsi olaraq şagirdlər respublika, zona üzrə keçirilən müsabiqə, yarış və təqdimatlarda fəal iştirak edir və nailiyyətlər qazanırlar.

Məktəbdə şagirdlərin elmi dünyagörüşünün formalaşdırılması istiqamətində bir sıra tədbirlərin həyata keçirilməsi təmin olunmuşdur. Hər il ümumi məktəb və ayrı-ayrı siniflər üzrə olmaqla 100-dən artıq tədbir həyata keçirilir.

Məlum olduğu kimi, 2016-cı il ölkə Prezidentinin sərəncamı ilə "Multikulturalizm ili" elan olunmuşdur. Bu çərçivədə məktəbdə 2016-cı ilin fevral ayında "Dünyanın rəngləri" adlı layihəyə start verildi. Martda isə 220 nəfərin iştirakı ilə geniş tərkibdə tədbir keçirildi. Müxtəlif millətlərin həyat tərzini əks etdirən sərgi ilə tanışlıqdan başlayan tədbir, iştirakçıların böyük marağına səbəb oldu. Müxtəlif millətlərin nümayəndələrinin iştirakı ilə hazırlanmış bədii yaradıcılıq nümunələri daha yüksək maraq yaratdı.

Məktəbdə təlim-tərbiyənin kompleks həllində, onun əsaslı şəkildə yaxşılaşmasında məktəb kitabxanasının çox böyük rolu vardır. Məktəbdə 35967 ədəd kitab, o cümlədən 8504 bədii ədəbiyyatı olan kitabxana fəaliyyət göstərir. Kitabxana xətti ilə çox maraqlı tədbirlər həyata keçirilir. Kitab təbliği ilə əlaqədar maarifləndirmə işi aparılır. Hamılıqla mütaliə razılıqla qarşılanır. Keçən dərs ilində kitab aylığı keçirildi. Müxtəlif sinif şagirdlərinin iştirak etdiyi aylıqda nəticə olaraq VIII və IX sinif şagirdləri Günay Qazaxova və Jalə Əfəndiyeva qalib oldular. Həmin şagirdlər eyni zamanda respublika üzrə keçirilən "ədəbiyyat biliciləri" müsabiqəsinin qalibi olmaqla I dərəcəli (G.Qazaxova) və III dərəcəli (J.Əfəndiyeva) diplomla və qiymətli hədiyyələrlə mükafatlandırıldılar.

Bu tədris ilində isə "Mütaliəni həyat tərzinə çevirək" layihəsi həyata keçirilir. Nəticə olaraq deyə bilərik ki, keçən il ilə müqayisədə oxucuların sayı 163 nəfər, oxunan kitabların sayı 1200 ədəd artıb. Bu

istiqamətdə iş davam etdirilir. Xüsusilə “Uşaq parlamenti”nin təşkil etdiyi “Şagird özünüidarə günü” şagirdlərin müstəqil fəaliyyətinin formalaşmasında xüsusi əhəmiyyət kəsb edir. “Dövlət rəmzlərinin ən yüksək bilicisi” baxış müsabiqəsi şagirdlərin daha həvəslə qatıldığı müsabiqədir. Uşaq hüquqlarına aid sənədlərin öyrənilməsi və tətbiqi ilə əlaqədar keçirilən tədbirlərdə şagirdlərin həyata hazırlanmasına böyük köməklik edilir. “Mənim Qanunum məni qoruyur” mövzusunda disput, “Hüquqlarımız, azadlıqlarımız, vəzifələrimiz” mövzusunda dəyirmi masa, “Mən və hüquqlarım” mövzusunda rəsm müsabiqəsi belə tədbirlərdəndir.

Kurikulum sahəsində islahatların davamı olaraq bu ilin buraxılış sinfi olan IX siniflərdə imtahanların gedişində bəzi dəyişikliklərin edilməsi və təmayülləşmənin genişləndirilməsi nəzərdə tutulur. Məktəbdə 1998-ci ildən təbiət təmayüllü siniflərin fəaliyyət göstərməsi də məktəbin bu sahədə təcrübəsinin olmasını deməyə imkan verir. Fəaliyyətə başladığı illərdən bu siniflər öz yüksək göstəriciləri ilə fərqlənir. Məktəbin lisey sinifləri üzrə uğurları ildən-ilə artır. Son 5 ildə lisey sinfi məzunlarından 23 nəfəri 600-700 arası bal toplamış, həmin məzunlardan 4 nəfəri “Qızıl medal” almışlar. Bu faktlar deməyə imkan verir ki, məktəb təmayülləşməyə tam hazırdır.

5 yaşdan təhsilə başlamaqla bağlı məktəbin heç bir problemi olmadı. Hazırda məktəbdə fəaliyyət göstərən iki hazırlıq qrupunda 42 nəfər azyaşlı təhsilə cəlb olunmuşdur. Yeni dərs ilində 3 sinifdə 64 nəfərin olacağı müəyyən edilmişdir. Bu sahədə maarifləndirmə işi davam etdirilir.

Hazırda məktəbdə keyfiyyətli təhsilin yeni istiqamətlərinin və onların icrası yollarının müəyyən edilməsi sahəsində iş aparılır. Məqsəd şəffaf idarəetmə modelini yaratmaq və onun tətbiqi ilə keyfiyyətli təhsilin formalaşmasına və məzunların həyata hazırlanmasına nail olmaqdır. Məqsəd aydınlığı və icraya nəzarət olmadan buna nail olmaq mümkün deyil. Elə buna görə də elmi idarəetməyə, idarəetmədə müəllimlərin rolunun artırılmasına, valideyn və ictimaiyyətlə əməkdaşlığın yüksəldilməsinə xüsusi yer vermək bu günün əsas göstəricisidir.

*Rəyçi: dos. R.Qəndilov*

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu. // Azərbaycan məktəbi, 2009, №6.
3. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
4. Ağayev Ə. Yeni təlim metod və texnologiyalarından istifadənin nəzəri və praktiki məsələləri. Bakı, 2006.

**Ш.Абдуллаева**

**Качественное образование является одним из основных показателей, динамического роста страны**

**Резюме**

В статье говорится о роли качественного образования в динамическом развитии страны.

**Sh.Abdullayeva**

**Education of high guality is one of the main sign of dynamic development of the country**

**Summary**

This article is about the role of quality education in the dynamic development of the country.



# DƏRSİN SƏMƏRƏLİLİYİNİN ARTIRILMASI ÜSULLARI

**Nəsrəddin Musayev,**
***"Azərbaycan məktəbi" jurnalının baş redaktor müavini, Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

Məqalədə interaktiv metodun tətbiqinin müsbət nəticələrindən danışılır. Qeyd olunur ki, interaktiv metod şagirdlərdə müstəqil düşünməyi, sərbəst fikir söyləməyi, başqalarını dinləmək qabiliyyətini inkişaf etdirir. Təcrübə göstərir ki, interaktiv təlim zamanı şagirdlərin özünə inamı artır, şəxsiyyətlərarası münasibətlər yaxşılaşır, məktəbə və oxumağa meyil çoxalır.

***Açar sözlər:*** *interaktiv, qrupla iş, təlim prosesi, didaktika, pedaqoji təcrübə.*

***Ключевые слова:*** *интерактивный, работа в группах, учебный процесс, дидактика, педагогический опыт.*

***Key words:*** *interactive, group work, teaching process, didactic, pedagogical experiment.*

Müasir dövrdə təhsil müəssisələrinin əsas vəzifəsi intellektual səviyyəli, mənimsədiyi bilik və bacarıqlardan istifadə etməyi bacaran, mənəvi-əxlaqi keyfiyyətlərə yiyələnmiş, milli düşüncəli şəxsiyyətin yetişdirilməsindən ibarətdir. Təhsil sahəsində aparılan çoxşaxəli islahatlar da hərtərəfli inkişaf etmiş, kreativ düşüncəli, hadisələrə tənqidi yanaşmağı və düzgün nəticə çıxarmağı bacaran istedadlı gənclər yetişdirməyi tələb edir. Buna nail olmaq üçün təhsili inkişaf etmiş ölkələrin təcrübəsini öyrənmək, tədris prosesini müasir dərsə qoyulan tələblər səviyyəsində qurmaq çox vacibdir. Ölkəmizdə təhsil sahəsində daha səmərəli metodları tətbiq etmək, təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalar və təlim metodlarından istifadəyə üstünlük verilməsi də bu məqsədə xidmət edir. Belə metodlardan biri də interaktiv təlim metodudur.

İnkişaf etmiş ölkələrin təcrübəsindən də görünür ki, məktəbdə hər bir dərsə təhsilalanlar üçün təfəkkür və intellekt məkanı kimi baxılır. Bu məqsədlə müasir təlim metodlarının düzgün və məqsədyönlü tətbiqi başlıca şərt hesab edilir. Əgər ənənəvi dərs üsulunda əsas biliklər müəllim tərəfindən verilirdisə, interaktiv təlimdə üstünlük təhsilalanlara verilir. Onlar daim axtarışda olur, fikirlərini aydın şəkildə ifadə etməyə, əldə etdikləri bilik və bacarıqların düzgün tətbiqinə çalışırlar. Təcrübə göstərir ki, fəal təlim metodu təlimin keyfiyyətinin artırılmasına güclü təsir göstərir, dərsi çox maraqlı və cəlbedici edir. Bu metodlar təhsilalanlarda təfəkkürü inkişaf etdirdiyinə, onları düşündürdüyünə, axtarışlar aparmağa vadar etdiyinə, dərsdə fəallaşdırdığına və bir şəxsiyyət kimi formalaşdırdığına görə interaktiv metodlar adlandırılır. Bu metodların tətbiqi ilə qurulan dərslər təhsilalanların təfəkkürünü, qabiliyyətini, meyil və maraqlarını inkişaf etdirir. Zülfiyyə Veysovanın qeyd etdiyi kimi, şagirdin aktiv fəaliyyəti, müəllimin şagirdlə və şagirdin bir-biri ilə

əməkdaşlığı, didaktik, rollu oyunlardan istifadə olunması, şagirdlərin işgüzar fəaliyyəti üçün sinifdə sosial bərabərliyin və psixoloji mühitin yaradılması, müəllimin bilik xəzinəsi rolunu deyil, biliklərin axtarılması və tədqiqatın aparıcısı rolunu ifa etməsi interaktiv təlim metodları üçün səciyyəvi xüsusiyyətlərdir.

Fəal təlim metodlarının tədris prosesinə daxil edilməsi məzmunun öyrənilməsinə səmərəliliyin artırılmasına, təhsilalanların dərketmə fəaliyyətinə, onlarda passivliyin aradan qaldırılmasına, yaradıcılıq qabiliyyətinin formalaşdırılması və təlimin keyfiyyətinin yüksəldilməsinə şərait yaradır. Bunlardan səmərəli və məqsədyönlü şəkildə istifadə etməklə demokratikləşdirmə, humanistləşdirmə, diferensiallaşdırma, fərdiləşdirmə və inteqrasiya prinsiplərini arzu olunan səviyyədə həyata keçirmək olar. Təcrübə göstərir ki, fəal təlim zamanı təhsilalanların özünə inamı artır, şəxsiyyətlərarası münasibətlər yaxşılaşır, məktəbə və oxumağa meyil çoxalır, bir sözlə, təlimin keyfiyyətinin yüksəldilməsinə şərait yaranır. Təhsilalanlarda sürətli şəkildə yeniləşən şəraitə uyğunlaşma və onun həyata keçməsinə imkan yaradan bu qabiliyyətlərin formalaşdırılması fəal təlimi zəruri etmişdir. Yeni metodlarla işləyən müəllim dünyada və ölkəmizdə gedən inkişaf tendensiyalarını mənimsəməklə fəal dərsin nə zaman, hansı məqsədlərə görə istifadəsini, necə qurulmasını, təhsilalanların səviyyəsinə uyğunlaşdırılmasını düzgün müəyyənləşdirə bilər.

İnteraktiv təlim metodları əməkdaşlıq şəraitində tətbiq edildikdə səmərəli olar. Əməkdaşlıq isə o vaxt mümkündür ki, qarşı tərəflər arasında (öyrədən-öyrənən) səmimiyyət, hörmət, ən başlıcası isə yüksək dərəcədə inam olsun. Humanistləşdirmə prosesinin bu komponentləri olmadan interaktiv təlimdə əməkdaşlıqdan söhbət belə gedə bilməz.

Təhsilalanların aktiv fəaliyyətini təmin etmək, fəallığına və müstəqilliyinə maksimum üstünlük vermək fəal təlimin əsas məqsədlərindən sayılır. Elə məqam yetişməli, güclü ehtiyac duyulmalıdır ki, ciddi fəaliyyətə başlamaq üçün hazır olasan. Aktiv fəaliyyət isə təhsilalanların daxili imkanlarının, onların buna qədər əldə etdikləri bilik və bacarıqların, dolğun elmi məlumatların zəminində, normal sosial - psixoloji iqlim şəraitində baş verir. Beləliklə, təhsilalan o vaxt canlı fəaliyyətə qoşulur ki, özünün öyrəndiyi, qazandığı elmi anlayışların düzgünlüyünə inansın və bunun tətbiqi prosesində öz cəsarətinə güvənə bilsin.

Müşahidələr göstərir ki, fəal təlim metodu təhsilalanlarda müstəqil düşünməyi, sərbəst fikir söyləməyi, özünüqiymətləndirməni, öz təcrübəsini və biliyini təhlil etmək qabiliyyətini, əməkdaşlığı, başqalarını dinləməyi, yoldaşlarının fikirlərinə hörmətlə yanaşmağı, öz fikirlərini arqumentlərlə əsaslandırmağı inkişaf etdirir. Bu tələblərin reallaşdırılması isə o vaxt mümkün olur ki, təhsilalanlarda özünəinam, həqiqəti, düzgünlüyü müdafiə etmək bacarığı, daxili aləmin saflığı, qarşılıqlı hörmət, güzəştə getmək mədəniyyəti, xüsusilə də humanist hislər təşəkkül tapsın. Suxomlinskinin dediyi kimi, ləyaqət olmadan mənəvi zənginlik ağılabatan deyil. Deməli, müasir dərsdə təhsilalanın şəxsiyyət olduğu nəzərə alınmalı, o, təlim-tərbiyə prosesinin bərabərhüquqlu subyekti kimi qəbul edilməlidir.

Təhsilalanlara münasibətdə ayrıseçkiliyə son qoymaq, onların öz düşüncələrini sərbəst və azad ifadə etməyə imkan yaratmaq, hüquqlarının qorunmasına nail

olmaq müəllimlərin başlıca vəzifəsidir. Bütün bunları müasir dərsə verilən tələblər də zəruri edir. Çünki təhsilalan milli və ümumbəşəri səciyyəli bilikləri, bacarıq və vərdişləri, mənəvi keyfiyyətləri məktəbdə müəllimin köməyi ilə mənimsəyir.

Fəal təlim metodlarının ən təqdir olunası cəhətlərindən biri də təhsilalanların fəallığının maksimum artırılmasıdır. Dərsdən sonra təhsilalan nə isə yeni bir şey öyrənə bilibsə, müəyyən bilik və bacarığa yiyələnibsə, yoldaşları və müəllimləri ilə faydalı ünsiyyətə girə bilibsə, müəllimi tərəfindən bir şəxsiyyət kimi qəbul edildiyini görübsə, deməli, həmin dərs səmərəli olmuşdur. Bu, hər bir müəllimin işinin ölçü vahidi kimi qəbul edilməlidir.

Fəal təlim zamanı daha çox istifadə edilən iş formalarından biri də qrupla işdir. Bu iş forması təhsilalanlarla problemin birgə həll edilməsini, bir-birinin fikrinə hörmətlə yanaşmağı, müstəqil düşünməyi, sərbəst fikir söyləməyi öyrədir. Qrupla iş müstəqil öyrənmə qabiliyyətinin inkişaf etdirilməsinə, təlimin fərdiləşdirilməsinə və şagirdin özünü tam mənada şəxsiyyət kimi hiss etməsinə imkan verir. Qrupla işin səmərəli təşkili üçün işin təşkilini dəqiq fikirləşmək, qaydaları uşaqlara başa salmaq, məqsədi tam təsəvvür etmək, iş üçün lazım olan materialları əvvəlcədən hazırlamaq, qrupda iş qaydalarına riayət edilməsinə nəzarət etmək başlıca şərtlərdəndir. Bu prinsiplərin hər biri müəllimdən pedaqoji ustalıq, nəzəri cəhətdən hazırlıq və təcrübə tələb edir.

Təcrübə göstərir ki, qruplarla işin aşağıdakı formada təşkili daha məqsədəuyğundur:

- şagirdlər 3-5 qrupa bölünür və əvvəlcədən hazırlanmış ayrı-ayrı masaların arxasında əyləşir;
- müəllimlər müəyyən edilmiş mövzu üzrə suallar hazırlayır, qaydaları izah edir və işin icrası üçün vaxtı elan edir;
- şagirdlər hazırladıqları cavabları təqdim etmək üçün öz aralarından bir nəfər seçir;
- müəllim bütün qrupların işinin gedişinə nəzarət edir;
- vaxt bitdikdən sonra müəllim işi dayandırır və məruzəçilərdən nəticələri bildirməyi xahiş edir.

Hər qrup öz nəticəsini təqdim edir. İş vərəqləri və testlərin cavabları lövhədən asılır. Müəllim ümumi diskussiyanı idarə edir, qrupların işinin yekunlarını tutuşdurur və ümumiləşdirmə aparır. Hər qrupun cavablarına öz münasibətini bildirir, səhvlər varsa, onların düzgün izahını verir.

Müzakirə prosesində şagirdlərə suallar verir. Onların cavablarını ümumiləşdirir, testlərin cavablarını qruplarla birgə yoxlayır və nəticələri elan edir. Hər qrup üçün meyar cədvəli hazırlayır. Dərsin bütün mərhələlərində qiymətləndirmə aparır.

Müəllim qruplarla iş qaydalarını müəyyənləşdirərkən qrup üzvlərinin vəzifələrini düzgün bölməli, lideri düzgün müəyyənləşdirməkdə qrup üzvlərinə yardım etməli, hər kəsin öz şəxsi fikrini söyləməsi üçün imkan yaratmalı, qruplar arasında ayrı-seçkiliyə yol vermədən sağlam rəqabət aparılmasına nail olmalıdır. Qrup işi zamanı fəal olmaq, öz fikrini faktlarla əsaslandırmaq və problemin həllində düzgün mövqe nümayiş etdirmək də bu iş forması üçün vacib şərtlərdəndir.

***Rəyçi: prof. İ.Cəbrayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür.

Bakı: Adiloğlu, 2001.

2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.

3. Məmmədov T. Təhsildə İKT. Naxçıvan: Əcəmi, 2011.

4. Yeni təhsil proqramlarının tətbiqi məsələləri. Bakı, 2014.

5. Azərbaycan Respublikasında ümumi təhsilin konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.

6. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirləri. Bakı: Adiloğlu, 2006.

7. Veysova Z. Fəal (interaktiv) təlim. Müəllimlər üçün vəsait. Bakı, 2007.

8. Məmmədova E. Yeni məzmun yeni yanaşma tələb edir. // Azərbaycan məktəbi, 2013, № 5.

**Н.Мусаев**

**Методы увеличения рациональности урока**

**Резюме**

В статье говорится о положительных результатах применения интерактивных методов. Отмечается, что интерактивный метод развивает такие качества, как уметь слушать других, свободно мыслить, уметь свободно высказывать свои мысли. Опыт показывает, что во время интерактивных уроков повышается самоуверенность учащихся, улучшаются межличностные отношения интерес к учобе растет.

**N.Musayev**

**Methods to improve lesson efficiency**

**Summary**

In the article it is spoken about the positive results of implementation of interactive methods. It is noted that, interactive methods help students develop their skills of independent thought, and communicative skills. In the process of interactive learning, improvement was observed in students’ self-esteem and their interpersonal relations, as well as their interest in learning and school in general.

* * *

# YENİ TƏLİM METODLARINDAN İSTİFADƏ ZAMANI MÜƏLLİMİN FƏALİYYƏTİ

**Pəri Paşayeva,**
***ADPU-nun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *kurikulum, metod, iş forması, iş üsulu.*
***Ключевые слова:*** *курикулум, метод, форма работы, методы работы.*
***Key words:*** *curiculum, method, form of the work, style of the work.*

Azərbaycanda təhsil sistemində aparılan köklü dəyişikliklər təhsilimizin dünya təhsilinə inteqrasiya edilməsinə də yol açmışdır. Uzun illər təhsilimizdə hökm sürən inzibati-amirlik qaydaları aradan qaldırılır, şagirdyönümlü təhsil sisteminə nail olmaq üçün çox mühüm işlər görülür. Müasir təlim texnologiyaları, metodları Azərbaycan təhsil sistemində yaradıcılıqla istifadə olunur.

Son təhsil islahatları özünün ən bariz nümunəsini kurikulum modelində tapır. Kompüter texnologiyası və interaktiv təlim metodları kimi kurikulum anlayışı da Azərbaycan təhsili üçün yenidir. Kurikulum təhsil prosesi ilə bağlı müəllimlə şagird fəaliyyətinin səmərəli təşkilinə, məqsədyönümlü və ardıcıl həyata keçirilməsinə imkan yaradan konseptual sənəddir.

Müasir dövrdə yeni texnologiyaların, yeni təlim metodlarının tətbiqi müəllimin iş üsulunu şagirdlərin bilik almaq üçün müstəqil axtarışlar aparmalarına, yaradıcı fəaliyyətlərinə, təfəkkürə istinad etmələrinə, öyrənmə maraqlarına uyğun müəyyənləşdirməyi zəruri edir.

Təhsilin indiki mərhələsində əsas diqqət uşağın şəxsiyyətinin inkişafına verilir. Bu özünü nədə göstərir? Şəxsiyyətin təhsilin ibtidai mərhələsindən başlayaraq inkişafını təmin etməkdə, oxumaq, yazmaq bacarığı və vərdişlərini təlim fəaliyyətinin digər bacarıq və vərdişlərini əldə etməkdə, təfəkkürə, nitq inkişafına, sağlam həyat tərzi elementlərinə yiyələnməkdə göstərir.

Tədris prosesində müxtəlif iş formalarından, yeni interaktiv təlim üsullarından istifadə olunması müasir tələblərdən irəli gəlir. Müəllim nəzərə almalıdır ki, hər bir mövzunun qavranılması, yüksək təlim nəticələrinin əldə edilməsi, ilk növbədə dərsdə öyrədici mühitin formalaşması ilə sıx bağlıdır. Öyrədici mühit elə təşkil edimәlidir ki, şagird müstəqil şəkildə fərziyyələr irəli sürə bilsin, tədris zamanı əldə etdiyi biliyi real həyatla əlaqələndirməyi bacarsın. Bu mühit elə təşkil olunmalıdır ki, bütün şagirdlərin əməkdaşlığına yeni biliklərin mənimsədilməsi və tətbiq edilməsinə şərait yaradılsın. Tədris prosesində şagird bilik əldə etmək, ünsiyyət qurmaq, əməkdaşlıq etmək üçün çətinlik çəkməməli, təlim metodlarından düzgün istifadə edərək gələcək inkişafı üçün maksimum imkanlar əldə etməlidir.

Tədris prosesində fəal təlim metodlarından istifadə olunması şagirdlərin hər şeyi öyrənmək həvəsini gücləndirir, onların öyrənmə fəallığını, təfəkkürünü inkişaf etdirir və təlimin səmərəliliyini artırır. Dərs zamanı şagird tədqiqatçı mövqeyində çıxış

edir. O, müstəqil araşdırma aparır. Bu heç də müəllimin rolunu azaltmır. Müəllim burada yol göstərən, istiqamət verən, əlavə sualların köməyi ilə şagirdləri istiqamətləndirən və fəallaşdıran, onların biliklərə yiyələnmələrinin iştirakçısı rolunu oynayır.

Təlim zamanı müəllim öyrətmə anlarını düzgün planlaşdırmalı, şagirdlərə biliyi hazır verməməli, onlarda bilik əldə etməyə həvəs oyatmalı və öyrənənlərin fəal düşünmələrini təmin etməlidir. İnteraktivlik şagirdlərin müəllimin rəhbərliyi altında müxtəlif informasiya mərhələlərindən məlumat alma bacarığını inkişaf etdirir. İnteraktiv priyomlar eyni zamanda şagirdlərdə yeni keyfiyyətlər formalaşdırır. Onlar müsahibini, radio-televiziya verilişlərini dinləməyi, söylənilən fikirlərə hörmət etməyi, müstəqil tənqidi və yaradıcı düşünməyi, sərbəst fikir söyləməyi, məntiqi təfəkkürünü inkişaf etdirməyi, kollektiv üzvləri ilə əməkdaşlıq etməyi, başqasının fikrinə ədalətlə yanaşmağı bacarmalıdır.

Bu gün şagirdlərin yaradıcı düşünməsinə, biliklərə sərbəst yiyələnmə qabiliyyətlərinin inkişaf etdirilməsinə xidmət göstərən texnologiyalardan istifadə etmək tələb olunur. Təlim metodlarının əsas funksiyaları təlimedici, tərbiyəedici və inkişafetdirici funksiyalardır. Şagirdlərin təlimin məzmununu müvəffəqiyyətlə mənimsəmələri üçün onlardan yüksək idraki fəallıqla yeni metodlardan səmərəli istifadə etmək bacarığı tələb olunur. Təlimin inkişafetdiriciliyindən söz düşəndə şagirdin inkişafını təmin edən xüsusi metodların axtarılması başa düşülür, halbuki bütün metodların inkişafetdiricilik vəzifəsinin yerinə yetirilməsinə nail olmaq lazımdır. Seçilən metod şagirdlərin fikirlərinin, yaradıcı təxəyyülünün zənginləşməsinə və ümumi inkişafına kömək etməlidir. Metodların seçilməsi zamanı bir sıra şərtlər nəzərə alınmalıdır. Seçilən metod şagirdlərdə problem məsələləri həll etməyə tələbat oyatmalı, onlara fikirləşməyi öyrətməlidir. Bu zaman müəllim şagirdlərin yaşını, bilik səviyyəsini, qavramasını nəzərə almaqla, məktəbin maddi bazasını və özünün şəxsi hazırlığını da nəzərə almalıdır. Təcrübə göstərir ki, müəllimlərin əksəriyyəti dərsə uyğun metod seçməyi və fəaliyyətin başqa növlərini ona tabe etməyi bacarmır. Dərs üçün metod seçərkən, ilk növbədə dərsin məqsədi, gözlənilən nəticə, şagirdlərin yaşı, onlarda olan bilik, bacarıq və vərdişlər, yoxlama üsullarının keçirilməsinə müvafiq şərait və vaxt nəzərə alınmalıdır. Metod eyni zamanda şagirdlərin təfəkkürünün inkişaf etdirilməsinə və onlarda formalaşdırılacaq vərdişlərə uyğun olmalıdır. Bu zaman şagirdlərin müstəqilliyinin təmin olunması və materialın problemlilik dərəcəsi diqqət mərkəzində saxlanılmalıdır. Tədris zamanı ən çox istifadə olunan təlim üsulları bunlardır: “BİBÖ”, “Əqli hücum”, “Şaxələndirmə”, “Anlayışın çıxarılması”, “Venn diaqramı”, “Diskussiya”, “Rollu oyun”, “Müzakirə”, “Debat”, “Ziqzaq”, “Karusel” və s. Dərs prosesində bu üsulların bir neçəsindən istifadə etmək olar.

Təlim prosesində bu qədər rəngarəng təlim metodlarının olması dərsi maraqlı etməklə yanaşı, eyni zamanda müxtəlif problemlərin yaranmasına da səbəb olur. Belə ki, bu qədər metodların içindən dərsin məqsədinə uyğun metodları necə seçmək olar.

Metodlar hansı meyarlar əsasında seçilir? Bunun üçün müəllim hər bir metodun fərqli xüsusiyyətlərini, onun alqoritmini bilməlidir. O, əvvəlcədən şagirdlərdə hansı kompetensiyaları; bilik, bacarıq və vərdişləri inkişaf etdirmək istədiyini müəyyənləşdirməli və həmin məqsədlərə uyğun texnikaları seçməlidir. Yadda saxlamaq lazımdır ki, hər

bir texnika müxtəlif məqsədlərə istiqamətləndirilə bilər.

Təlim texnikalarının tipindən və təlim məqsədlərindən asılı olaraq dərs zamanı müəllim bir və ya bir neçə texnikadan istifadə edə bilər. Təlim üsullarının seçilməsi zamanı digər meyarlar da nəzərə alınmalıdır. Bunlar aşağıdakılardır:

1.Texnikanın həyata keçirilməsi üçün lazım olan vaxt;

2. Dərsin mövzusunun əhəmiyyətlilik dərəcəsi;

3. Dərsin mərhələləri (dərsin hansı mərhələsində istifadə olunması).

Göstərilən təlim üsullarından başqa dərs prosesində müxtəlif iş formalarından da istifadə olunur. İş formaları bunlardır: böyük qrupla iş (bütün siniflə), kiçik qrupla iş, cütlərlə iş və fərdi iş. Dərs prosesində müvafiq olaraq bu iş formalarından da istifadə olunur.

Göründüyü kimi, metodika şagirdlərin təlim materiallarının mənimsəmə şəraitini təhlil edərək daha əlverişli sistem qurmaqda müəllimə kömək edir və müəllimin işinin formalaşmasına təsir edir.

*Rəyçi: prof. Ə.Tanrıverdiyev*

## İstifadə edilmiş ədəbiyyat

1. Kərimov Y. Təlim medodları. Bakı, 2007.

2. Kərimov Y. İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası (dərslik). Bakı, 2013.

3. Abdullayev A. Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası. Bakı, 1964.

4. Abbasov Ə. Yeni fənn kurikulumlarının səciyyəvi cəhətləri. // ARTİ-nin "Elmi əsərləri", 2007, №1.

5.Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.

6.Yusifov F. Ədəbiyyatın tədrisi metodikası. Bakı, 2009.

7. "Kurikulum" jurnalı, 2013.

**П.Пашаева**

**Деятельность учителей в области применения новых методов обучения**

**Резюме**

В этой статье рассмотрены новый методы обучения. Курикулум направлен на формирование личности как основной движущей силы развития общества, и обеспечение соответствующего уровня образования и навыков, необходимых для разрешение проблем и самостоятельного принятия решений, увеличения роли информационных и коммуникационных технологий, и усиления конкуренции. Курикулум обеспечивает эффективность учебной среды и преподавательной деятельности на отдельных этапах образования.

**P.Pashayeva**

**Teachers' activity in the application of new teaching methods**

**Summary**

This article deals with the new teaching methods. In education, a curriculum is broadly defined as the totality of student experiences that occur in the educational process. The term often refers specifically to a planned sequence of instruction, or to a wiew of the student`s experiences in terms of the educator`s or school`s instructional goals. Curriculum may incorporate the planned interactional content, materials, resource and processes for evaluating the attainment of educational objectives. Curriculum planning and carefully designed teaching methods are fundamental to providing quality education.



# TƏDRİSDƏ KOMMUNİKATİV BACARIQLARIN FORMALAŞMASINA DAİR

**Fəridə Hüseynova,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun dissertantı***

Məqalədə müasir dövrdə ingilis dilinin tədrisində kommunikativ yanaşma metodunun tətbiqindən danışılmış, bu yanaşmanın səmərəli təşkili yollarının araşdırılması təhlil edilmiş və əsaslandırılmışdır.

***Açar sözlər:*** *kommunikasiya, şifahi nitq, aspektlər, formalaşmaq.*
***Ключевые слова:*** *коммуникация, устной речи, аспекты, формованные.*
***Key words:*** *communication, oral  speech, aspects, formation.*

Qlobal dil kimi üstünlük təşkil edən ingilis dilində rabitəli və sürətli danışıq fəaliyyəti sahəsi son vaxtlar metodiki ədəbiyyatda ən çox öyrənilən sahədir və bu sahədə yaranan problemlərə marağın artdığı müşahidə olunmaqdadır. İngilis dilinin tədrisində kommunikativ bacarıqların formalaşmasını metodoloji baxımdan təhlil edərkən, bir çox faktorların və metodiki çatışmazlıqların olduğu da görünür. Danışıq fəaliyyəti kommunikasiyanın əsas və vacib komponenti kimi kurikulumun əsas tələblərindən hesab olunur.

Ümumtəhsil məktəblərində ingilis dili dərslərində şagirdlərin şifahi nitq fəaliyyətinin səmərəli yollarının inkişaf etdirilməsində şifahi nitqin meyarlarının müəyyən edilməsi, müxtəlif metodların tətbiqi kommunikativ bacarıqların formalaşmasına xidmət edir.

Kommunikasiyanın tələbləri nitq fəaliyyətinə nə qədər tez daxil olsa, bu bacarıqlar mümkün qədər vaxtında formalaşa bilər. Bizim üçün mühüm əhəmiyyət kəsb edən fakt ondan ibarətdir ki, təlimdə işlənən metodların səmərəli tətbiqi həm müəllimə, həm də şagirdə elə bir mühit yarada bilsin ki, onlar danışıq fəaliyyəti zamanı rahat, sərbəst ünsiyyət qura bilsinlər. V sinifdən başlayaraq şagirdlər artıq kiçikyaşlı uşaqlardan fərqli olaraq təkrarlamalardan, xüsusi intonasiya, tələffüz qaydalarına tabe olmaqdan imtina edir, daha çox sərbəst fikirlərə, çıxışlara üstünlük verirlər. Onlar müxtəlif həyat hadisələrinə maraq hiss edir, bunlara daha tez reaksiya verir və öz münasibətini bildirirlər. Onlarda bu dildə müraciətləri, təklifləri yerli-yerində işlətmək, hadisələrə qarşı razılıq və narazılıqlarını ifadə etmək, öz məsləhət və təkliflərini vermək ehtiyacı yaranır, dilin bir sosial davranış kimi məqsədyönlü şəkildə qazanılmasına həvəslənirlər.

M.Svon yazır ki, VI-VIII siniflərdə əsas məqsəd kommunikativ yanaşmada tətbiq olunan nitqdə dilin dəqiq, səlis xarakterdən çox, axıcı və rabitəli xarakterə malik olmasına şərait və imkanın yaradılmasıdır. Şagirdlər dili sərbəst şəkildə öyrənməyə cəlb olunmalıdırlar. Amma bu yanaşmada heç bir metodiki yanaşma və şagird tələbləri nəzərə alınmır və müasir kommunikasiyanın yaranmasında müəyyən qədər çətinliklər müşahidə olunur. Şagirdlər danışıq zamanı fəaliyyətin növündən asılı olaraq, onun hansı məqsədlə işlədiyini düz-

gün ifadə etməyi bacarmalıdırlar.

Şifahi nitqin formalaşmasında ünsiyyətin qurulması nə qədər çox nəzərə alınmasa da, uyğun kommunikasiya üçün danışma, lüğətin, tələffüzün və qrammatik qaydaların ən mühüm sahə olduğu bir çox ədəbiyyatlarda təqdim olunur. Təlimdə səmərəli ünsiyyət yalnız ilk öncə danışıq fəaliyyətində tətbiq olunmalıdır. Bu sahədə bir sıra kommunikativ metodlar tətbiq edilməyə başlanmışdır [75,139,161].

Şifahi nitq bacarıqlarını formalaşdıran kommunikativ metodlar.

Danışıq zamanı kommunikativ fəaliyyətlərin real məqsədləri xarici dildə dinləyib – anlama, danışma, oxu və yazı bacarıqlarının formalaşmasına diqqəti yönəldərək, məlumat əldə etmək, nitq baryerlərini aşmaq, özünü təqdimetmə bacarıqları qazanmaq, mədəniyyətləri öyrənmək və cəmiyyətin fəal üzvü olmaqdır (Moss & Ross-Feldman, 2003). Bu fəaliyyətlərə müxtəlif metodlar məcmusu, yanaşmalar, üsul və vasitələr, nitq modelləri, şifahi və yazılı kommunikativ nitq çalışmaları daxildir. Ən son nümunəvi kommunikativ metodlara "Tapşırıqlı təlim metodu” (TBL), TPR - Fiziki hərəkətlərə cavab (Total Physical Response), Çevik dəyişmə metodu (Flipped Learning), İnformasiya boşluqları (Information Gap), kompüter əsaslı dilin öyrənilməsi (CALL), mətnlərin dialoqlaşdırılması, oyunlar, komandalarda müzakirə, layihə əsaslı təlim (Project based learning) və s. daxildir.

Danışıq zamanı kommunikativ vərdişlərin hansı komponentlərdən ibarət olmasını bilmək təlimdə çox vacib şərtlərdir. Bu şərtlərə məlumatı ötürən və qəbul edən arasında olan prosesin müxtəlif metodlarla tədris olunması daxildir ki, bu mexanizmlərə yazılı və danışılan sözlər, qeyri-verbal hərəkətlər və s. daxildir.

Kommunikativ nitq fəaliyyətinin komponentlərinin düzgün tətbiq edilməsi baxımından son ədəbiyyatlarda isə dinləyib-anlamanın, danışma fəaliyyətinin tiplərinin müəyyən edilməsi, bədən dilinin, jestin, mimikanın yerli-yerində işlənməsi, oxu və yazının düzgün strategiyalarının işlədilməsi, intonasiya, aydın səs tonu, inandırıcı ifadə tərzinin olması, lüğətin və qrammatik qaydaların ünsiyyət çərçivəsi daxilində öyrədilməsi əsas götürülür.

Danışıq fəaliyyətinin növlərinin düzgün anlaşılması üçün müəllim və şagirdlərin nitq fəaliyyətinin müxtəlif funksiyalarını anlaması və onun təbiətinin açılması çox vacib şərtlərdir.

İnteraktiv danışıq fəaliyyəti (İnteractive Speaking) müasir metodların tətbiqində ən çox işlənən və kommunikasiya üçün daha geniş və əlverişli mühit yaradan fəaliyyət növüdür. Qruplarda və kollektivdə, bəzən də cütlükdə interaktiv şəkildə ünsiyyət prosesi yaranır. V-IX siniflərdə şagirdlərin dilin qarşılıqlı təsirdə öyrənilməsində interaktivliyin transaksional məqsədinə çatmasına imkan yaradılmalıdır, yəni onları qarşılıqlı fikir mübadiləsinə cəlb edərək eyni zamanda sosial vərdişlərin formalaşmasına nail olması tələb olunur. İnteraktiv danışıq fəaliyyətində dil praqmatik şəkildə kompleks xarakter daşıyır və dil daha çox kollokval xarakter daşıyır, bu zaman qısaltmalardan, jarqonlardan və digər sosial konvensiyalardan istifadə olunması təklif olunur. Danışana mane olmağı gizlətmək və öz fikrini bildirmək üçün üzdə ifadə tərzinin danışanın fikrinə münasibət bildirməsi də vacib nüansdır.

Səmərəli kommunikasiya üçün tətbiq olunan metodlar eyni zamanda qeyri-verbal xarakter daşıyır ki, buraya jestin, mimikanın, bədən dilinin yerli-yerində nümayişi, ünsiyyət vərdişlərinin, əsasən, əllərin hərəkəti, üz ifadəsinin, mimikanın aydın göstərilməsi daxildir. Səs tonunun düzgün

işlənməsi danışıq prosesində müraciətlərin ünvanlanmasında şagirdlərin bu vərdişləri özlərində formalaşdırması çox mühümdür. Məlumatların ötürülməsində onların qarışdırılmaması da əsas şərtlərdən biridir. Müşahidələr zamanı şagirdlərin bəzən məlumatların məzmununu anlamadan sistemsiz ifadə etməsində üz ifadələrinin yersiz işlənməsi daha çox müşahidə olunur.

Bədən formasının mövzunun məzmununa uyğun dinamik formada dəyişilməsi də kommunikasiyanın ən vacib şərtidir. Söhbət zamanı çiyinlərin hərəkəti, əllərin məqsədəuyğun işlədilməsi, göz təmasının düzgün qurulması qarşıdakı tərəfi tam özünə inandırmağa və məlumatın vacibliyinə yönəltməyə imkan yaradır.

Digər tərəfdən, effektiv kommunikasiyada ikinci tərəflə tam razılaşmasan belə, tənqid etməyi, günahlandırmağı, mühakimə etməyi kənara qoyub onun fikirləri, düşüncələri ilə razılaşmalısan. İkinci faktor isə, danışanla əlaqəni kəsməmək, danışanın fikrinə qısa parafrazlarla cavab vermək də əsas şərtdir. Məsələn, danışanın nitqini tam anladığını nümayiş etdirmək üçün uyğun təkliflərdən isifadə etmək lazımdır.

Fikrimcə, şagirdlərin danışmadan öncə lazımi dinləyib-anlama bacarıqlarını formalaşdırmaq uyğun tapşırıq nümunələrinin və fəaliyyətlərinin seçilməsini müəyyənləşdirən maraqlı və diferensial əlamətlərə malik fəaliyyətlərin tətbiqindən ibarətdir.

Şagirdlərin kommunikasiya zamanı təmkinli, vicdanlı, həssas, səmimi, hörmətcil və tolerant olması vacib faktorlardandır. Səmərəli dinləyib-anlama, intonasiya, lüğətin inkişafına daha çox imkan yaratmaq şagirdlərin kommunikasiyaya tam hazır olmasını şərtləndirir. Bu şərtlərin tam təminatı nitq fəaliyyətinin komponentlərinin yerinə yetirilməsinə əsaslanır.

Dinləyib-anlama və danışıq fəaliyyəti növləri.

İnformasiya boşluqları (İnformation Gap) kommunikativ danışıq fəaliyyətinin ən uğurlu vasitələrindən biridir və təlim prosesində şagirdlərin ən çox rastlaşdıqları problemi həll etməyə imkan yaradır. İnformasiya boşluqları həm metodoloji, eyni zamanda fizioloji baxımdan faydalı bir fəaliyyət növüdür. Bu metodun tətbiqi zamanı informasiyalar iki müxtəlif vərəqdə müəyyən boşluqlarla verilir. Şagid A-da olan vərəqdə verilmiş boşluq şagird B-nin vərəqində verilmiş, şagird B-nin informasiya boşluğu isə şagird A-nın vərəqində verilmişdir. Bu vasitə şagirdlərin hər hansı bir informasiya boşluğunun iki tərəf arasında müzakirə edilərək doldurulmasıdır. Bu metod eyni zamanda şagirdlərin dinləyib-anlama bacarıqlarını da daha tez formalaşdırır. Boşluqla üzləşən tərəf digər tərəfi diqqətlə dinləyib məlumatını tamamlamalı və onun nitqinin davamını dinləyib dostunun rastlaşdığı boşluğu tez tamamlamalıdır. Hər iki tərəf çox diqqətli olub, məlumatları bölüşdürür və maraqlı kommunikasiya qururlar.

Ənənəvi dialoqlardan fərqli olaraq informasiya boşluqları şagirdləri istər-istəməz dialoqa dəvət edir və onlar məntiqi düşünərək suallar qurur və dəqiq cavablandırır.

Söhbət toru (Convesation Grids) sinifdə və sinifdənxaric mühitdə daha tez yaradılan kommunikativ fəaliyyət növüdür. İngilis dilində aparılan söhbətlər müəyyən formada əyləncəli olmalıdır, amma elə etmək lazımdır ki, kommunikasiyanın bu struktur dərs modelindən şagirdlər maksimum dərəcədə faydalana bilsinlər. Söhbətlər zamanı onlar şəkillər üzrə yeni sözlər öyrənir, nitq etiketlərindən istifadə edərək dialoqlarda fikir mübadiləsi edir, gündəlik ifadə vasitələrini praktikada istifadə edir, müxtəlif mövzuları müzakirə edirlər (sum-

mer holidays, free time, language learning, countries and people, etc).

Şifahi söhbətlər V-IX sinif şagirdləri arasında kiçikhəcmli, birmərhələli söhbətlərdən daha geniş həcmli söhbətlərə qədər davam etdirilməsini nəzərdə tutur. V-VI siniflərdə müəllim hər hansı bir mövzu ətrafında şagirdləri söhbətə cəlb edə bilər. Söhbətlər spontan şəkildə aparılır və interaktivlik yaradır. Söhbət torunu yaratmaq üçün şagirdlərə autentik, sərbəst və müəllimin istiqamətindən asılı olmayan fəaliyyətlər təqdim olunur. Şagirdlər W/H - suallarından istifadə etməklə sorğu tərtib edir, mövzuya uyğun lüğət seçir və mədəni aspektləri təyin edir.

Strip hekayələr üzərində şagirdlərin ardıcıl nitqi formalaşır. Belə hekayələr şagirdlərə kəsilmiş kiçik vərəqlərdə verilir. Verilmiş vərəqlərin ardıcıl düzülməsi üçün onlar "first", "then", "finally" kimi əlaqələndirici sözlərdən istifadə edərək hekayəni məntiqi ardıcıllığı ilə sıralayır və orijinal variantla yoxlayır. Belə fəaliyyətlər şagirdlərin danışıq fəaliyyətində ardıcıl fikir yürütməyi formalaşdırır. Şagirdlər tərəfindən bu hərəkətlər təkrarlanaraq, mətnin məzmunu və sözləri nitq prosesində ifadə olunur.

Əsas səmərə odur ki, şagirdlər qarşı-qarşıya dinləyib-anlama bacarıqlarını inkişaf etdirmək üçün diqqəti tam hərəkətlərin nümayişinə yönəldir və onun mənasını ifadə edirlər. Asher bu yanaşmanı “stressdən azad” yanaşma adlandıraraq, sakit mühitdə dilin ən effektiv məhsulu adlandırmışdır. Əsas fəaliyyət əmr formasında olan nitq etiketlərinin cümlələrdə səslənməsi ilə başlayır və burada əsas məqsəd dinləyicinin fəaliyyətinin formalaşmasıdır.TPR metodu mənanın açıqlanmasında diqqətin əsas meyar olduğunu önə çəkir və qrammatik qaydaların induktiv tədrisinə yönəldilir. Bu üsul yaddaşın möhkəmlənməsinə kömək edir və fiziki tərbiyə fənninə inteqrasiya edərək, şagirdlərin bütöv şəkildə mövzunu mənimsəməsinə xidmət edir. Şagirdlərə təsviri mətnlərin bu şəkildə mənimsədilməsində TPR metodunun böyük əhəmiyyəti var və bu metodun köməyi ilə hekayə və mətnlərin hərəki formada tətbiqinə imkan yaratmaq lazımdır. TPR komanda şəklində həyata keçirilir, şagirdlər dairədə, yumorlu şəkildə fikirlərini ifadə edir, danışıq zamanı olan qorxuya tam qalib gəlirlər [59,109].

İngilis dilinin səmərəli tədrisində multimedia vasitələrindən, dilin müasir kommunikativ texnologiyalarından istifadə olunması ən yeni üsullardandır. Multimedia vasitələri kimi, televiziya, radio, kompüter, video nümunələrindən və eyni zamanda autentik vasitə olan qəzet, jurnal, bədii kitablar, musiqi parçalarından istifadə edərək şagirdləri ünsiyyətə daha tez həvəsləndirmək olar. Təlimdə videofilmlərin qısa vaxt ərzində nümayişi zamanı şagirdlər tanış olduqları yeni ifadələr, nitq modellərinin müxtəlif situasiyalarda necə işlənməsi, onların tələffüzü, yeni müraciət formaları, jestlər və bədən dilinin işlənməsi ilə yaxından tanış olurlar.

İngilis dilinin sinif mühitində öyrənilməsində kommunikativ oyunların rolu daha cəlbedicidir. Oyunlar zamanı şagirdlər ünsiyyətə daha tez qoşulur, oyunların müasir pedaqoji yanaşma kimi təlimdə tədrisi və tətbiqi bir çox məqsədlərə xidmət edir. İlk öncə, oyunlar uğurlu təlim nəticələrinin əldə olunmasına, şagird maraqlarının nəzərə alınmasına əsaslanaraq, təlimdə maraqlı ünsiyyət mühitini yaradır. Psixoloji baxımdan müxtəlif oyunlarla təlim zamanı şagirdlər stressi, daxili dünyasındakı çatışmazlıqları, qorxu və qayğıları unudaraq, sanki kliniki fəaliyyətdə müalicə alırlar. Hətta yaşadığı sıxıntılı hadisələrdən azad olmaq üçün oyun “çıxış yolu” da ola bilər. Müasir oyun texnologiyaları təlim

prosesində müəllimin və şagirdlərin fəallığını tələb edir. Müasir oyunların köməkliyi ilə təlimin həm inkişafetdirici, həm də tərbiyələndirici funksiyaları təlimin keyfiyyətinin yüksəldilməsinə səbəb olur.

Azərbaycanlı dilçi alim D.İsmayılova qeyd edir ki, müxtəlif məqsədlərə əsaslanan kommunikativ oyun növləri vardır ki, onlar oyunun şagirdlərə müsbət təsir göstərərək öz sosial inkişaflarını sürətləndirirlər. Şagirdlər oyunun köməyi ilə özlərinə dost qazanır, bir-birlərinin xarakterlərinə daha yaxından bələd olur, sevdikləri və ya sevmədikləri xüsusiyyətləri öyrənirlər. Başqalarına hörmət etmək, səbirli olmaq, stressdən yaxa qurtarmaq, problemləri həll etmək və liderlik kimi xüsusiyyətləri də oyun vasitəsilə əldə edirlər.

Şifahi nitqin formalaşmasında ünsiyyətin qurulması üçün innovativ metodların tətbiqi çox vacib şərtdir. Təlimdə səmərəli ünsiyyətin yaradılmasında yalnız ilk öncə danışıq fəaliyyəti tətbiq olunmalıdır. Uyğun kommunikasiya üçün, danışma, lüğətin, tələffüzün və qrammatik qaydaların düzgün formalaşması üçün fəaliyyət növü və üsullar düzgün seçilməli və tətbiq olunmalıdır. Bu baxımdan VI-VIII siniflərdə işlədilən kommunikativ metodlar nitqdə dilin dəqiq, səlis xarakterdən çox, axıcı və rabitəli xarakterə malik olmasına imkan yaradır. Şagirdlər danışıq zamanı fəaliyyətin növündən asılı olaraq, onun hansı məqsədlə işlədiyini düzgün ifadə etməyi bacarmalıdırlar.

***Rəyçi: f.ü.e.d. N.Sadıqova***

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün xarici dil fənni üzrə təhsil proqramı (kurikulumu). Bakı, 2010.
2. İsmayılova D. Everyday Dialogues. Bakı: Mütərcim, 2001.
3. Гусейнзаде Г. Обучение речевой коммуникации на иностранном языке. Баку: Мутарджим, 2001.
4. Исмаилова Д. Общетеоретические аспекты культуроведческого общения иноязычной коммуникативной практики учащихся // Иностранные языки в Азербайджане, 2007, № 1.
5. "The Total Physical Response Approach to Second Language Learning" by James J. Asher. The Modern Language Journal, Vol. 53, No. 1 (Jan., 1969).


**Ф.Гусейнова**

**О формировании коммуникативных способностей в учёбе**

**Резюме**

Целью данного исследовательская работа представляет различные методы развитие коммуникативных навыков в устной речи. Целью данного исследования проанализировать аспекты речи и умение прослушивания. Различные типы методов, представленных в этой статье, были применение фокусировки в классе прослушивания, и говорить деятельности.

**F.Huseynova**

**On the improvement of communicative skills in education**

**Summary**

The research work presents different methods of communicative skills in developing oral speech. The purpose of this study to analyze aspects of speaking and listening skills. Different types of techniques have been presented in this article focusing applying listening and speaking activities in the classroom.

# SUMMATİV QİYMƏTLƏNDİRMƏNİN MAHİYYƏTİ VƏ MƏZMUNU

**Arzu Baxşəliyeva,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun fəlsəfə doktoru proqramı üzrə doktorantı***

Məqalədə respublikamızda və inkişaf etmiş xarici ölkələrdə şagird nailiyyətlərinin summativ qiymətləndirilməsi problemi ilə bağlı pedaqoq alimlərin apardığı tədqiqatlara, söylədikləri fikir və mülahizələrə münasibət bildirilmişdir. Summativ qiymətləndirmənin mahiyyəti və məzmunu geniş şərh edilmişdir.

***Açar sözlər:*** *şagird, məktəb, qiymətləndirmə, nailiyyət, standart, kurikulum, summativ qiymətləndirmə, nəticə, keyfiyyət.*
***Ключевые слова:*** *ученик, школы, оценка, достижения, стандарты, учебные программы, суммативными оценками, результат, качества.*
***Key words:*** *student, school, assessment, achievement, standards, curiculum, summative assessment, result, quality.*

Ümummilli lider Heydər Əliyev tərəfindən 1999-cu ildə təsdiq edilmiş “Təhsil sahəsində İslahat proqramı”nın məntiqi nəticəsi olaraq 2008-ci ildən başlayaraq ümumtəhsil məktəblərinin I siniflərində yeni təhsil proqramları (kurikulumları) tətbiq olunur [1]. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi şagird nailiyyətlərinin məktəbdaxili qiymətləndirilməsinin yeni mexanizmlə keçirilməsini zəruri etdi. Bu zərurət nəticəsində Azərbaycan Respublikası Nazirlər Kabinetinin 13 yanvar 2009-cu il tarixli, 09 nömrəli qərarı ilə "Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" sənədi təsdiq olundu [2]. Konsepsiyada müasir qiymətləndirmə fəaliyyətində şagirdlərin nəinki idrak (əqli) fəaliyyətinin, eyni zamanda onların mənimsədiyi biliyin keyfiyyət göstəricilərinin və istifadə səviyyəsinin nəzərə alınması xüsusi qeyd edilmişdir [2].

Konsepsiyanın əməli tətbiqinin təmin olunması məqsədilə Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən “Ümumtəhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılması Qaydaları” hazırlandı [3]. Hər iki sənəddə şagird nailiyyətlərinin məktəbdaxili qiymətləndirilməsinin üç növündən - diaqnostik, formativ və summativ qiymətləndirmələrdən istifadə olunması qərarlaşdırılmışdır [2; 3].

Ümumtəhsil məktəblərində şagirdlərin təlim fəaliyyətinin qiymətləndirilməsi sadəcə şagirdin nail olduğu təlim nəticələrinin səviyyəsini müəyyənləşdirmədiyi, həm də tədris prosesinin effektiv planlaşdırılmasının təmin edilməsinə, təhsilin səviyyəsinin yüksəldilməsinə xidmət etdiyi sənəddə xüsusi olaraq qeyd olunur [3]. Summativ qiymətləndirmənin standart və ya standartlar qrupunda müəyyən olunmuş məqsədlərə şagirdlərin hansı səviyyədə nail olduqlarını müəyyən etməyə imkan verən bir vasitə olduğu, standartların mənimsənilməsi istiqamətində onların əldə etdiyi irəliləyişlərin dəyərləndirilməsinə imkan verdiyi vurğulanır [3].

Summativ qiymətləndirmə kiçik və böyük summativ qiymətləndirmədən ibarətdir. Kiçik summativ qiymətləndirmə bəhs və ya bölmənin, tədris vahidinin sonunda, böyük summativ qiymətləndirmə isə yarım-

illərin sonunda şagirdin nailiyyət səviyyəsini ölçmək məqsədilə aparılır [3].

Tarixən, pedaqoji praktikada şagirdlərə nəyi, necə və hansı həcmdə öyrətmək, onların əldə etdiyi bilik, bacarıq və vərdişləri hansı üsul və vasitələrlə qiymətləndirmək barədə təhsil tədqiqatçıları araşdırmalar aparmışlar. Şagirdlərin təlim nailiyyətlərinin qiymətləndirilməsində obyektivliyin təmin olunması üçün müəllimlərə hansı metodik köməkliklərin göstərilməsi metodistləri narahat etmiş və bu gün də etməkdədir. Çünki cəmiyyətdə gedən sosial-iqtisadi dəyişikliklər məktəbin qarşısında yeni tələblər qoyur. Onun işinin günün tələbləri baxımından daim təkmilləşdirilməsini, yenilənməsini qaçılmaz edir. Müasir təhsil fəlsəfəsinə görə şagird təlim-tərbiyə prosesinin subyektidir, o, pedaqoji prosesin mərkəzində durur. Müasir dövrdə təhsilin əsas məqsədi şagirdlərin məntiqi, tənqidi və yaradıcı təfəkkürünü inkişaf etdirmək, onlarda tədqiqatçılıq bacarığı formalaşdırmaqdan ibarətdir.

Təlimin hansı didaktik prinsiplərə uyğun qurulmasından asılı olmayaraq şagird nailiyyətlərinin qiymətləndirilməsi pedaqoji prosesin vacib komponentlərindəndir, onun ayrılmaz tərkib hissəsidir. Şagird nailiyyətlərinin qiymətləndirilməsi müəllimə və məktəb rəhbərliyinə şagirdlərin tədris olunan məzmundan nələri mənimsədiklərini, nələri edə bildiklərini və onlarda hansı keyfiyyət dəyişikliklərinin baş verdiyini müəyyən etmək üçün nəzərdə tutulmuş pedaqoji yanaşmadır [4]. Müasir məktəbdə şagird nailiyyətlərinin inkişaf dinamikasının izlənilməsi üçün summativ qiymətləndirmə mühüm pedaqoji vasitədir. Summativ qiymətləndirmə şagirdlərin nəyi mənimsədiklərini, nələri öyrəndiklərini, nələri edə bildiklərini, onların biliyində hansı keyfiyyət dəyişikliklərinin baş verdiyini və şagirdlərin öyrənmə səviyyəsinin müvafiq təlim nəticələrinə uyğunluğunu müəyyənləşdirməyə obyektiv şərait yaradır.

Summativ qiymətləndirmənin nəticələri əsasında müəllim hər bir şagirdin əldə etdiyi irəliləyişləri dəyərləndirməli, nailiyyətlərini inkişaf etdirmək məqsədilə ona müvafiq istiqamət verməlidir [5]. Summativ qiymətləndirməni ənənəvi qiymətləndirmədən fərqləndirən əsas cəhət onun inkişafının göstəricisi olmasıdır. Summativ qiymətləndirmə şagirdlərin qazandıqları bilik və bacarıqların mənimsənilmə səviyyəsinin məzmun standartlarına uyğunluğunu müəyyən etməyə imkan verməlidir. Nəzərə alınmalıdır ki, summativ qiymətləndirmənin ən mühüm cəhəti isə şagirdlərin mənimsədiyi biliyi tətbiqetmə qabiliyyətinə nə dərəcədə malik olduqlarını aşkara çıxarmağa, şagirdlərin nail olduğu praktikyönümlü bacarıqların təkmilləşdirilməsi ilə bağlı tədris prosesinin effektiv planlaşdırmasının təmin edilməsinə xidmət edir [4]. Eyni zamanda şagirdlərin bilik və bacarıqlarını, (praktik, konstruktiv, hesablama, eksperimental və s.) müstəqil tətbiq etmək bacarıqlarını izləmək mümkündür. Ona görə də summativ qiymətləndirmə şagirdlərin bilik və məsələ həlli bacarıqlarını yoxlamaq, riyazi hesablama aparmaq, qrafikləri qurmaq və oxumaq, ölçü vahidləri üzərində çevrilmələr aparmaq qabiliyyətlərinin inkişafını izləmək üçün çox böyük əhəmiyyət daşıyır [5]. Qiymət o vaxt effektiv sayılır ki, o uşağı özünü təkmilləşdirməyə təhrik etsin. Ona görə də summativ qiymətləndirmə zamanı müəllimin əsas diqqəti şagirdin təkcə informasiyanı mənimsəməsinə deyil, həm də gələcəkdə həyatda yaşamaq üçün zəruri olan bacarıqlara yiyələnməsinə yönəlməlidir.

Beləliklə, aparılmış araşdırmalar və təhlillərdən belə qənaətə gəlmək olar ki, summativ qiymətləndirmənin nəticələri müəllimə və məktəb rəhbərliyinə şagirdlərin

təlim nailiyyətlərinin güclü və zəif cəhətləri, onlara verilən bilik, bacarıq və vərdişlərin cəmiyyətin tələbatına, təlim materiallarının çətinlik səviyyəsinin şagirdlərin fiziki və anlaq səviyyəsinə uyğunluğu, istifadə edilən didaktik vasitələrin, pedaqoji texnologiyaların, təlim strategiyalarının əlçatanlığı haqqında tam aydın təsəvvür əldə etməyə geniş imkanlar yaradır. Summativ qiymətləndirmənin nəticələrinə əsasən valideynlərə (qəyyumlara), məktəb rəhbərlərinə və yerli təhsili idarəetmə orqanlarına şagirdlərin təlim nailiyyətləri barədə aydın, dəqiq və qərəzsiz məlumat vermək (hesabat vermək) mümkün olur.

Summativ qiymətləndirmə təlimin hər hansı bir mərhələsində öyrənmə prosesinin səmərəliliyi ilə bağlı mühakimə yürütmək, şagirdlərin nəyi bilib, nələri bilmədiklərini müəyyənləşdirmək və prosesi yekunlaşdırmaq üçün aparılır [4]. Əldə olunmuş informasiyalar əsasında məzmun standartlarının mənimsənilmə səviyyəsi, şagirdlərin müəyyən bölmə və ya tədris vahidi üzrə təlim nəticələri haqqında həm nailiyyətləri, həm də çatışmazlıqları müəyyən olunur [4].

Buradan da göründüyü kimi, summativ qiymətləndirmə pedaqoji prosesin keyfiyyəti haqqında məlumat vermək, onun səmərəliliyini təmin etmək üçün vaxtında müvafiq təşkilati-pedaqoji tədbirlər görülmək məqsədi daşıyır.

Böyük Britaniya alimləri Paul Black və Dylan Wiliam [6] öz tədqiqatlarında summativ qiymətləndirmənin səciyyəvi xüsusiyyətlərinin bu qiymətləndirmənin nəticələrindən harada və necə istifadə olunacağından asılı olaraq dəyişdiyini qeyd edirlər. Summativ qiymətləndirmədən sinif daxilində, məktəb daxilində, yaxud məktəbdən xaricdə istifadəyə görə onun üç növünü qeyd edirlər [6]:

- müəllimlər tərəfindən sinif daxilində istifadə olunan summativ qiymətləndirmə (Kiçik summativ qiymətləndirmə);
- məktəb rəhbərliyi tərəfindən məktəb daxilində istifadə olunan summativ qiymətləndirmə (Böyük summativ qiymətləndirmə);
- məktəbdənkənar summativ qiymətləndirmə (Yekun buraxılış imtahanları).

Kiçik summativ qiymətləndirmə özündə aşağıdakıları ehtiva edir [6]:

- şagirdlərin öz nailiyyətlərini monitorinq etməsi;
- müəllimlər şagirdlərin inkişafı üçün perspektivlər müəyyən etmək;
- müəllimlər şagirdlərin nailiyyətlərinə uyğun müxtəlif təlim üsulları seçmək;
- müəllimlər hər bir şagirdlə səmərəli ünsiyyət qurmaq;
- müəllimlər hər bir şagirdin nailiyyəti barədə şəffaf şəkildə hesabat hazırlamaq.

Etibarlılıq və şəffaflıq müəllimlər tərəfindən sinif daxilində keçirilən summativ qiymətləndirmənin (Kiçik summativ qiymətləndirmə) əsas prinsipləridir. Etibarlılıq şagird nailiyyəti haqqında məlumatın dürüstlüyünün dərəcəsini, şəffaflıq isə şagird üçün qiymətləndirilə biləcək hər şeyin vacibliyinin göstəricisidir. Yüksək etibarlılıq və şəffaflıq qiymətləndirmənin nəticələrinə əminliyi artırır [6].

Böyük summativ qiymətləndirmə özündə aşağıdakıları ehtiva edir [6]:

- müəllim və şagirdlərin təlim fəaliyyəti haqqında məlumat toplamaq;
- müxtəlif müəllimlər tərəfindən tətbiq edilən standartlar arasındakı fərqliliyi və qərəzli qərarları minimuma endirmək;
- şagirdlərin nailiyyəti ilə bağlı təqdim olunmuş hesabatlara uyğun qərarlar vermək;
- şagirdlərin inkişafı barədə valideynlər (qəyyumlar) qarşısında məsuliyyət və cavabdehlik daşımaq.

Məktəbdənkənar summativ qiymətləndirmə (Yekun buraxılış imtahanları) müvafiq siniflər və fənlər üzrə kurikulumda

nəzərdə tutulmuş mühüm təlim nəticələrinin ölkə səviyyəsində mənimsənilmə səviyyəsinin ölçülməsi məqsədilə keçirilir [6].

Buradan da göründüyü kimi, summativ qiymətləndirmənin aparılmasında məqsəd şagirdlərin nəzərdə tutulmuş proqram materiallarını müvafiq dövrlərdə hansı səviyyədə mənimsədiklərini və onların biliyinin inkişaf səviyyəsinin standartlara uyğunluğunu müəyyənləşdirməkdir.

Summativ qiymətləndirmə rəsmi qiymətləndirmədir. Onun nəticəsi məktəbli kitabçasında və sinif jurnalında 5 ballıq şkala ilə ifadə olunur [2]. Müəllimlərin şagirdlərə verdiyi qiymət mühakiməedici deyil, məlumatverici funksiya daşımalıdır. Qiymətləndirmədə spesifiklik nə qədər çox nəzərə alınsa, şagirdin fəaliyyətindəki müvəffəq və nöqsanlı cəhətlər barədə bir o qədər obyektiv və səhih informasiya əldə etmək mümkün olar.

Aparılmış araşdırmalar zamanı müəyyənləşdirilmişdir ki, summativ qiymətləndirmə dedikdə, ümumtəhsil məktəblərində qarşıya qoyulan məqsədə müvafiq olaraq pedaqoji prosesin təşkilinin, tənzimlənməsinin, səhih informasiya əsasında təhlillərin və təkmilləşdirmələrin aparılmasına istiqamətləndirilmiş fəaliyyət başa düşülür. Ona görə də summativ qiymətləndirmə sadəcə, şagirdin nail olduğu təlim nəticələrinin səviyyəsini müəyyənləşdirməyə deyil, bütövlükdə məktəbdə pedaqoji prosesin keyfiyyətinin müəyyən edilməsinə və onun yüksəldilməsinə xidmət edən bir mexanizmdir.

***Rəyçi*: *dos. İ.Cavadov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat proqramı. Bakı, 1999.
2. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. Kurikulum, 2009, №2 .
3. Ümumtəhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılması Qaydaları. Kurikulum, 2009, №4.
4. Cavadov İ., Cavadova Ə. Şagird nailiyyətlərinin qiymətləndirilməsi üzrə işin sistemi. ATPİ-nin Elmi əsərləri, 2010, №1.
5. Məktəbdaxili qiymətləndirmə: tədqiqatlar, nəticələr / nəşrə haz.: İ.A.Cavadov. – Bakı: ATPİ-nin Təhsil Texnologiyaları Mərkəzinin nəşriyyatı, 2016.
6. Black, P. & Wiliam, D. (2007) Large-scale assessment systems: design principles drawn from international comparisons’. Measurement: Interdisciplinary Research and Perspectives. 5 (1).

**А.Бакшалийева**

**Характера и содержания суммативными оценками**

**Резюме**

В статье расматриваеться суммативная оценка достижения учащихся в нащей республика и развитых зарибежных стран по вопросу исследования, проведенного педагог учеными и предявили мнения ихний высказивания. Широко комментирован качество и содержание суммативными (итоговое) оценивание.

**A.Bakhshaliyeva**

**The essence and content of the summative assessment**

**Summary**

In the article is expressed attitude to the researches, views and opinions conducted by pedagogues and scientists about the issue of summative assessment of student achievements in our country and developed foreign countries. The essence and the content of the summative assessment has been widely commented.

# İZAFİ BƏDƏN KÜTLƏSİ VƏ ONUN MÜAYİNƏSİ



**Hidayət İsayev,**
***tibb elmləri doktoru, professor***

**Aybəniz Cəfərova,**
***həkim-terapevt***



***Açar sözlər:*** *gigiyena, səhiyyə, piylənmə, qidalanma, olebaliks, maddələr mübadiləsi.*
***Ключевые слова:*** *гигиена, медицина, ожирение, питание, олебаликс, обмен веществ.*
***Key words:*** *hygiene, health, obesity, nutrition, olebaliks, metabolism.*

Ümumdünya Səhiyyə Təşkilatının fikrinə görə, insan sağlamlığında ən təsirli rol oynayan amillərdən biri insanın şəxsi gigiyenasıdır: məişət gigiyenası, əmək gigiyenası, qida gigiyenası və b. Böyük yunan alimi və həkimi Hippokrat qeyd edirdi ki, insanın səhhətinə hava, su, qidalanma, həyat tərzi, vərdişlər və s. təsir edir.

Gündəlik həyatda fərqinə varılmayan gigiyenik səhiyyə, o cümlədən qidalanma sonradan insan sağlamlığında müxtəlif problemlərə yol açır. İnsanın piylənməsi də bu qəbildəndir.

İnkişaf etmiş ölkələrdə piylənmə getdikcə artmaqda olub sosial əhəmiyyətli problemə çevrilmişdir. Hər il ABŞ-da 300 min adam piylənmədən ölür.

Dəqiq məlumdur ki, kök adamlar ürək-damar (ateroskleroz, ürəyin işemik xəstəliyi, hipertoniya), qaraciyər, öd yolları, şəkərli diabet kimi xəstəliklər səbəbindən az yaşayırlar.

Piylənmənin uşaq və cavan yaşlarda artması cəmiyyət üçün həyəcan yaratmaqdadır. Təbabət tarixindən məlum deyil ki, piylənməyə nə zamandan bəri xəstəlik kimi baxmışlar! Bununla belə Hippokratın "Sağlam həyat tərzi" kitabında "necə arıqlamaq olar?" başlığına rast gəlirik; orada dahi Hippokrat kök adamlara ac qarına ağır fiziki hərəkət etməyi, örtüksüz taxta üzərində yatmağı, çox gəzmək (cəld addımla), qışda və yayda yüngül geyinmək, müalicəvi isti vannalar qəbul etmək və göyərti, meyvə çox qəbul etmək kimi məsləhət verir.

Dahi Şərq müdriki Əli Əbu İbn Sina özünün "Qanun" kitabında yazırdı: "Bil ki çox yeməkdən dünyada pis şey yoxdur…"; o, yeməkdən əvvəl vanna qəbul etməyi, intensiv idman etməyi kökəlmənin qarşısını ala bilən əsas faktorlar sayırdı. Bizim eradan əvvəl 179-cu ildə Sirax yazmışdır: "Qarnını hər dadlı yeməklə doldurma, yemək yeyəndə acgözlük etmə. Çünki çox yemək insanı xəstə edir".

Bu gün piylənməni energetik disbalans kimi qəbul edirlər; yəni qida ilə qəbul olnunan enerji bədəndə sərf ediləndən artıq olur. Əlbəttə, biz buraya bir sıra xəstəliklərin (İçenqo-Kuşinq, adipoz-qenital sindrom, hipotireoz, insuloma, baş beyinin xəstəlikləri) simptomu kimi baş verən piylənməni nəzərdə tutmuruq. Ona görə də, ilkin ekzogen-konstitusional və ya sadə (simple)

piylənmədən söz edirik.

Heç bir xəstəlik olmadan, hədsiz qida qəbulu fonunda az enerji sərf etməkdən yaranan piylənmə ilkin sadə piylənmə adlanır və bu gün bəşəriyyətin sözün əsl mənasında bəlasına çevrilən də məhz belə piylənmədir.

Araşdırmalara görə kökəlmə bu gün Avropa və Şimali Amerika əhalisinin 30-45%-ni əhatə etməkdədir.

Hətta özlərinin bədənlərinin qayğısına qala bilmələri ilə fərqlənən 40 yaşa qədər olan fransız qadınları arasında 18% halda artıq bədən çəkisi var.

Yuxarıda qeyd etdiyimiz kimi, sadə piylənmə qəbul olunan qida ilə sərf olunan enerji arasındakı uyğunsuzluqla bağlıdır.

Çoxsaylı tədqiqatlar sübut etmişdir ki, artıq bədən çəkisinə (ABÇ) malik insanların yarısından çoxu çörək-bulka məmulatlarından ifrat dərəcədə istifadə edirlər. Eyni zamanda piylənməsi olan şəxslər bədən çəkisi normal olanlardan gündəlik 100 q və 500 q karbohidrat çox yağ istifadə edirlər.

Uyğun olaraq 47,3% piyli şəxslərdə sutkalıq kalori 3000 kkal, 10%-də 4000 kkal olduğu halda bədən çəkisi normal olanlarda həmin göstəriciləri 25 və 3% şəxslərdə qeyd edirlər.

3-cü dərəcəli piylənməsi olan şəxslərdə çox güman ki, bulemiya (iştah artıqlığı), hiperfaqiya (çox udma) inkişaf edir ki, bunları da mərkəzi sinir sistemində gedən dəyişikliklərlə və hiperinsulinizmlə əlaqələndirirlər.

Uşaq və yeniyetmə dövründə artıq qida qəbulu endoqen-konstitusional piylənmənin əsas səbəblərindən biri sayılır. Qadınlar hamilə dövründə guya “2 nəfər üçün qida qəbul etmək lazım olması” kimi ziyanlı və əsassız fikir əsasında qidalanmaqla, sonrakı piylənmənin əsasını qoyurlar.

Piylənmədə müəyyən rolu irsiyyət də oynayır. İrsi meyillik olmayanda da uşaqlar öz “acgöz” valideynlərinin tərbiyəsi altında, onlara baxaraq, artıq qida qəbul edib piylənirlər.

İrsi meyillik olanlar cüzi miqdarda artıq qida qəbul etdikdə belə piylənmə baş verir. Deməli, genetik meyilliliyi reallaşdırmaq üçün ailə ənənəsini davam etdirmək–çox miqdarda yüksək kalorili qida qəbul etmək lazımdır!

Laborator tədqiqatlar piylənməyə düçar olmuş şəxslərdə lipid mübadiləsinin bu və ya digər dərəcədə pozulmasını sübut edir.

Külli miqdarda heyvan mənşəli yağların və şəkərin qəbulu lipid və karbohidrat mübadiləsini pozmaqla, sadə piylənmənin səbəbinin əsasını təşkil edir.

Piylənmə zamanı piyin əsas hissəsi “piy depolarında” yığılır; bu yığılma, əsasən, qida qəbul edilən lipid və yağların, bir də karbohidratlardan bədəndə sintezlənən (endogen) yağların hesabına baş verir. Piy toxumasının özü karbohidratlardan metabolik yolla yağları sintez edir. Bu genetik olaraq normal bir proqramdır: beləliklə, bədən özünə enerji deposu yaradır ki, lazım gəldikdə oradan yağları enerji mənbəyi kimi istifadə etsin. Normal bədən çəkisinə malik insanlarda piyin sintezi (lipogenez) onun parçalanması (lipoliz) prosesi ilə tarazlaşdırılmış halda olur. Bu proseslərin əsas iştirakçısı lipaza fermentidir. Bir sıra klinisistlərin tədqiqatlarına əsasən piylənməyə tutulan insanlarda lipaza fermentinin aktivliyinin azalması baş verir; özü də bu fermentin lipidləri depolarından mobilizasiya edə bilən fraksiyasının aktivliyi daha çox azalmış olur. Nəticədə, piylənmə olan şəxslərdə liposintez lipolizi üstələyir ki, piyin miqdarı sürətlə artır.

Piylənmə zamanı zülal və mineral maddələrin mübadiləsi də təhrif olunur; qanda albuminlər azalır və albumin-qlobulin

nisbəti ikincisinin hesabına dəyişir.

Piyli şəxslərdə suyun mütləq həcmi normal bədən çəkisi olanlardan həmişə artıqdır.

Piylənmənin patogenezində mədəaltı vəzin adacıq aparatının funksional pozğunluğu baş verir; nəticədə, şəkərli diabetin sayı piylənmə olanlarda artır. Bir sıra piylənmə hallarının əvvəlində hiperinsulinizm müşahidə olunur. Lakin tədricən insulin hazırlayan hüceyrələr zəifləyərək şəkərli diabet yaranır; buna aşırı miqdarda əvvəllər ifraz olan insulinə qarşı bədəndə yaranan dirənc də yardım edir (insulinrezistentlik).

Piylənmə prosesi daxili cinsiyyət vəzilərinin funksiyasını da pozur; belə qadınlarda aybaşı pozulur; kişilərdə isə impotensiyaya meyillik baş verir.

Beləliklə, piylənmə maddələr mübadiləsində və daxili orqanlarda (funksional və morfoloji) ciddi dərin dəyişikliklərə gətirib çıxarır.

Normal bədən çəkisindən artıq olmasına görə piylənməni dərəcələrə ayırırlar.

Bunun üçün müxtəlif kriterilər təklif edilmişdir. Ən əlverişlisi Brok formuludur: bədənin normal çəkisini bədənin santimetrlə hündürlüyündən 100-ü çıxmaqla təyin edirlər. Bu 165 sm hündürlüyü olanlarda tədbiq edilir. 165-175 sm hündürlüyü olanlarda ondan 105, 175-185 sm boyu olanlarda isə 110 çıxırlar. Normal bədən çəkisini həmin şəxs üçün təyin etdikdən sonra onun bədən çəkisindən təyin edilmiş normal çəkini çıxırlar. Bu zaman əldə edilmiş rəqəm normal bədən çəkisindən 10-29% artıqdırsa bu I dərəcəli piylənmə, 30-49%-dirsə II və 50%-dən yuxarıdırsa III dərəcəli piylənmə hesab edirlər.

Azərbaycan anatomiya məktəbinin banisi professor K.Balakişiyev isə piylənməni belə bölürdü: I – həsəd aparıcı, II – güldürücü, III – yazıqgələn.

I dərəcəli piylənməsi olanlar tez yorulmadan və bədən formasının pozulmasına (piy döşlərdə, budda və qarında toplanır) görə bədbinlikdən şikayət edirlər. Piylənmənin dərəcəsi artdıqca xəstələr ürək döyünmədən, təngənəfəslikdən, baş ağrılarından, ürək nahiyyəsindəki ağrılardan, əmək qabiliyyətinin azalmasından, tez tərləmədən, oynaq ağrılarından, aşağı ətraflardakı şişkinlikdən, qəbzlik, xorultu, impotensiya və s. şikayət edirlər. İlin isti aylarında onların göbəkaltı, südvəzisi altı nahiyyəsində və təbii büküşlərdə, aralıqda əzabverici bişməcələr yaranır; öd yollarında diskeneziya, daş yaranır; qaraciyərdə piylənmə gedərək onun fəaliyyətini pozur. Piylənmə qaraciyərin piyli distrofiyasına gətirib çıxarır.

Uzunmüddətli piylənmə daxili endokrin sekresiya vəzilərinin funksiyasını pozur; bu xəstələrdə bədən çəkisinə nisbətən dövr edən qanın həcmi azalır və qatılaşır. Nəticədə, kapillyarlarda qan təchizatı pozulur. Periferiyada yaranan gərginlik ürəyin sol mədəciyinin işini ağırlaşdırır ki, bu da onun hipertrofiyasına və funksiyasının zəifləməsinə gətirib çıxarır. Burada ürək əzələsinin piyli distrofiyasını da nəzərdən qaçırmaq olmaz.

Piy toxuması inkişaf edərək döş boşluğunda ağciyərlərin yerini azaldır; nəticədə, onun tutumu azalaraq tənəffüs çatışmazlığı yaranır. Piylənməsi olan xəstələrdə immunitet zəifləyir ki, bu da irin törədən mikrobların tük vəzilərində, sidik yollarında inkişaf edərək çiban, irinlik, çistit, pielit kimi xəstəliklərin baş verməsinə gətirib çıxarır.

Piylənmənin müalicəsi konservativ və operativ yolla aparılır. Sonuncu – cərrahi müalicəyə konservativ müalicə III dərəcəli piylənmələrdə effekt vermədikdə müraciət etmək məcburiyyətindən irəli gəlir.

Piylənmənin konservativ müalicəsi aşağıdakı 5 əsas prinsipi əhatə etməlidir:

1) Qida ilə qəbul edilən enerjinin azal-

dılması (qida qəbulu adətini tərbiyə etməklə, həyat tərzini və davranış qaydalarını dəyişməklə, iştahanı azaldan preparatların təyini, detaterapiya, hissəvi və ya tam aclıq günlərini tərtib etməklə);

2) Qəbul edilən qidaların sorulmasını əngəlləyə biləcək tədbirlər (işlətmələrin təyini, pis sorula bilən qidaların verilməsi, təmizləyici imalələr, cərrahi yolla bağırsağın uzunluğunun azaldılması);

3) Fiziki hərəkətlərlə qəbul edilmiş enerjinin sərf edilməsi;

4) Dərman preparatlarının vasitəsi ilə lipolizin sürətləndirilməsi və suyun bədəndən xaric edilməsi (sidikqovucularla);

5) Piylənmədə iştirak edən biokimyəvi proseslərin patoqenetik mexanizmlərinin tam və ya hissəvi blokadasına yönəlmiş tədbirlərin həyata keçirilməsi.

Təəsüflə qeyd etməliyik ki, yuxarıda qeyd edilən tədbirlərin heç biri piylənmədə tam və birdəfəlik effekt vermir; ona görə də piylənmənin müalicəsi prosesində yeni təsirli üsulların axtarışı davam etdirilməkdədir.

Əlbəttə, piylənmənin müalicəsi 1-ci prinsipdən – dietadan başlamalıdır. Amma az kalorili dietanı təyin etdikdə bir qrup piylənməsi olan şəxslərdə çox güclü əzabverici aclıq hissi yaranır ki, bu da dietanı davam etdirməyə imkan vermir (onlarda əsəbi gərginlik, depressiya, hətta psixoz baş verə bilər). Ona görə də belə hallarda iştahkəsici dərmanlar mütləq təyin olunmalıdır. Təəssüf ki, həmin iştahazaldanlar bir sıra xəstəliklərdə (ürək-damar, beyin, qan dövranı pozğunluğu, şəkərli diabet, tireotoksikoz, qlaukoma, öd daşı, psixoz) və hamiləlikdə əks göstərişdir.

Uzunmüddətli müşahidələr sübut edir ki, iştahkəsici dərmanlarla bərabər təyin edilən dietoterapiyanın imkanları piylənmənin müalicəsində məhduddur. Ona görə də bu müalicəyə fiziki hərəkətlər də əlavə edilməlidir. Fiziki yüklənmənin xüsusiyyəti, onun həcmi və intensivliyi piylənmənin kliniki gedişindən, bədənin bu və ya digər orqan və sistemlərinin patoloji prosesə cəlb olunması dərəcəsindən, xəstənin yaşından və bədənin hazırlığından asılıdır. Bu məqsədlə Rusiya Tibb Elmləri akademiyasının Qidalanma İnstitutu xüsusi kompleks fiziki hərəkətlər işləyib hazırlayıb: bunlar 3 etapda ardıcıllıqla həyata keçirilməlidir. I etapda (3-10 gün) xəstənin ürək-damar sisteminin funksional vəziyyəti və xəstənin fiziki hazırlığı təyin edilir; bu vaxt ərzində xəstələr ümumi idman hərəkətləri edir və düzgün tənəffüs etməni öyrənirlər.

İkinci etapda (1 ay müddətində) müxtəlif xüsusi hərəkətlər təyin edilir; onların intensivliyi və müddəti tədricən artırılır (xəstənin dözə bildiyi ölçüyə qədər).

Yekun etapda (stasionardan evə yazmamışdan 3-5 gün əvvəl) evdə yerinə yetiriləsi olacaq idman hərəkətlərini möhkəmləndirir və davam etdirmək üçün son məsləhətini alır.

Nəhayət, dietoterapiya barəsində: piylənmənin qida qəbulu ilə müalicəsi kompleks terapiyanın əsasını təşkil edir. Xəstəxana şəraitində 7-10 gün müddətində tam aclıq tətbiq edilməsi sonralar özünü doğrultmadığından onun tətbiqi məqsədəuyğun sayılmadı. Bu gün yüzlərlə detaterapiya sxemi mövcuddur. Lakin onların hamısının prinsipləri eynidir:

1) Qidanın ideal çəkiyə əsaslanaraq individuallaşdırılması (ideal çəkiyə lazım olan enerjinin 30-50%-dən az kolorili);

2) Adekvat və ciddi nəzarətli hərəkətlərlə enerji sərfinin artırılması;

3) Optimal zülal, vitaminlər və azdoymuş yağ turşuları daxil olan, karbohidrat və yağlardan kasad (kalorini azaltmaq üçün) balanslaşdırılmış dietanın təyini;

4) Qida rasionunun tərkibini elə dəyişdirmək lazımdır ki, bədəndə gedən

liposintez və lipoliz prosesləri tarazlaşsın (tam həzm olunan şəkərli polisaxaridləri və sorbitlə əvəz etmək, yağların enerji həcminin 40-50% endirilməsi);

5) Su və duzun məhdudlaşdırılması;

6) Həcmi böyük, lakin kalorisi az qidalarla (göyərti, meyvə) doymaq hissini yaratmaq;

7) İştah artıran maddələrin (acı, turş, ədviyyat) qidadan xaric edilməsi; sutkada 6-7 dəfə qida qəbulu (aclıq hissini azaltmaq üçün);

8) Biokimyəvi nəzarət altında müalicənin effektliyinin təyini.

Ümumiyyətlə, piylənmədə xəstə 700-1800 kkal ekvivalentli qidadan çox almamalıdır.

Belə qidanın tərkibində I dərəcəli piylənmədə 100 – 110 q zülal (II – 70-80; III – 40-50 q), 80-90 q yağ (II – 60-70 q; III – 30-40 q), 120-150 q karbohidrat (II – 70-80 q; III – 50-70 q) olmalıdır.

Piylənmədə konfet, şokolad, konditer məmulatları, dondurma, şirniyyat, acı, turş, ədva, hisə verilən, duzlu, marina olunmuş və konservləşmiş qidalar qəti qadağandır.

Dieta vasitəsi ilə müalicəsi mümkün olmayan III dərəcəli piylənməsi olan 9 xəstədə biz cərrahi əməliyyat tətbiq etmişik. Xəstələrdən 7-i qadın, 2-i kişi idi. 20 yaşından 35 yaşına qədər 3 xəstə, 35 yaşından 45 yaşına qədər 6 xəstə olmuşdur. Bütün xəstələrə nazik bağırsağın qısaldılması, 2 xəstədə isə əlavə olaraq həm də mədənin kiçildilməsi əməliyyatı yerinə yetirmişik. Əməliyyatlardan 3 xəstədə 5 il, 4 xəstədə isə 11-13 il keçmişdir; onların hamısında bədən çəkisi ideal çəkidən 8-15% artıq deyil.

Qeyd olunanları yekunlaşdıraraq onu demək lazımdır ki, bu gün piylənmə təbabətin qarşısında duran ən böyük problemlərdən biridir.

Bu problemin həlli kompleks şəkildə mümkündür; konservativ müalicə effekt verməyən ağır piylənmələrdə cərrahi müalicə məcburi metod kimi tövsiyə oluna bilər.

***Rəyçi*: *prof. B.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Кадырова Р., Салахов Б. Ожирение. Алма-Ата, 1989.
2. Егоров М., Левитский Л. Ожирение, М., 1994.
3. Федеренко В. Современные методы лечения ожирения. М., 2006.
4. Sayek İ. Septiki cerrahiyye. Ankara, 2004.

**Г.Исаев,**
**А.Джафарова**

**Лишний вес и его диогностика**

**Резюме**

В статье говорится о вредных привычках, о профилактике очага ожирения и его диогностике.

55

**H.Isayev,**
**A.Jafarova**

**Obesity and its diagnosis**

**Summary**

In the article it is spoken about bad habits, the prevention and the diagnosis of obesity.



# MÜASİR ALİ TƏHSİL VƏ TƏLƏBƏ ŞƏXSİYYƏTİNİN FORMALAŞDIRILMASININ BƏZİ MƏSƏLƏLƏRİ

**İntiqam Cəbrayılov,**
***pedaqogika üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *ali təhsil, inkişaf, tələbə, şəxsiyyət, formalaşdırma, yanaşma, cəmiyyət, sistem, proqram, monitorinq, məktəb, imtahan.*

***Ключевые слова:*** *высшее образование, развитие, студент, личность, формирование, подход, важность, система, программа, мониторинг, школа, экзамен.*

***Key words:*** *higher education, development, student, personality, formation, approach, society, system, program, monitoring, school, examination.*

Təcrübə göstərir ki, bu gün dünya ölkələrində ali təhsilin inkişaf etdirilməsi cəmiyyətin qarşısında duran ən vacib məsələlərdən biri kimi daim diqqət mərkəzindədir. XX yüzilliyin sonu, XXI yüzilliyin əvvəllərindən başlayaraq təkcə ayrı-ayrı dövlətlər deyil, beynəlxalq birliklər, təşkilatlar tərəfindən də ali təhsilin inkişafı ilə bağlı bir sıra zəruri tədbirlər həyata keçirilir. Hər bir ölkənin sosial-iqtisadi və digər sahələrdə hədəflərinin müəyyənləşdirilməsi və reallaşdırılmasında ali təhsilin rolu əhəmiyyətli dərəcədə artmışdır. Bu gün ali təhsilin cəmiyyətin bütün təbəqələri, hər kəs üçün “əlçatan” olması, “mümkünlüyü” ideyası təqdir olunur. Belə ki, cəmiyyətin inkişafı rəqabətəqabil, müxtəlif səriştələrə yiyələnmiş şəxsiyyətin formalaşdırılmasını tələb edir. Bu baxımdan ali təhsilin cəmiyyətdə rolu getdikcə artmaqdadır (1, 2, 3, 4, 5).

Bu gün dünyanın bir sıra ölkələrində (Almaniya, İtaliya, Yunanıstan, Böyük Britaniya, İspaniya, Portuqaliya və s.) distant ali təhsilin inkişafına xüsusi diqqət yetirilir. Hələ ötən əsrin 70-ci illərinin əvvəllərindən ilk dəfə İspaniyada distant ali təhsil tətbiq olunmağa başlamış və tədricən digər Avropa ölkələrində də bu sistemə keçilmişdir. Fransa və Belçikada distant yolla ali təhsil almış vətəndaşlar-məzunlar üçün müvafiq sahə üzrə üç il müddətində təcrübə keçməsi tələb olunur. Bu da həm ödənişli, həm də ödənişsiz qaydada ola bilər. Ali təhsilin inkişaf məsələlərindən bəhs edərkən amerikalı ali təhsil tədqiqatçısı Martin Trou (1974) qeyd edirdi ki, ali təhsili “elit”, “kütləvi” və “universal” ali təhsil kimi müxtəlif aspektdən səciyyələndirmək olar. Müvafiq ali təhsil proqramının tətbiqində yaş qrupunun 15%-i iştirak edirsə, bu, elit ali təhsil, 50 %-i iştirak edirsə, kütləvi ali təhsil, əksəriyyət iştirak edirsə, universal ali təhsil kimi xarakterizə olunur.

Ayrı-ayrı ölkələrin təhsil siyasəti formalaşdırılarkən cəmiyyətin real tələbatı nəzərə alınır, mövcud vəziyyət öyrənilir. Məsələn, Finlandiyada qadınların, qızların ali təhsil almasına xüsusi diqqət yönəldilir, 2025-ci ilə qədər kişilərlə qadınlar arasında (gənc yaş qruplarında) ali təhsil almaqla bağlı mövcud fərqin aradan qaldırılması

nəzərdə tutulur. Belçikada isə əsas diqqət valideynləri ali təhsilli olmayan uşaqlara yönəldilir. 2020-ci ilə qədər belə uşaqların ali təhsilə cəlb edilməsinin 60%-ə çatdırılması nəzərdə tutulur.

Estoniyada yaşlıların yüksək səviyyəli təlim alması üçün ciddi tədbirlər görülür. Bu baxımdan ixtisaslaşma və ixtisasartırma kurslarında bacarıq və vərdişlərin, səriştələrin təkmilləşdirilməsinə xüsusi əhəmiyyət verilir. Belə ki, sahibkarlıq, xarici dil və öyrənmə bacarığının inkişaf problemlərinin tədrisi xüsusi diqqət çəkir. Məhdud əmək qabiliyyətlilərin də ali təhsil almalarına şərait yaradılır. Onlara dövlət təqaüdləri, müavinət və s. verməklə yardımlar göstərilir.

Böyük Britaniyada sosial-iqtisadi statusundan asılı olaraq tələbələrə ödənişsiz yemək almaq imkanları yaradılır. Bu da məhdud əmək qabiliyyətli ailələrdən olanların da ali təhsil almaq maraqlarını artırır.

Finlandiyada olduğu kimi Litvada da ali təhsilin təşkilində gender məsələlərinə xüsusi əhəmiyyət verilir. Burada riyaziyyat və digər dəqiq elmlər sahəsində qadınların xüsusi çəkisi az olduğuna görə dövlət bu qeyri-bərabərliyi aradan qaldırmağa çalışır. İrlandiyada isə ali təhsil proqramları, demək olar ki, təkmildir. Dövlət aztəminatlı ailələrdən olan uşaqların, əlillərin təhsil almalarına, belə tələbələrin ali təhsillərini davam etdirmələrinə maddi kömək göstərir. Son illərdə İrlandiyada məhdud əmək qabiliyyətli (əlilliyi olan) tələbələrin sayı artmışdır.

Təcrübə göstərir ki, müasir dövrdə dövlətlər öz təhsil sistemlərinin, o cümlədən ali təhsilin müvafiq qaydada və müddətdə monitorinqinin aparılmasında maraqlıdırlar. Monitorinqin aparılmasının bir çox yolları, vasitələri vardır. Hər bir ölkədə ali təhsillə bağlı monitorinq aparılarkən tələbələrin sosial-iqtisadi cəhətdən səciyyələndirilməsi (o cümlədən sosial mənşəyinin müəyyənləşdirilməsi), yaşının, cinsinin müəyyən olunması, fiziki cəhətdən məhdudiyyətliliyi (əlilliyi), əmək bazarında statusu (ali təhsil almaqdan öncə və ali təhsil aldığı vaxtda), aldığı ixtisas, dərəcəsi (ali təhsil almamışdan əvvəl), etnik, mədəni (yaxud dil) statusu, miqrant statusu və s. kimi xüsusiyyətlərin öyrənilməsi nəzərdə tutulur.

Digər ölkələrdən fərqli olaraq Böyük Britaniyada ali məktəblərdə tələbələrin mənsub olduqları din, məzhəb haqqında da məlumat toplanır. Tələbələrin hansı millətə mənsub olması faktına da xüsusi diqqət yetirilir.

Müasir dövrdə dünya ölkələrində ali təhsil müəssisələrinə qəbul məsələsi də müzakirə olunan, maraq doğuran məsələlərdəndir. Bəzi qabaqcıl ölkələrdə ali təhsil müəssisələrinə qəbul ümumtəhsil məktəblərində yuxarı siniflərdə buraxılış imtahanlarında qazanılan uğurlara müvafiq olaraq aparılır. Şagirdin topladığı müvafiq bal, aldığı qiymətlər ona ali məktəblərə daxil olmaq imkanı verir. Ali məktəbi və müvafiq ixtisası isə abituriyentin (tələbənin) özü seçir. Digər bir qəbul qaydası da vardır. Belə ki, bəzi ölkələrin ali məktəblərində tələbə seçimini ali təhsil müəssisəsinin özü aparır. Bu zaman ya buraxılış imtahanlarının nəticələri, yaxud da ali məktəbin qəbul imtahanlarının meyarları əsas götürülür. Başqa bir qəbul qaydası isə ondan ibarətdir ki, hər iki yanaşmanın vəhdəti tətbiq olunur. Digər bir qəbul sistemi də mövcuddur ki, bu da qeyd etdiyimiz sistemlərin arasında orta mövqe tutur və xüsusi hazırlıq tələb edən elm sahələri, məsələn, tibb elmini öyrənməklə bağlı ali tibb təhsili almaq istəyənlərə şamil edilir. Bunlar isə başqa sahələrlə müqayisədə çox azlıq təşkil edir.

Təcrübə göstərir ki, yeniyetmə gənclərin ali təhsilə marağının artırılması məsələsi də Avropada ali məktəblərin mühüm problemlərindən biri kimi diqqəti cəlb edir. Hər bir ali məktəb öz gələcək kontin-

gentini formalaşdırmaq üçün ümumtəhsil məktəbləri ilə əlaqələrini genişləndirir. Şagirdlər tez-tez ali məktəblərdə və ya əksinə tələbələr ümumtəhsil məktəblərində tədbirlərə dəvət olunurlar. Bu qarşılıqlı əlaqələr yeniyetmə gənclərdə bu və ya digər ali məktəbdə təhsil almağa maraq, stimul yaradır.

2016/2017-ci tədris ilindən respublikamızda Azərbaycan-Fransız Universitetinin fəaliyyətə başlaması ali təhsilimizin inkişafı və beynəlmiləlləşməsi sahəsində yeni keyfiyyət göstəricisi kimi dəyərləndirilə bilər.

Ali təhsil müəssisələrində ən vacib məsələlərdən biri tələbə şəxsiyyətinin formalaşdırılmasıdır. İxtisas üzrə müvafiq bilik və bacarıqlara, zəruri səriştələrə yiyələnən tələbə nəticə etibarilə özünü yetkin şəxsiyyət kimi dərk etməli, cəmiyyətin fəal üzvü kimi üzərinə düşən məsuliyyət yükünü daşımağa hazır olmalıdır.

Tələbə şəxsiyyəti digər yaş qrupuna aid olan insanlardan özünün spesifik xüsusiyyətləri ilə, o cümlədən dünyanın dərk olunmasında, yeni informasiya texnologiyalarının mənimsənilməsində fəallığı ilə seçilir. Sosial-iqtisadi və mədəni həyatın yeni formalarına uyğunlaşma, yiyələnmə imkanları ilə, eyni zamanda ünsiyyət və davranışda səciyyəvi xüsusiyyətlərlə fərqlənir. Araşdırmalar göstərir ki, tələbə şəxsiyyətinin formalaşdırılması, həqiqətən, mürəkkəb bir prosesdir. Çoxmərhələli olan bu proses müasir elmi-nəzəri və praktik yanaşmalar tələb edir. Bu baxımdan tələbə şəxsiyyətinin formalaşmasında aşağıdakı elmi-nəzəri yanaşmaların nəzərə alınması məqsədəuyğundur:

1) aksioloji yanaşma; 2) sistemli yanaşma; 3) fəaliyyət yanaşması; 4) kulturoloji yanaşma; 5) humanist yanaşma.

Məlumdur ki, aksiologiya həyata, mədəniyyətə aid sosial-estetik dəyərlərin təbiətindən, mahiyyətindən bəhs edir. Bu baxımdan tələbə şəxsiyyətinin formalaşdırılmasında aksioloji yanaşma, ilk növbədə onların dünyagörüşünün, mənəvi keyfiyyətlərinin formalaşdırılmasına təkan verən dəyərlərdən, dəyərli fikir və baxışlardan istinad mənbəyi kimi faydalanmağı nəzərdə tutur. Təcrübə göstərir ki, formalaşma prosesində aşağıdakı aksioloji prinsiplərin rəhbər tutulması vacibdir:

1) insanın ali dəyər olaraq təbiətin bir hissəsi kimi qəbul edilməsi;

2) hər bir şəxsiyyətə, onu fərqləndirən fərqli özünəməxsus keyfiyyətlərinə hörmət;

3) sosial hüquq və azadlıqların qəbul edilməsi;

4) cəmiyyət və təbiətə özünün inkişaf subyekti kimi münasibət;

5) xeyirxahlıq, məhəbbət, yardım, münasibətlərdə səmimilik və s.

Tədqiqatlar göstərir ki, müasir dövrdə təhsilin mahiyyətinə təkcə bilik, bacarıq, vərdişlərin məcmusu, prosesin nəticəsi kimi deyil, həm də dəyər kimi yanaşılır. Yeni təhsilin məzmununu həm də dəyərlər, o cümlədən şəxsiyyətin mənəvi keyfiyyətlərinin formalaşdırılması müəyyən edir.

Elmi araşdırmalar və mövcud təcrübə göstərir ki, dünyagörüşünün formalaşdırılması, ilk növbədə insanın özünün özünə, başqalarına, sosial mühitə, təbiətə olan münasibətləri ilə bilavasitə bağlıdır (6, 7, 8).

Tədris prosesində müəllimin müəyyən dəyərləri hazır şəkildə tələbələrə təqdim etməsi ilə yanaşı, onları birlikdə tapmağa, tələbənin özü tərəfindən həmin dəyərin üzə çıxarılmasına çalışması daha çox vacibdir və mühüm əhəmiyyət kəsb edir.

Qeyd etmək lazımdır ki, təhsilalanların şəxsiyyətinin formalaşdırılmasında sistemli yanaşmanın da mühüm rolu vardır. Xüsusi tədqiqatçılıq mövqeyi olmaqla gerçəkliyin qavranılması yolu olan problemə sistemli yanaşma təhlil olunan obyektə sistem kimi baxılmasına əlverişli imkanlar

yaradır. Sistemli yanaşmanın mühüm tələblərindən biri budur ki, burada tədqiq olunan obyektin daxili və xarici əlaqələrinin çoxtərəfliliyinə xüsusi əhəmiyyət verilir. Ona görə də burada idrak məsələləri ilə bərabər, işin təşkili məsələlərinin də öyrənilməsinə ciddi diqqət yetirilməsi olduqca vacibdir.

Təhsilalanların şəxsiyyətinin formalaşdırılmasına sistemli yanaşma aksioloji əsaslarla da sıx bağlıdır. Ali məktəb təcrübəsindən aydın olur ki, dəyərlər sisteminin tipindən asılı olaraq qeyd etdiyimiz prosesin məzmunu aşağıdakı istiqamətlərdə özünü göstərə bilər:

1) ülvi dəyərlərə (xeyirxahlıq, ölməzlik, xoşbəxtlik, inam, məhəbbət, etibar, sədaqət, diqqətlilik və s.) əsaslanan mənəvi keyfiyyətlər;

2) sosial əhəmiyyətli dəyərlərə (azadlıq, bərabərlik, qardaşlıq, əmək, sülh, yaradıcılıq, humanistlik, demokratiklik, ədalətlilik və s.) əsaslanan mənəvi keyfiyyətlər;

3) antropoloji dəyərlərə (özünüreallaşdırma, muxtariyyət, subyektlik və s.) əsaslanan mənəvi keyfiyyətlər.

Tarixi təcrübə və elmi araşdırmalar sübut edir ki, tələbə şəxsiyyətinin formalaşdırılması və inkişafı tələbənin fəaliyyəti ilə bilavasitə bağlıdır. Bu baxımdan ali məktəblərdə təhsilalanların şəxsiyyətinin formalaşdırılmasında fəaliyyət yanaşması mühüm əhəmiyyət kəsb edir. Məhz fəaliyyət yanaşması şəxsiyyətin öz həyat fəaliyyətini müəyyənləşdirməyə və onu tədricən yeniləşdirməyə, yenidən qurmağa, özünü qiymətləndirməyə imkanlar yaradır. Əslində fəaliyyət üsullarının seçilməsi, onun gedişinə nəzarət və nəticələrinin tətbiqi tələbələrin bu problemə bələdliliyindən xeyli dərəcədə asılıdır. Nəzəri məsələlərin mənimsənilməsi problem baxımından işin təcrübədə əlverişli tətbiq imkanlarını genişləndirir. Ona görə də təhsilalanların təhsil fəaliyyətinin məqsədyönlü təşkili və idarəolunmasında, təhsillə bağlı maraq və meyillərinin, peşə səriştəliliyinin formalaşdırılmasında fəaliyyət yanaşmasının mühüm rol oynadığını qeyd edə bilərik (9, 10,11, 12).

Qeyd etmək lazımdır ki, problemlə bağlı fəaliyyət dedikdə ayrı-ayrılıqda təhsilalanların və ya təhsilverənin fəaliyyətinin deyil, onların qarşıya qoyulmuş məqsədə uyğun birgə fəaliyyətinin nəzərdə tutulması məqsədəuyğun sayılır. Fəaliyyət prosesində hər iki tərəfin qarşılıqlı əməkdaşlığı, müvafiq məqsəd uğrunda birgə çalışmaları, müəyyən problemin həlli üçün səy göstərmələri arzu olunan nəticələrin əldə olunmasına kömək edə bilər.

Şəxsiyyətin formalaşması probleminə kulturoloji yanaşma da mühüm əhəmiyyət kəsb edir. Apardığımız araşdırmalar və təcrübə göstərir ki, pedaqogikada kulturoloji yanaşma bütövlükdə təhsilə mədəniyyət baxımından yanaşılması anlamına gəlir. Yaxud təhsil mühitində həyata keçirilən mədəni proseslər kulturoloji yanaşmanın mahiyyətini ifadə edir. Sosial pedaqogikada geniş mənada kulturoloji yanaşma aşağıdakı komponentləri əhatə edir:

1) azad, müstəqil, özünü dərk edən şəxsiyyət-mütəxəssisin mədəni dəyərləri;

2) müxtəlif həyat şəraitində şəxsiyyətin ümummədəni, sosial-mədəni təhsil və tərbiyə dəyərləri;

3) cəmiyyətdə, sosial mühitdə insanların ünsiyyət, davranış, qarşılıqlı münasibətlər, həmçinin peşə mədəniyyəti dəyərləri;

4) şəxsiyyətin siyasi, hüquqi, iqtisadi, ekoloji, fiziki, mənəvi, psixoloji mədəniyyət dəyərləri;

5) şəxsiyyətin ümumi və peşə mədəniyyətinin formalaşdırılması dəyərləri, bu məqsədlə sosial mühitdə müxtəlif institutların fəaliyyəti.

Təhsildə kulturoloji yanaşma təhsil prosesində ümummədəni, xüsusi və psixolo-

ji-pedaqoji məsələlərin vahid kontekstdə birləşdirilməsi üçün imkanlar yaradır. Burada "təhsilli insandan mədəni insana" prinsipinin əsas götürülməsi problemin mahiyyətinə konkret aydınlıq gətirir. Tədris prosesində fənlərin və tərbiyə işinin məzmunu həmin prinsipə əsaslanaraq, şəxsiyyətin bütöv mədəniyyətinin formalaşdırılmasına istiqamətləndirilir.

Kulturoloji yanaşmanın təhsilin bütün pillə və səviyyələrində nəzərə alınması nəticə etibarilə keyfiyyətə təsir göstərir. Belə ki, kulturoloji yanaşmaya görə təhsilin təşkili sadəcə olaraq ayrı-ayrı tədbirlərin cəmi deyil, müəllimin və tələbələrin həyat fəaliyyətinin bütöv sistemidir. Tədris prosesində belə bir yanaşmanın nəzərə alınması təhsilin dünyəvi, milli mədəniyyət kontekstində həyata keçirilməsi, tələbənin fərdiliyinin, özünəməxsusluğunun, onun inkişaf xüsusiyyətlərinin dəstəkləməsi, müəllimlərin pedaqoji mədəniyyətinin yüksəldilməsi üçün geniş imkanlar açır.

Digər bir elmi-nəzəri yanaşma humanist yanaşmadır. Qeyd etməliyik ki, humanizm insanı şəxsiyyət kimi dəyərləndirən dünyagörüşü sistemidir. Azadlıq, xoşbəxtlik, inkişaf bütün qabiliyyətlərdən istifadə hüququ və digər bir sıra mühüm keyfiyyətlər məhz bu sistemdə əhatə olunur. Tədqiqatlar və təcrübə göstərir ki, hər bir sistemin özü də müəyyən prinsiplərə əsaslanır. Bu baxımdan bərabərlik, ədalətlilik, cəmiyyətdə arzu olunan münasibət normalarını əks etdirən insanilik, bəşərilik bir sistemin prinsipləri kimi mühüm əhəmiyyət kəsb edir. Sosial hadisə və proseslərin qiymətləndirilməsi kriteriyalarının insan amilinə xidmət etməsi bu prinsiplərin tələblərindən irəli gəlir. Bu baxımdan təhsil prosesində humanist yanaşma təhsilalanların azad, sərbəst inkişafına, özünüdərkinə, şəxsiyyət kimi formalaşmasına geniş imkanlar yaradır.

Qeyd olunan məsələlərin nəzərə alınması ali təhsilin inkişafına, təhsilalanların səriştəli kadr, şəxsiyyət kimi formalaşmasına ciddi təsir göstərir.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat


1. Abbasov A. Pedaqogika. Bakı: Mütərcim, 2015.
2. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı, 1999.
3. "Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası". (Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 25 iyun 2007-ci il qərarı), // Azərbaycan müəllimi, iyun 2007-ci il.; http://edu.gov.az /upload/file/fasilesiz-pedaqoji-tehsil konsepsiyasi.pdf
4. Azərbaycan Respublikası Prezidenti Cənab İlham Əliyevin 22 may 2009-cu il tarixli Sərəncamı ilə təsdiq olunmuş "2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı". Bakı, 2009, http://edu.gov.az/az/page/83
5. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası (Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli nömrəli Sərəncamı ilə təsdiq edilmişdir). http://www.president.az/articles/9779
6. Azərbaycan Respublikasının Milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı. http://www.president.az/articles/21993
7. Cabbarov M. Təhsildə yeni keyfiyyət mərhələsi başlayır. // Azərbaycan məktəbi, 2016, №5.

8. Cəbrayılov İ. Müasir təhsil: axtarışlar və perspektivlər. Bakı: Mütərcim, 2013.
9. Əliyev H. Təhsil millətin gələcəyidir. Bakı: Təhsil, 2002.
10. Həsənov A., Ağayev Ə.. Pedaqogika. Bakı, 2007.
11. Kərimov Y. Pedaqoji tədqiqat metodları. Bakı: Azərnəşr, 2009.
12. Qəşəmoğlu Ə. Sosioloji araşdırma aparanlara kömək: Metodik vəsait. Bakı: Tərəqqi və Demokratiya Fondu, 2001.
13. 2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı.. http://edu.gov.az/az /page/83; http://xaricdetehsil.edu.gov.az/c-dphaqqinda/universitetler/
14.Mehrabov A., Abbasov A., Mahmudov M. Təhsilin modernləşdirilməsinin aktual problemləri. Bakı: Mütərcim, 2013.
15. Müasir təhsilin nəzəri və praktik problemləri (nəşrə haz.İ.H.Cəbrayılov) Bakı: ARTPİ-nin TTM-nin nəşri, 2016.
16. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununun tətbiq edilməsi barədə Azərbaycan Respublikası Prezidentinin Fərmanı. Bakı şəhəri, 5 sentyabr 2009-cu il.
17. Təhsilin modernləşdirilməsinin elmi-nəzəri problemləri. (Nəşrə haz. İ.H.Cəbrayılov ). Bakı: Mütərcim, 2015.
18. Valehov C. Milli təhsil müasir transformasiyalar prosesində (sosial-fəlsəfi təhlil). Bakı: Təhsil, 2015.
19. Paşayev Ə., Rüstəmov F. Pedaqogikanın metodologiyası və elmi tədqiqat metodları // Elmi tədqiqatlar, 2002, № 1.
20. Кудрявцева Е., Салимова Д., Шершун С. Билингвалъное образование в Азербайджане как путъ к формированию «человека мира». “Azərbaycanda təhsil siyasətinin prioritetləri: müasir yanaşmalar” mövzusunda beynəlxalq elmi konfransın materialları. Naxçıvan şəhəri, 25 noyabr 2016-cı il. Bakı: ARTPİ-nin Təhsil Texnologiyalar Mərkəzinin nəşriyyatı, 2016.

**И.Джабраилов**

**Некоторые проблемы современного высшего образования и формирование личности студента**

**Резюме**

В статье были даны примеры международного опыта связанные с организацией и развитием высшего образования, а также были исследованны важные проблемы в формировании личности студента. Здесь указана научно-теоретическая, практическая важность современных подходов в формировании личности, основывается и учитывается их важность в процессе обучения. Исследование показывает что, для формирование конкурентоспобной личности применение современных подходов имеет важное значение.

**I.Jabrayilov**

**Some problems dealing with the formation of modern education and student personality**

**Summary**

In the article some samples dealing with the organization and development of higher education used in different parts of the world are given, at the same time the important problems of formation of student personality are investigated. The scientific - theoretical and practical importance of modern approaches in the formation of personality are shown, and their necessity in the process of teaching are substantiated. The investigation shows that the application of modern approaches plays an important role in the formation of competitive personality.

# КОМПЕТЕНТНОСТНЫЙ ПОДХОД В ОБУЧЕНИИ ПРЕДМЕТНЫМ ДИСЦИПЛИНАМ БУДУЩИХ СПЕЦИАЛИСТОВ

**Рева Татьяна Дмитриевна,**
***кандидат химических наук, доцент***
***г. Киев***

Обоснована актуальность реализации компетентностного подхода в обучении предметным дисциплинам будущих специалистов. Определены основные направления внедрения компетентностного подхода в профессиональной подготовке студентов в образовательной практике высших медицинских учебных заведений Украины. Представлена структура профессиональной компетентности будущего специалиста, которая формируется в процессе изучения химических дисциплин в высшем фармацевтическом образовании Украины. Дана характеристика функционального спектра компетентностного подхода в обучении химическим дисциплинам будущих специалистов отрасли здравоохранения Украины.

***Açar sözlər:*** *ali formativlik təhsili, səriştəli yanaşma, kimya fənninin tədrisi, səriştəli ixtisas, professional səriştəli mütəxəssislər.*

***Ключевые слова:*** *высшее фармацевтическое образование, компетентностный подход, обучение химическим дисциплинам, профессиональная компетентность специалиста фармацевтического сектора отрасли здравоохранения.*

***Key words:*** *higher pharmaceutical education; competency-based approach; teaching of Chemistry-related disciplines; professional competence of the professional in the Pharmaceutical Sector of Healthcare system.*

Актуальные проблемы высшего образования Украины определяют необходимость в осуществлении инновационных научных исследований теоретического и прикладного характера, в частности в профессиональной подготовке будущих специалистов. Это продиктовано требованиями общества и государства, научных работников и рядовых граждан к подготовке конкурентоспособных, мобильных, компетентных специалистов. Так, в одном из направлений реализации актуальных задач отрасли названо реформирование системы научного обеспечения и образования, адекватной потребностям отрасли и современному состоянию реформирования общества.

Анализ материалов VIII Национального съезда фармацевтов Украины (13-16 сентября 2016 года, г. Харьков, Украина), дал возможность определить современные вызовы, требующие адекватного ответа со стороны образовательных учреждений, научных работников, органов здравоохранения. Одним из таких вызовов является объединение усилий ученых, практиков, фармацевтических объединений в содействии процессу

реализации компетентностного подхода в высшем фармацевтическом образовании (ВФО) Украины. С позиций европейского измерения, ВФО Украины представляет собой институцию, на которую возложена ответственность за подготовку высококвалифицированных кадров в отрасли здравоохранения населения, и, в то же время, образовательную структуру, которая обеспечивает социализацию и профессионализацию будущих специалистов, формирование у них профессиональных компетентностей.

Образовательный процесс по изучению химии будущими специалистами Украины призван обеспечивать качество подготовки высококвалифицированных и компетентных кадров. Для решения такой задачи важно осуществлять совершенствование содержания образования, внедрять новые технологии и формы химического образования, быть сориентированным на европейские образовательные стандарты ВФО Украины. Учитывая это, в условиях модернизации ВФО в Украине актуальной является реализация компетентностного подхода в обучении химическим дисциплинам будущих специалистов по фармации с тем, чтобы сформировать у них еще на этапе вузовской подготовки актуальный набор знаний, умений и навыков, необходимых для качественного выполнения профессиональной деятельности.

Анализ исследований и публикаций показывает что Весомый вклад в разработку научных принципов компетентностного подхода принадлежит Н. Бибик, О. Овчарук, О. Савченко и другим ученым. Теоретически и практически значимыми для нашего исследования являются научно-методические работы украинских ученых по химии: О. Цуркан, И. Ниженковская, О. Глушаченко, И. Ниженковская, О. Вельчинская, М. Кучер, Б. Зименковский, В. Музыченко, И. Ниженковская, Г. Сырова  и др. Автором этой статьи обоснованы теоретические концепты компетентностного подхода в ВФО, изучен вопрос развития компетентностно ориентированного образования в изучении химии будущими фармацевтами в Украине.

Что касается цель и задание исследования невзирая на результативность осуществленных авторских исследований, научных разработок ученых Украины, некоторые теоретические и прикладные аспекты реализации компетентностного подхода в обучении химическим дисциплинам будущих специалистов-фармацевтов отрасли здравоохранения Украины требуют дальнейшего изучения и осмысления с позиций актуальных запросов государства, общества и граждан к системе здравоохранения страны. Это и определяет цель этого исследования, в достижении которой важно, по нашему мнению, решить такие задания:

1. Выделить основные направления реализации компетентностного подхода в профессиональной подготовке студентов специальности в образовательной практике высших медицинских учебных заведений (ВМ(Ф)УЗ) Украины.
2. Определить структуру профессиональной компетентности будущего специалиста, которая формируется в процессе изучения химических дисциплин в ВФО Украины.
3. Дать характеристику функционального спектра компетентностного подхода

в обучении химическим дисциплинам будущих Украины.

Следует отмечать что исходным моментом исследования является определение структуры базового понятия – «компетентность», а также авторской позиции относительно толкования понятия «компетентность специалиста фармацевтического сектора отрасли здравоохранения». Сравнительный анализ информационных источников позволил определить основные подходы к пониманию сущностных характеристик понятия «компетентность». Так, в Законе Украины «О высшем образовании» представлено такое определение исследуемого феномена: «Компетентность – динамическая комбинация знаний, умений и практических навыков, способов мышления, профессиональных, мировоззренческих и гражданских качеств, морально-этических ценностей, которая определяет способность личности успешно осуществлять профессиональную и дальнейшую учебную деятельность и является результатом обучения на определенном уровне высшего образования».

Дальнейший исследовательский шаг в обобщении позиций ученых относительно толкований содержания понятия «компетентность» дал возможность выявить, что они отображают лишь отдельные концептуальные его характеристики. Так, в трактовке сущности понятия «компетентность» Н. Бибик считает принципиальной идею переориентации «из процесса в результат». Ученая рассматривает этот результат с точки зрения запроса в обществе, обеспечения возможности выпускника отвечать новым требованиям рынка труда, иметь соответствующий потенциал для практического решения жизненных проблем, поиска своего «Я» в профессии и социальной структуре. По мнению О. Савченко, с позиций компетентностного подхода уровень образования определяется способностью специалиста решать проблемы разной сложности на основе имеющихся знаний и опыта. Для В. Бобрицкой понятие «компетентность» является ключевым, центральным понятием компетентностного подхода, поскольку сочетает в себе такие составляющие части профессионального образования как знания и навыки. Логика позиции ученой базируется на том, что в понятии «компетентность» отображено ядро содержания образования, сформированного «от результата» («стандарт на выходе»). В. Бобрицкая утверждает, что понятие «компетентность» является интегративным по своей природе, поскольку содержит ряд однородных или близких умений и знаний, которые принадлежат к широким сферам культуры и деятельности, в частности профессиональной. По мнению О. Овчарука, «компетентность» – это возможность квалифицированно осуществлять свою деятельность. При этом компетентность, по его мнению, содержит набор компетенций в форме знаний, умений и установок, которые дают возможность личности осуществлять действия или выполнять определенные функции, направленные на достижение стандартов в профессиональной отрасли или деятельности.

Обобщение изложенного создает предпосылку для умозаключения: компетентностно ориентированное образование является чрезвычайно востребованным в подготовке будущего специалиста отрасли здравоохранения Украины.

Исходя из того, что компетентностный подход определен одним из актуальных в стратегии развития ВФО

Украины, обозначим основные его положения: 1) компетентность является ключевым понятием в оценивании образовательных результатов, поскольку сочетает в себе интеллектуальную и прикладную составляющие части в ВФО; 2) в понятии «компетентность» заложена интерпретация содержания образования, в частности химического, сформированного «от результата»; 3) компетентность является феноменом, в основе которого – динамическая комбинация знаний, умений, навыков, ценностей, умений, других способностей будущего специалиста-фармацевта Украины.

Анализируя информационные источники по проблеме и собственный опыт преподавания в ВМ(Ф)УЗ) Украины, мы пришли к выводу о том, что компетентность специалиста-фармацевта проявляется в конкретной ситуации профессиональной деятельности. Компетентность не может быть вне условий ее реализации и деятельности. Такое понимание сущности компетенции специалиста по фармации делает возможным определение структуры профессиональной компетентности будущего фармацевта, которая формируется в процессе изучения химических дисциплин в ВФО Украины. Представим обоснование своей позиции.

Положительный опыт реализации компетентностного подхода есть в работе кафедры медицинской и общей химии и кафедры фармацевтической, биологической и токсикологической химии фармацевтического факультета Национального медицинского университета имени А.А. Богомольца, Украина, г. Киев (в дальнейшем – НМУ имени А.А. Богомольца).

Опыт обучения химии будущих специалистов по фармации в НМУ имени А.А. Богомольца свидетельствует о том, что химические дисциплины (неорганическая химия, органическая химия, аналитическая химия, физическая и коллоидная химия) принадлежат к группе учебных дисциплин, которые обеспечивают уровень фундаментальной подготовки специалистов фармацевтической отрасли, являются ключевыми в формировании у них профессиональной компетентности. Преподавателей факультета объединяет общее понимание того, что на нынешнем этапе развития ВФО в Украине образовательный процесс по изучению химии должен сопровождаться не только предоставлением академических знаний студентам. Важно формировать умения и навыки практической деятельности, создавать образовательную среду для интеграции способов деятельности с тем, чтобы будущие фармацевты смогли применять «триаду» (знания-умения-навыки) не в четко ограниченном кругу «типичных» учебных заданий, а в широком арсенале «жизненных ситуаций», которые могут возникнуть в процессе работы с населением. Преподаватели считают, что профессиональная компетентность современного фармацевта должна включать такие способности личности как:

1) готовность работать с населением, коллегами, гражданскими институциями на основе ценностной платформы, иметь потребность и мотивацию в реализации этических норм профессиональной деятельности фармацевта;

2) знание естественных наук, в частности химии (разные вариации условной формулы «валентность – пропорции – грамм» и т.п. постоянно будут сопровождать профессиональную деятельность специалиста по фармации);

3) лидерские качества, навыки менеджмента и маркетинга (особенности работы фармацевта связаны с продвиже-

нием лечебных средств (ЛС) на рынке услуг, их закупкой и логистикой); применять и определять способы действий в сфере управления и логистики с учетом новейших технических, информационно-коммуникационных ресурсов;

4) коммуникативные навыки и сочувствие к людям (выслушать посетителя, неформально вникнуть в его проблему, чтобы предоставить действенную консультацию, посоветовать нужные потребителю ЛС);

По нашему убеждению, реализация компетентностного подхода в обучении химическим дисциплинам будущих специалистов по фармации Украины даст возможность сформировать у них такие компоненты профессиональной компетентности как:

1) мотивационно-ценностный (отображает систему ценностей, потребностей и мотивов профессиональной деятельности специалиста);

2) когнитивный (предусматривает уровень сформированных методологических, теоретических и прикладных знаний специалиста);

3) процессуальный, деятельностный (отображает комплекс умений в выборе адекватных целей и заданий профессиональной деятельности, способов действий в предоставлении фармацевтических услуг населению);

4) информационно-коммуникационный (предусматривает наличие сформированных навыков в применении унифицированных информационно-коммуникационных технологий, умений интегрировать телекоммуникации – телефонные линии, персональный компьютер, программное обеспечение, накопительные и аудиовизуальные системы, которые дают возможность создавать, получать доступ, хранить, передавать и изменять профессионально значимую информацию);

5) коммуникативный (включает умение и навыки оказывать консультационную помощь населению, сработать с коллегами, гражданскими институциями с соблюдением этики общения специалиста-фармацевта);

6) профессионально-рефлексивный (предусматривает сформированные умения осознавать и оценивать последствия своих действий по предоставлению фармацевтических услуг населению).

В решении заданий исследования важно определиться относительно функционального спектра компетентностного подхода в обучении химическим дисциплинам будущих специалистов фармацевтического сектора Украины. Так, в процессе преподавания химических дисциплин преподаватели фармацевтического факультета НМУ имени А.А. Богомольца формируют у студентов, во-первых, понятие о химии, как о неотъемлемой составляющей естественнонаучной картины мира; во-вторых, представление о единстве и взаимосвязи неорганического и органического мира; в-третьих, умение анализировать явления окружающего мира и причины их возникновения; в-четвертых, навыки профессиональной коммуникации (говорить и думать «химическим языком», критически осмысливать информацию химического содержания); в-пятых, понимание роли химии в повседневной жизни людей и решении проблем профилактики, лечении заболеваний. В этом контексте находит проявление концептуально-теоретическая, проектно-технологическая, практически ориентированная, интеграционная функции компетентностного подхода в образовательном процессе по обучению химии будущих фармацевтов. В результате студенты приобретают химические знания, необходимы им для овладения профессионально значимыми умениями и навыками.

Важным фактором в определении

результативности теоретических и практических новаций профессорско-преподавательского коллектива фармацевтического факультета НМУ имени А.А. Богомольца является участие преподавателей в разработке стандартов высшего образования по специальности в области знаний «Здравоохранение. Фармация». При этом обобщенным объектом профессиональной деятельности было определено достижение высокого уровня здравоохранения населения, в частности поддержание здоровья; профилактика, диагностика и лечение заболеваний человека, а также влияние проблем со здоровьем на пациентов, их семьи и популяцию. По этическим соображениям предоставим информацию о результатах работы проектной группы после официальной публикации текста Образовательно-профессиональной программы, разработанной проектной группой ученых НМУ имени А.А. Богомольца.

Отмечаем что проведенное исследование выше дает возможность сформулировать ряд теоретических обобщений.

1. Компетентностный подход в ВФО Украины является востребованными потребителями фармацевтических услуг, государством, обществом, поскольку он сориентированный не только на усвоение знаний, умений, способов практической деятельности специалистов-фармацевтов, но отражается на качестве предоставления помощи населению по вопросам профилактики заболеваний и лечения болезней, а значит – на сохранении здоровья нации.

2. Основными направлениями реализации компетентностного подхода в профессиональной подготовке студентов специальности «Фармация» отрасли здравоохранения в образовательной практике ВМ(Ф) УЗ Украины являются такие: 1) создание инновационной образовательной среды в ВМ(Ф)УЗ; 2) признание того, что центральное место в организации образовательного процесса у ВФО занимает студент; 3) персонификация траектории становления и развития компонентной структуры профессиональной компетентности будущего специалиста фармацевтической сектора отрасли здравоохранения.

3. В структуре профессиональной компетентности будущих специалистов фармацевтического сектора выделены такие компоненты: 1) мотивационно-ценностный; 2) когнитивный; 3) процессуальный; 4) информационно-коммуникационный; 5) коммуникативный; 6) профессионально-рефлексивный.

4. Функциональный спектр компетентностного подхода в обучении химическим дисциплинам (неорганическая химия, органическая химия, аналитическая химия, физическая и коллоидная химия) будущих специалистов фармацевтического сектора отрасли здравоохранения Украины представлено концептуально-теоретической, проектно-технологической, практико-ориентированной, интеграционной функцией.

Перспективными научными разработками автора определено исследование компетентностного подхода в проектировании образовательного процесса по изучению дисциплин химического цикла будущими провизорами в системе ВФО Украины.

***Рецензент: проф. Э. Гулиев***

